**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**Sentyabr-Oktyabr**
**№ 5 (657)**
**2013**

**Elmi-nəzəri, pedaqoji jurnal**

---

## BU NÖMRƏDƏ

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 16

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**

# "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikasında səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələrinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan, iqtisadi cəhətdən dayanıqlı təhsil sistemini yaratmaq məqsədi ilə, Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

**1.** "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" təsdiq edilsin (əlavə olunur).

**2.** Azərbaycan Respublikasının Nazirlər Kabineti:

2.1. bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilən Dövlət Strategiyasının həyata keçirilməsi üzrə fəaliyyət planının layihəsini beş ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

2.2. bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilən Dövlət Strategiyasının icrasının gedişi barədə hər il üzrə hesabatı növbəti ilin 1 mart tarixinədək Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

2.3. bu Sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**

**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 24 oktyabr 2013-cü il*

**Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmişdir**

## AZƏRBAYCAN RESPUBLİKASINDA TƏHSİLİN İNKİŞAFI ÜZRƏ DÖVLƏT STRATEGİYASI

### 1. Məzmun

Son illər aparılan sosial-iqtisadi siyasət nəticəsində ölkədə yüksək inkişafa nail olunmuş, əhalinin maddi rifahı xeyli yaxşılaşmış, yoxsulluğun səviyyəsi minimuma enmiş və Azərbaycan Respublikası orta gəlirli ölkələr sırasında yer tutmuşdur. Gerçəkləşdirilən islahatlar və genişmiqyaslı infrastruktur layihələri sosial-iqtisadi həyatın yenidən qurulması və davamlı inkişafı üçün şərait yaratmışdır.

Ölkə qarşısında duran növbəti strateji vəzifə sosial-iqtisadi həyatın daha da modernləşdirilməsi və qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılması yolu ilə davamlı iqtisadi inkişafın təmin edilməsi və əhalinin həyat səviyyəsinin yüksəldilməsindən ibarətdir. Müasirləşdirmə, ilk növbədə, qabaqcıl texnologiyaların və idarəetmə üsullarının, elmi nailiyyətlər əsasında yaradılan innovasiyaların ölkənin sosial-iqtisadi həyatına uğurlu tətbiqi ilə bağlıdır. Bunun üçün prioritet istiqamət ölkə iqtisadiyyatının dünya iqtisadiyyatına inteqrasiyasının sürətləndirilməsi ilə yanaşı, ölkədə insan kapitalının inkişafı, şəxsin müasir bilik və bacarıqlara yiyələnməsinin təmin edilməsidir. İnsan kapitalının inkişafı iqtisadiyyatın qlobal sistemə uğurlu inteqrasiyası və ölkənin beynəlxalq rəqabətdən daha effektli faydalanması prosesində ən mühüm şərtlərdən olub, ölkənin təhsil sisteminin başlıca vəzifəsini təşkil edir.

Azərbaycan Respublikasının inkişaf konsepsiyasına uyğun olaraq şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir. Təhsilin inkişafı ölkədə əhalinin rifahının yaxşılaşması, həmçinin fərdin həyatının daha yüksək səviyyədə qurulması üçün zəmin yaradır. Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir.

Sosial-iqtisadi həyatın müasirləşdirilməsində təhsilin rolu təkcə təhsilalanın qazandığı bilik və bacarıqların iqtisadi amilə çevrilməsi ilə məhdudlaşmır. Təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər hər bir təhsilalanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır, onu biliyi və etik davranışı sayəsində örnək ola biləcək həmkara, nümunəvi ailə üzvünə və vətəndaşa çevirir.

Son illərdə ölkədə təhsilin inkişafı istiqamətində mühüm addımlar atılmışdır. Təhsilin normativ hüquqi bazası təkmilləşdirilmiş, maddi-texniki təminatı istiqamətində Azərbaycan Respublikası Prezidentinin sərəncamları əsasında geniş tədbirlər həyata keçirilmişdir. Həmin məqsədlə müxtəlif şəhər və rayonlarda 2500-ə yaxın məktəb binası tikilmiş və mövcud təhsil obyektlərində əsaslı təmir-bərpa işləri uğurla aparılmışdır. Təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyalarının tətbiqi əhəmiyyətli dərəcədə genişlənmişdir.

Qeyd olunanlarla yanaşı, sürətlə modernləşən Azərbaycan Respublikasında təhsil sisteminin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi istiqamətində yeni addımların atılmasına və ümumi təhsilin keyfiyyət göstəricilərinin Avropa standartlarına uyğunlaşdırılmasına ehtiyac vardır. Təhsilin keyfiyyətinin yaxşılaşdırılması üçün təhsili idarəetmə sisteminin yenidən

qurulması, bu sahədə insan resurslarının inkişaf etdirilməsi və müəllim peşəsinin nüfuzunun artırılması zəruridir.

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” (bundan sonra - Strategiya) Azərbaycan Respublikasında, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə genişmiqyaslı tədbirləri nəzərdə tutur.

Birinci strateji istiqamət səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılmasına yönəlmişdir və təhsilin məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali olmaqla, bütün pillələri üzrə kurikulumların inkişafı kimi vacib hədəfi əhatə edir.

İkinci strateji istiqamət təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir və özündə təhsilverənlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulmasını, təhsilalanların istedadının aşkar olunması və inkişafı ilə bağlı, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılmasını ehtiva edir.

Üçüncü strateji istiqamət təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılmasını nəzərdə tutur. Bu istiqamət təhsil sistemində tənzimləmə və idarəetmənin qabaqcıl beynəlxalq təcrübə əsasında müasirləşdirilməsi, təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin, təhsilin keyfiyyətinin təminatı və idarə olunması üzrə yeni məlumat və hesabat sistemlərinin yaradılması kimi hədəfləri əhatə edir.

Dördüncü strateji istiqamət müasir tələblərə uyğun və ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasını nəzərdə tutur. Bu istiqamət təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyaları əsaslı təlim metodologiyasına uyğun infrastrukturun yaradılması, təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması, distant təhsil, istedadlı və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün təhsil və inkişaf, yaşlıların təhsili, peşə-ixtisas və təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən regional universal mərkəzlərin, müasir təminatlı peşə-tədris mərkəzlərinin və komplekslərinin qurulması, kampusların yaradılması kimi tədbirləri ehtiva edir.

Beşinci strateji istiqamət Azərbaycan Respublikasında iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə eyni səviyyəyə uyğun təhsil sisteminin maliyyələşdirilməsi modelinin qurulmasıdır. Bu istiqamət, o cümlədən müxtəlif mənbələrdən istifadə olunmaqla təhsili maliyyələşdirmə mexanizminin təkmilləşdirilməsini, təhsil müəssisələrinin adambaşına maliyyələşdirilməsinə keçidi, ödənişli təhsil xidmətlərinin göstərilməsinin dəstəklənməsini, Təhsilin İnkişafı Fondunun yaradılmasını nəzərdə tutur.

## 2. Təhsil sahəsində beynəlxalq təcrübə və meyillər

**Təhsilin sosial-iqtisadi rolu.** Yüksək təhsil səviyyəsinə malik peşəkar kadrlar ölkənin intellektual potensialının əsasıdır. Müasir dövrdə ölkələrin uğurlu və davamlı iqtisadi yüksəlişi insan kapitalının məqsədyönlü inkişafı hesabına əldə edilmişdir. Bütün bunlar təhsilin dövlət xərclərində prioritetliyini getdikcə artırmaqdadır. Dövlətin təhsil xərcləri cəmiyyət üçün yüksək iqtisadi gəlirliyə malikdir.

Müasir dövrdə təhsilin iqtisadi həyatda rolu əhəmiyyətli dərəcədə artmışdır. Ha-

zırda təhsil iqtisadiyyatda tələb olunan bilik və bacarıqların aşılanması ilə bərabər, vətəndaşın gələcək həyata və cəmiyyətə inteqrasiyasına hərtərəfli hazırlığı kimi vəzifələri yerinə yetirməlidir. İnsanın ömür boyu təhsil almaq tələbatının ödənilməsi isə təhsilin iqtisadi həyatda rolunu yüksəldən amillərdən ən mühümüdür.

Eyni zamanda, sürətli texnoloji tərəqqi bilik və bacarıqların müntəzəm yenilənməsini tələb edir. Bu isə yeni və daha münasib ixtisasa yiyələnməyə və səriştənin inkişafına tələbatı artırır.

**Təhsilin keyfiyyəti və əhatəliliyi.** Orta gəlirli ölkələr arasında rəqabətin güclənməsi, sürətli texnoloji irəliləyiş nəticəsində ixtisas profillərinin tez-tez dəyişməsi təhsilin keyfiyyətinə tələbi daha da artırmışdır. Digər tərəfdən, yalnız təhsilə cəlb etmə səviyyəsinin artırılması və təhsil infrastrukturunun genişləndirilməsi insanların bilik və bacarıqlarının yüksəlməsinə tam təminat vermir. Təhsil infrastrukturu zəruri amil olsa da, bilik və bacarıqlar təhsil müəssisələrinin sayı və təhsilin müddəti ilə deyil, öyrənmə prosesinin keyfiyyəti ilə əldə olunur. Son dövrlərdə bir sıra ölkələr tərəfindən təhsilin inkişafı məqsədi ilə təhsil infrastrukturuna, həmin infrastrukturun yeni avadanlıqlarla təchizatına xeyli vəsait xərclənsə də, həmin ölkələrdə təhsilin nəticələrində müsbət irəliləyiş əldə edilməmişdir. Ümumi təhsil pilləsini bitirməsinə baxmayaraq, hesab, oxu və yazı vərdişlərinə malik olmayan çoxlu sayda insanlar vardır. Həmin səbəblərdən təhsilin keyfiyyətinin təminatı başlıca strateji prioritetə çevrilməlidir.

Təhsilin keyfiyyətinə və əhatəliliyinə qoyulan yeni tələblər təhsil sistemi anlayışına baxışı da yeniləmişdir. Müasir təhsil sistemi formal (dövlət təhsil sənədinin verilməsi ilə başa çatan) təhsil forması ilə yanaşı informal (özünütəhsil yolu ilə biliklərə yiyələnmə) və qeyri-formal (müxtəlif kurslarda, dərnəklərdə və fərdi məşğələlərdə əldə edilən və dövlət təhsil sənədinin verilməsi ilə müşayiət olunmayan) təhsil formalarını da nəzərdə tutmuşdur.

Təməl bacarıqlar uşaqlıq dövrünün ilk illərindən əldə edildiyinə görə uşaqların zehninin erkən yaş dövründən inkişaf etdirilməsi vacibdir. Bu səbəbdən məktəbəqədər təhsilin inkişafı dövlət siyasətində əhəmiyyətli yer tutur.

Bir çox qabaqcıl ölkələrdə təhsil müddətinin tədricən artırılması istiqamətində addımlar atılır. Kanada, Fransa, Hollandiya və Çexiyada ümumi təhsilin müddəti 14 il, Almaniya, Böyük Britaniya, İsveç, Avstraliya və Yeni Zelandiyada 13 il, ABŞ, Finlandiya, Cənubi Koreya, Polşa və bir sıra digər ölkələrdə isə 12 il təşkil edir. Ümumi təhsil müddəti az sayda ölkədə on bir il təşkil edir. İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının məlumatına görə, hər hansı ölkədə istənilən təhsil pilləsi üzrə təhsil müddətinin bir il artırılması ölkədə Ümumi Daxili Məhsulun 3-6 faiz artımına gətirib çıxarır.

**Təhsilin məzmunu.** Beynəlxalq təcrübədə təhsilin məzmunu ilə bağlı başlıca meyillərdən biri təhsil kurikulumlarının ölkənin sosial-iqtisadi inkişaf tələbləri və prioritetləri ilə sıx əlaqələndirilməsindən ibarətdir. Kurikulumlar iqtisadi inkişaf məqsədlərinə xidmət edən bilik və bacarıqları, səriştəni aşılayan məzmuna malik olmalıdır. İqtisadi uğurlar əldə etmiş ölkələrdə biliklərə əsaslanan iqtisadiyyatın yaradılması sosial-iqtisadi siyasətin prioriteti olduğundan, kurikulumlarda innovasiyaların əhəmiyyəti, təhsilalanların müxtəlif sosial fəaliyyətə təşviq olunması və onların tədris bacarıqlarının inkişafı xüsusi vurğulanır.

Son 30-40 il ərzindəki elmi-texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktiki bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirmək-

dədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha effektli xidmət göstərir.

Kurikulumların məzmunu texnoloji irəliləyişin gətirdiyi yenilikləri nəzərə almaqla daim inkişaf etdirilir ki, bu da müxtəlif təhsil pillələrində spesifik yanaşma tələb edir. Burada ümumi təhsil pilləsində şəxsiyyətin hərtərəfli formalaşdırılması prioritet olduğu halda, ali təhsildə əmək bazarının cari və gələcək tələbləri əsas götürülür. Ali təhsil kurikulumunun daimi inkişafı əmək bazarı subyektlərinin tələblərinin sistematik öyrənilməsini vacib edir. Bu proses əmək bazarında iş təklif edən, istər dövlət, istərsə də qeyri-dövlət sektorunda fəaliyyət göstərən bütün subyektləri ali təhsil prosesində başlıca maraqlı tərəfə çevirmişdir.

**Müəllim və tədris metodikaları.** Müəllim amili təhsilalanın öyrənməsi və inkişafı, nailiyyətlərinin monitorinqi prosesində həlledici rol oynayır. Təhsilalanın savadlı və səriştəli şəxs kimi formalaşmasına müəllimin təsiri müəllimin akademik bacarıqlarından, tədris təcrübəsindən və peşəkarlıq səviyyəsindən xeyli asılıdır. Müəllimin bu keyfiyyətləri ilə təhsilalanların nailiyyətləri arasında sıx korrelyasiya mövcuddur.

Bilik və bacarıqlarını davamlı artıran müəllimlər təhsilalanların nailiyyətlərinə əlavə töhfə verirlər. Peşəkarlığa əsaslanan stimullaşdırıcı əmək haqqı sisteminin olmaması, təhsil müəssisəsi səviyyəsində idarəetmənin qeyri-effektivliyi, müəllim hazırlığı üzrə infrastrukturun zəif olması müəllim amilinə təsir edən amillər sırasındadır. Bu baxımdan təhsil islahatı uğurla aparılan ölkələrdə müəllim peşəkarlığının inkişafı üçün stimulların yaradılmasına və müəllim hazırlığının təkmilləşdirilməsinə xüsusi diqqət yetirilir.

Təhsilin inkişafında mühüm irəliləyişlərə nail olmuş ölkələrin təcrübəsi göstərir ki, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan, yaradıcı düşüncəni inkişaf etdirən və təhsilalanın fərdi xüsusiyyətlərini nəzərə alan müasir, fəal-interaktiv təlim metodları daha yüksək nəticələr verir. Həmin məqsədlə, davamlı olaraq mütərəqqi tədris metodlarının yaradılması və müəllimlərin səriştəsinin artırılması təhsil siyasətində mühüm yer tutur.

**İdarəetmə.** Təhsil sahəsində idarəetmə islahatlarının başlıca istiqamətlərini təhsil prosesinin iştirakçıları arasında münasibətlər sisteminin, eləcə də tənzimləmə orqanlarının funksiyaları, səlahiyyətləri və cavabdehliyinin dəqiq müəyyən olunması, təhsil müəssisələrinin idarəetmə səlahiyyətlərinin və təhsilin nəticələrinə görə cavabdehliyinin artırılması, fəaliyyətin monitorinqi və qiymətləndirilməsi, təhsilin keyfiyyətini ölçən göstəricilər sisteminin təkmilləşdirilməsi, təhsilin maliyyələşdirilməsinin onun keyfiyyətinə yönəldilməsi, adambaşına maliyyələşdirmə mexanizminin tətbiqi və bu zəmində stimullaşdırıcı mexanizmlərin gücləndirilməsi, habelə maliyyələşmə mənbələrinin yetərliyinin təmin edilməsi təşkil edir.

İnkişaf etmiş ölkələrin təcrübəsindən aydın olur ki, təhsildə idarəetmənin ictimailəşməsi prosesi sürətlənməkdədir. Təhsil strategiyasının uğurla həyata keçirilməsində və təhsilin keyfiyyətinin dayanıqlı yüksəlişində maraqlı tərəflərin cəlb olunmasını təmin edən səmərəli idarəetmə mühüm rol oynayır. Bu, ilk növbədə, bütün növ təhsil müəssisələrinin müstəqilliyinin artırılmasını, valideyn, şagird, tələbə və təhsil prosesinin digər iştirakçılarını geniş cəlb etməklə

təhsil ocaqlarının idarə olunmasını, nəticəyönlü menecmentin və digər müasir idarəetmə texnologiyalarının prosesə tətbiqini tələb edir.

Qloballaşma prosesləri müxtəlif dövlətlərin təhsil sistemlərinin inteqrasiyasını şərtləndirir. Hədəflər kimi Avropa Şurası tərəfindən tövsiyə edilmiş kompetensiyalar qrupu əsas götürülür. Artan tələbə - müəllim mübadiləsi nəzərə alınaraq, təhsil standartlarının unifikasiyası məqsədi daşıyan Bolonya prosesi sürətlənir. Ali təhsildə özəl sektorun rolu tədricən güclənir, dövlət maliyyələşdirilməsi özəl sektorun maliyyəsi ilə əvəzlənir. Dövlət maliyyələşdirməsinin həcmi Almaniya, Avstriya və İtaliyada 90 faiz olduğu halda ABŞ, Avstraliya, Yaponiya və Kanadada cəmi 50-70 faiz təşkil edir.

## 3. Azərbaycan Respublikasında təhsilin vəziyyəti

Son illər ərzində Azərbaycan Respublikasında təhsilin inkişafı istiqamətində mühüm nailiyyətlər əldə edilmişdir. Həyata keçirilən dövlət proqramları çərçivəsində ölkənin bütün regionlarında ümumi təhsilin infrastrukturu əhəmiyyətli şəkildə yenilənmişdir. Ölkədə təhsilin müasir tələblərə cavab verən normativ hüquqi bazası yaradılmışdır. Ali təhsildə Bolonya Bəyannaməsindən irəli gələn başlıca prinsiplərin tətbiqi, təhsil müəssisələrinin müasir informasiya və elmi-metodiki təminatı, təhsil infrastrukturunun yenilənməsi, dərsliklə təminatın yaxşılaşdırılması, ucqar kənd məktəblərinin pedaqoji kadr təminatı, məktəbəqədər və peşə təhsili xidmətlərinin müasir tələblər səviyyəsində qurulması məqsədi ilə dövlət proqramları qəbul edilmiş, layihələr həyata keçirilmişdir.

Aparılan dövlət siyasətinə uyğun olaraq təhsilə ayrılan dövlət xərcləri yalnız son beş ildə 1,3 dəfə artmışdır. Bununla yanaşı, Azərbaycanda insan kapitalının inkişafı üzrə yeni uzunmüddətli çağırışlar təhsil sahəsinin maliyyələşdirilməsində mühüm tədbirlərin həyata keçirilməsini zəruri edir.

**Təhsilin keyfiyyəti və əhatəliliyi.** Birləşmiş Millətlər Təşkilatının 2010-cu il üzrə İnsan İnkişafı Hesabatına əsasən, 2005-ci illə müqayisədə Azərbaycan 34 pillə irəliləyərək 169 ölkə arasında 101-ci yerdən 67-ci yerə yüksəlmiş, "orta insan inkişafı" qrupundan "yüksək insan inkişafı" qrupuna daxil olmuşdur. Azərbaycan iqtisadi inkişaf tempini sürətləndirərək yoxsulluğun azaldılması və orta ömür uzunluğu göstəricisinin artması baxımından böyük nailiyyətlər əldə etmişdir.

Bununla yanaşı, aparıcı beynəlxalq təşkilatların statistik təhlilləri Azərbaycan təhsilinin beynəlxalq rəqabətə davamlılıq göstəricilərinin və Azərbaycan Respublikasının ərazisində yerləşən ali təhsil müəssisələrinin reytinq səviyyəsinin yüksəldilməsinin zəruri olduğunu göstərir.

Ümumi təhsil müəssisələrinin şagird və məzunlarının keyfiyyət göstəricilərinin yaxşılaşdırılması aktual məsələlərdəndir.

Ali və ümumi təhsil üzrə dərsliklərin elmi və metodiki baxımdan təkmilləşdirilməsinə ehtiyac vardır.

Ali təhsil müəssisələri məzunlarının tərkibi iqtisadiyyatın tələbatları ilə tam uzlaşmır. Azərbaycanın ali təhsil müəssisələri tələbələrinin yalnız 1,2 faizi kənd təsərrüfatı ixtisasları qrupu üzrə təhsil alır. 25-34 yaş arasında olan ali təhsilli mütəxəssislərin 67 faizi dövlət sektorunda cəmlənmişdir. Özəl sektorda ixtisaslı işçi qüvvəsinin çatışmazlığı problemi yaranmışdır. Ən böyük kadr çatışmazlığı xidmət sektorunda və kənd təsərrüfatı sahəsində müşahidə olunur.

Hər 100000 nəfərə düşən ali məktəb tələbələrinin sayına görə Azərbaycan Respublikası üzrə göstəricilər əhəmiyyətli dərəcədə artırılmalıdır. Əhali təbəqələri və regionlar arasında xüsusən ali təhsilə çıxış imkanları genişləndirilməlidir.

Son illərdə ilk peşə-ixtisas təhsili müəssisələrinin infrastrukturunun inkişafı sahəsində işlər görülmüş, özəl sektor, işəgötürənlər və beynəlxalq təşkilatlarla əməkdaşlıq əlaqələri qurulmuşdur. Qeyd olunanlara baxmayaraq, bu sahədə həlli vacib olan ciddi problemlər hələ də qalmaqdadır. İlk peşə-ixtisas təhsili müəssisələrini bitirən şəxslərin sayı iqtisadiyyatın tələbatı ilə üst-üstə düşmür. Son illər ümumi təhsil müəssisələrini bitirən məzunların yalnız 11 faizinin ilk peşə-ixtisas təhsili müəssisələrini seçməsi, ümumilikdə həmin pillədə təhsilalanların cəmi 25-27 min nəfər təşkil etməsi əhalidə ilk peşə-ixtisas təhsilinə marağın aşağı olduğunu göstərir.

Məktəbəqədər təhsilə cəlb olunma səviyyəsi də aşağıdır. Belə ki, məktəbəqədər təhsillə əhatə səviyyəsi şəhərlərdə 23,4, kəndlərdə 8,7, ölkə üzrə isə 16,5 faiz təşkil edir. Son illərdə Bakı şəhərində yeni məktəbəqədər təhsil müəssisələrinin inşası və ya əsaslı təmiri istiqamətində atılan addımlar nəticəsində məktəbəqədər təhsillə əhatə səviyyəsi artaraq 27 faizə çatsa da, bu sahədə həllini gözləyən problemlər qalmaqdadır. Ölkənin yaşayış məntəqələrinin 75 faizində məktəbəqədər təhsil müəssisəsi yoxdur.

**Təhsilin məzmunu.** Ümumi təhsilin dövlət standartları və proqramları “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanununa uyğun olaraq təsdiq edilmişdir. Həmin istiqamətdə yeni fənn kurikulumları və dərsliklər ümumi təhsilin I-VI siniflərində tətbiq edilir, VII-XI siniflərində isə həmin məqsədlə işlər davam etdirilir. Məktəbəqədər təhsil üzrə yeni kurikulumun tətbiqinin sürətləndirilməsi zəruridir.

İlk peşə-ixtisas və orta ixtisas təhsili kurikulumları müasir tələblərə cavab vermir. Müəllim hazırlığı üzrə yeni kurikulumlar tətbiq edilsə də, ümumilikdə ali təhsil müəssisələrinin kurikulumları əmək bazarında işçi səriştəsinə olan tələblərlə uyğun gəlmir. Ali təhsil pilləsində kurikulumların inkişafı iqtisadiyyatın inkişaf dinamikasından geri qalır.

**Müəllim və tədris metodikaları.** Səriştəyə əsaslanmayan, əmək bazarında yetərincə rəqabətli olmayan əmək haqqı sistemi və maddi stimullaşdırma mexanizmlərinin adekvat olmaması təhsildə müəllim amilinin inkişafına mənfi təsir göstərmişdir. Təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətləri müasir tələblərə uyğun yüksəldilməlidir. Müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsilə müəllim fəaliyyətinin keyfiyyəti artırılmalıdır.

Son illərdə müəllimlərin əlavə təhsili sahəsində modul-kredit sisteminə əsaslanan, rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərə alan yeni modelin tətbiqinə başlanmış, fəal interaktiv təlim texnologiyaları təcrübədən keçirilmişdir. Bununla yanaşı, əksər müəllimlərin tədris prosesində tətbiq etdiyi metodlar müasir tələblərdən geri qalır. Bir çox hallarda təhsilalanlara əldə etdiyi bilikləri tətbiq etmə və müstəqil yaradıcı düşünmə qabiliyyətləri aşılanmır.

**İdarəetmə**. Təhsilin idarə olunmasında başlıca problemlərdən biri təhsildə tənzimləmə, idarəetmə və nəzarət funksiyalarının dəqiq müəyyən edilməməsidir. Təhsil sistemini idarə edən orqanların səlahiyyətlərinin, funksiyalarının və məsuliyyətinin dəqiq müəyyənləşməsi, idarəetmə prosesində şəffaflığın və maraqlı tərəflərin iştirakının təmin edilməsi zəruridir.

Təhsil müəssisələrinin idarəetmədə rolu məhduddur. Özünüidarəetmə prinsipi əsasında fəaliyyət göstərən təhsil müəssisələri istisna olmaqla, dövlət təhsil müəssisələri maliyyə müstəqilliyinə malik deyildir. Bununla yanaşı, təhsil müəssisələrinin rəhbərliyi tədrisin nəticələrinə görə ciddi məsuliyyət daşımır. Təhsil müəssisələrinin maliyyələşdirilməsi təqdim etdiyi təhsilin nəti-

cələrindən asılı deyildir və keyfiyyətə yönəlməmişdir.

Təhsilin effektiv idarə olunması məqsədi ilə informasiya sistemi yaradılsa da, onun inkişafına ehtiyac duyulur. Təhsilin yüksək keyfiyyətini təmin etmək üçün təhsil sahəsində monitorinq, keyfiyyət və fəaliyyət göstəriciləri sistemi inkişaf etdirilməlidir.

Təhsil və kadr hazırlığı prosesinə, həmçinin təhsilin məzmununun təkmilləşdirilməsinə işəgötürənlərin cəlb olunması çox aşağı səviyyədədir. İşəgötürənlər kadr hazırlığı prosesində iştirak etmək, hazırlanan kadra dair şərtlər irəli sürmək imkanına malik olmalı və buna müvafiq olaraq cavabdehliyini dərk etməlidir.

Təhsilin maliyyələşdirilməsi mexanizmi təkmilləşdirilməli və təhsil sistemində rəqabət mühitinin inkişafını dəstəkləməlidir. Bunun üçün təhsilin bütün pillələrində adambaşına maliyyələşdirmə prinsipinin tətbiqi, səriştəyə və fəaliyyətin nəticələrinə əsaslanan əməyin ödənişi sisteminin yaradılması, maliyyələşdirmənin tədrisin keyfiyyət nəticələrinə görə müəyyən edilməsi məqsədəuyğundur.

**İnfrastruktur.** Həyata keçirilən dövlət proqramları çərçivəsində təhsil təyinatlı yeni binalar inşa edilmiş, ümumi təhsil müəssisələrinin binaları əsaslı təmir olunmuşdur. Təhsildə informasiya-kommunikasiya texnologiyalarının tətbiqi genişlənmiş, bütövlükdə təhsilin infrastrukturu müasirləşmişdir. Bununla yanaşı, təhlillər göstərir ki, tədris prosesində müasir texnologiyalar məhdud miqyasda tətbiq edilir, bəzi hallarda isə yaradılan sistemlərdən az istifadə olunur.

Azərbaycan Respublikasında ümumi təhsilin V-XI sinifləri üzrə şagird-kompyuter nisbəti 2012-ci ildə 20:1 təşkil etmiş, təhsil müəssisələrinin yalnız 37 faizi internet bağlantısı ilə təmin olunmuşdur. Təhsil müəssisələrində internetə çıxış imkanları genişləndirilməklə, təhsildə informasiya-kommunikasiya texnologiyalarının səmərəli tətbiqi inkişaf etdirilməlidir.

Qlobal iqtisadi inkişafın tələblərinə uyğun şəkildə beynəlxalq təcrübədən istifadə təhsil prosesində müasir informasiya texnologiyalarının sürətli tətbiqini zəruri edir. Bu sahədə mövcud problemlərdən biri Azərbaycan dilində müvafiq tətbiqi kontentin olmamasıdır.

Ümumi təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması, regionlarda təhsilin bütün pillələri üzrə, o cümlədən ali təhsil pilləsini əhatə edən yeni təhsil ocaqlarının yaradılması və inklüziv təhsilin tətbiqi kimi tədbirlərin həyata keçirilməsi Azərbaycan Respublikasında təhsil sisteminin inkişafına xidmət edəcəkdir.

## 4. Təhsil sisteminin başlıca vəzifələri

Təhsil sisteminin başlıca vəzifələri aşağıdakılardır:

- ölkənin modernləşməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla Azərbaycan Respublikasının beynəlxalq rəqabət qabiliyyətini yüksəltmək;
- məsuliyyətini dərk edən, demokratiya prinsiplərinə və xalqının milli ənənələrinə, insan hüquq və azadlıqlarına hörmət edən, azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək;
- milli mənəvi və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən, geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli kadrlar hazırlamaq;
- sistemləşdirilmiş bilik, bacarıq və vərdişlərin mənimsənilməsini və əlavə təhsili təmin etmək, təhsilalanları ictimai həyata və səmərəli əmək fəaliyyətinə hazırlamaq.

## 5. Strategiyanın məqsədi

Strategiyanın məqsədi ölkədə səriştəli

təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemini yaratmaqdır. Azərbaycanın təhsil sistemi iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğun olmalıdır.

Strategiyanın reallaşdırılması təhsilin məzmununun, kadr hazırlığının, təhsili idarəetmə sisteminin və təhsil infrastrukturunun qabaqcıl beynəlxalq təcrübəyə və Azərbaycanın inkişaf konsepsiyasına uyğun yenidən qurulmasına imkan verərək, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın bərqərar olmasını, informasiya cəmiyyətinin təşəkkülünü və ölkənin davamlı inkişafını təmin edəcəkdir.

**6. Strateji istiqamətlər**

1. Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması.

2. Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılması.

3. Nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluğuna əsaslanan təhsildə yeni idarəetmə sisteminin formalaşdırılması.

4. Müasir tələblərə cavab verən və ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması.

5. Təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılması.

**7. Strateji hədəflər və tədbirlər**

**1. Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması.**

1.1. Uşaqların erkən yaş dövründə inkişafının səmərəli təhsil modelinə əsaslanan standart və kurikulumlarının hazırlanması:

1.1.1. məktəbəqədər yaşlı uşaqların fiziki və əqli inkişafını, sosiallaşmasını təmin edən, yaradıcılıq qabiliyyətlərini üzə çıxaran, onlarda həyati bilik və bacarıqları, davranış qaydalarını aşılayan təhsil standartlarının və yeni kurikulumların hazırlanması;

1.1.2. uşaqların davamlı inkişafına yönəlmiş pedaqoji fəaliyyətə dəstək vermək məqsədi ilə valideynlərin sistemli şəkildə pedaqoji-psixoloji maarifləndirilməsi üçün "Səriştəli valideynlər" proqramının hazırlanması;

1.2. səriştə əsaslı ümumi təhsil standartları və kurikulumlarının hazırlanması:

1.2.1. 12 illik ümumi təhsilə keçidin təmin olunması üçün mövcud təhsil standart və kurikulumlarının yenilənməsi, tam orta təhsil pilləsində təlimin istiqamətlər üzrə bölünməsi;

1.2.2. kurikuluma əsaslanan yeni dərsliklərin yaradılması, şagird və müəllimlərin müvafiq dərslik seçiminin təmin olunması;

1.2.3. istedadlı uşaqlar üçün xüsusi inkişaf proqramlarının hazırlanması;

1.2.4. xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün inkişaf və inklüziv təlim proqramlarının hazırlanması;

1.3. cəmiyyətin tələblərinə uyğun səriştə əsaslı ilk peşə-ixtisas və orta ixtisas təhsili standartları və kurikulumlarının hazırlanması;

1.4. ali təhsil müəssisələrinin təhsil-tədqiqat-innovasiya mərkəzlərinə çevrilməsinə dəstək verən və rəqabətqabiliyyətli mütəxəssis hazırlığını təmin edən ali təhsil standartlarının tətbiqi:

1.4.1. cəmiyyətin və iqtisadiyyatın tələbatlarına uyğun olaraq hər bir ixtisas üzrə müasir standartların hazırlanması;

1.4.2. qabaqcıl beynəlxalq təcrübə əsasında pedaqoji, mühəndis-pedaqoji və elmi-pedaqoji kadr hazırlığı üzrə müasir kurikulumların hazırlanması;

1.4.3. ali təhsil müəssisələrinə təhsilin məzmununun tətbiqi müstəqilliyinin veril-

məsi;

1.4.4. ali təhsilin səviyyələri arasında əlaqələrin və varisliyin gücləndirilməsi, doktorantura səviyyəsi üçün elmi tədqiqatlar sahəsində yüksək hazırlığı və elmi-pedaqoji fəaliyyət üzrə mükəmməl səriştəyə yiyələnməni təmin edən müasir standartların hazırlanması.

**2. Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılması.**

2.1. Təhsilverənlərin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistemin yaradılması:

2.1.1. təhsilverənlər üçün təhsilin bütün pillələrində təhsilalanların təfəkkürü və şəxsiyyətinin inkişafına yönəlmiş, onların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodologiyasının və müvafiq resursların hazırlanmasının təmin edilməsi;

2.1.2. təhsilverənlərin əlavə təhsili üzrə strukturların yaradılmasının stimullaşdırılması;

2.1.3. müəllimlərin təhsil müəssisəsi səviyyəsində, tədrisdən ayrılmadan peşəkarlıq səviyyəsinin artırılması üzrə özünü doğrultmuş innovativ modellərin tətbiqi;

2.1.4. pedaqoji heyət üçün yeni modul-kredit və rəqabətəsaslı təlimlər sisteminin yaradılması;

2.2. təfəkkürün və şəxsiyyətin inkişafına yönəlmiş, təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim, qiymətləndirmə metodologiyası və resurslarının inkişafı:

2.2.1. yeni kurikulumlara və informasiya-kommunikasiya texnologiyaları əsaslı təlim metodologiyalarına uyğun metodiki vəsaitlərin, didaktik materialların və təlim vasitələrinin hazırlanmasını stimullaşdıran yeni mexanizmlərin yaradılması;

2.2.2. təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsinin qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılması;

2.3. müəllim peşəsinin nüfuzunun artırılması üzrə dövlət siyasətinin inkişafı:

2.3.1. səriştə və nəticə əsaslı diferensiallaşdırılmış, əmək bazarında rəqabətqabiliyyətli əmək haqqı sisteminin yaradılması;

2.3.2. müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması üzrə yeni sistemin yaradılması;

2.3.3. müəllim hazırlığı sistemində internatura modelinin tətbiq edilməsi;

2.4. şəxsiyyətin, cəmiyyətin və dövlətin maraqları baxımından istedadın erkən yaşdan aşkar olunması, inkişafı və dəstəklənməsi üzrə sistemin yaradılması:

2.4.1. istedadın aşkar edilməsi üzrə qabaqcıl beynəlxalq təcrübəyə uyğun diaqnostik metodikaların, psixometrik vasitələrin hazırlanması və bütün təhsil müəssisələrində tətbiqinin təmin edilməsi;

2.4.2. hər bir xüsusi istedadlı təhsilalan üçün fərdi təhsil və inkişaf proqramlarının müəyyənləşdirilməsi, onların fərdi plan əsasında tədris prosesi və kurikulumdankənar məşğuliyyətinin təşkili mexanizmlərinin yaradılması;

2.5. xüsusi qayğıya ehtiyacı olan uşaqların həyata və təhsil mühitinə inteqrasiyasını təmin edən inklüziv təlim metodologiyasının yaradılması:

2.5.1. xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsili və sosial adaptasiyası üçün imkanların təmin edilməsi məqsədi ilə optimal inklüziv təhsil modellərinin tətbiq edilməsi;

2.5.2. məktəbəqədər və ümumi təhsil müəssisələri təhsilverənlərinin inklüziv təhsil üzrə məqsədli əlavə təhsilinin təmin edilməsi.

**3. Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və**

**dövlət-biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması.**

3.1. Təhsil sisteminin tənzimlənməsinin və dövlət təhsil sektorunun idarə edilməsinin qabaqcıl beynəlxalq təcrübə əsasında yenidən qurulması:

3.1.1. tənzimləmə və idarəetmə funksiyalarını həyata keçirən dövlət qurumlarının səlahiyyət və məsuliyyət dairəsinin beynəlxalq təcrübəyə uyğun yenidən müəyyənləşdirilməsi;

3.1.2. təhsil pillələri və səviyyələrinin beynəlxalq təcrübəyə uyğunlaşdırılması:

3.1.2.1. məktəbə hazırlıq təhsilinin (1 il) icbariliyinin təmin olunması;

3.1.2.2. erkən yaşlı uşaqların məktəbəqədər təhsillə əhatəsinin 90 faiz səviyyəsinə çatdırılması;

3.1.2.3. 10 illik icbari ümumi orta təhsil və 2 illik tam orta təhsil modelinə mərhələli şəkildə keçidi təmin etməklə, 12 illik ümumi təhsil sisteminin yaradılması;

3.1.2.4. tam orta təhsil səviyyəsində təhsil müəssisələrinin müxtəlif istiqamətlər üzrə bölünməsi;

3.1.2.5. təhsil müəssisələrinin infrastrukturuna dair norma, standart və qaydaların təkmilləşdirilməsi;

3.1.3. beynəlxalq təcrübə əsasında təhsil müəssisələrinin akkreditasiyası sisteminin yaradılması;

3.1.4. təhsil sahəsində dövlət-biznes partnyorluğu sisteminin yaradılması;

3.1.5. təhsil sistemində dövlət sifarişinin formalaşdırılmasına yenidən baxılması, ölkənin siyasi, iqtisadi və sosial inkişafının real tələbatına əsaslanaraq prioritet sayılan sahələr üzrə kadr hazırlığının təmin edilməsi;

3.1.6. ali və orta ixtisas təhsili müəssisələrinə qəbul və yerləşdirmə mexanizminin təkmilləşdirilməsi, dövlət və özəl ali təhsil müəssisələrinə ödənişli təhsil üzrə qəbul planının ləğv edilməsi və dövlət sifarişinin yalnız ixtisaslar üzrə müəyyənləşdirilməsi;

3.2. təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin yaradılması:

3.2.1. təhsil müəssisələrinə idarəetmə, akademik, maliyyə və təşkilati muxtariyyət verilməsi;

3.2.2. təhsil müəssisələrində strateji idarəetmənin tətbiqi mexanizmlərinin yaradılması;

3.2.3. maraqlı tərəflərin nümayəndələrinin iştirakı təmin edilməklə təhsil müəssisələrinin dövlət-ictimai xarakterdə (Valideyn-Müəllim Assosiasiyası, İdarəedici Şura, Qəyyumlar Şurası və s.) idarə olunmasının təmin edilməsi;

3.3. təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistemin yaradılması:

3.3.1. qabaqcıl beynəlxalq təcrübə əsasında təhsilin pillələri və səviyyələri üzrə keyfiyyət standartları və göstəricilərinin hazırlanması;

3.3.2. ömür boyu təhsil üzrə Milli Kvalifikasiya Çərçivəsinin yaradılması və tətbiqi;

3.3.3. beynəlxalq təhsil proqramlarının tanınması və təhsil müəssisələrində dövlət təhsil proqramları ilə yanaşı ödənişli əsaslarla tətbiqi;

3.3.4. təhsil müəssisələrinin reytinq sisteminin yaradılması;

3.3.5. qabaqcıl beynəlxalq təcrübə əsasında məktəbəqədər və ümumi təhsil üzrə pedaqoji və idarəetmə heyətinin müstəqil sertifikatlaşdırma (lisenziyalaşdırma) sisteminin yaradılması;

3.3.6. keyfiyyətin yaxşılaşdırılması üçün stimullaşdırma mexanizmlərinin, təhsil sistemində innovativ fəaliyyəti stimullaşdıran qrant sisteminin yaradılması və tətbiqi;

3.3.7. təhsil proqramları, tədris resursları, təlim metodikaları, təhsilverənlər, təhsil müəssisələri arasında sağlam rəqabətin stimullaşdırılması, rəqabət elementlərinin müəyyənləşdirilməsi və tətbiq edilməsi;

3.4. təhsilin idarə olunmasının məlumat sistemləri və yeni hesabatvermə modelinin yaradılması:

3.4.1. bütün təhsil pillələri üzrə Təhsilin İdarə olunmasının Məlumat Sistemləri və "Tələbə-məzun" sistemi əsasında hesabatvermə, təhlil və proqnozlaşdırma sisteminin yaradılması və mütəmadi yenilənməsinin təmin edilməsi;

3.4.2. təhsil müəssisələrində məlumat bazalarının, məzun-koordinasiya-informasiya sistemlərinin yaradılması, onların mütəmadi yeniləndirilməsi və idarəetmə prosesində istifadəsinin təmin edilməsi;

3.4.3. əmək bazarının mütəmadi öyrənilməsi sisteminin yaradılması;

3.5. qabaqcıl beynəlxalq təcrübəyə əsaslanaraq, təhsil pillələrinin bütün səviyyələrini əhatə edən yeni qiymətləndirmə mexanizmlərinin hazırlanması:

3.5.1. təhsil müəssisələrində keyfiyyətin monitorinqi (xarici və daxili) və qiymətləndirmə mexanizmlərinin yaradılması;

3.5.2. ümumi təhsilin səviyyələri nəzərə alınmaqla, şagird nailiyyətlərinin monitorinqi və qiymətləndirilməsi üzrə sistemin təkmilləşdirilməsi;

3.5.3. ümumi təhsil müəssisələri şagirdlərinin biliyin qiymətləndirilməsi üzrə beynəlxalq proqramlarda iştirakının təmin olunması.

**4. Müasir tələblərə cavab verən və ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması.**

4.1. Təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyaları əsaslı təlim metodologiyasının tələblərinə uyğun infrastrukturun yaradılması, hər bir təhsil müəssisəsinin internetlə, ümumi orta təhsil səviyyəsində hər bir şagirdin elektron dərsliklərlə yüklənmiş kompyuter-planşetlə təmin olunması;

4.2. təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması;

4.3. distant təhsil, istedadlı və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün təhsil və inkişaf, yaşlıların təhsili, peşə-ixtisas və təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən regional universal mərkəzlərin yaradılması;

4.4. müasir təminatlı peşə-tədris mərkəzlərinin və komplekslərinin yaradılması;

4.5. məktəbəqədər təhsil müəssisələrinin yaradılması, onların fəaliyyətinin stimullaşdırılması mexanizmlərinin hazırlanması;

4.6. kampusların yaradılmasının təşviqi;

4.7. ömür boyu təhsilə artan tələbatın ödənilməsi üçün kitabxana fəaliyyətinin modernləşdirilməsi, rəqəmsal təhsil resurslarından istifadə imkanlarının genişləndirilməsi;

4.8. təhsillə bağlı media və internet resurslarının inkişafının təmin edilməsi.

**5. Təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılması.**

5.1. Təhsilə adekvat həcmdə maliyyə resurslarının cəlb edilməsi, təhsilin maliyyələşdirilməsi xərclərinin Ümumi Daxili Məhsula nisbətinin mərhələlərlə 5-6 faizə çatdırılması, nəticəyönlü büdcə planlaşdırılması və müxtəlif mənbəli maliyyələşdirmə mexanizmlərinin yaradılması;

5.2. təhsil müəssisələrini bir təhsilalana düşən xərc əsasında maliyyələşdirmə mexanizminə keçid;

5.3. dövlət və bələdiyyə təhsil müəssisələrində özünümaliyyələşdirmə prinsiplərinin təşviqi, ödənişli təhsil xidmətlərinin göstərilməsinin dəstəklənməsi;

5.4. büdcədənkənar vəsaitlər hesabına formalaşdırılan Təhsilin İnkişafı Fondunun yaradılması;

5.5. təhsil tədqiqatlarının yeni maliyyələşmə mexanizminin tətbiqi;

5.6. mülkiyyət formasından asılı olmayaraq müvafiq təhsil qurumları cəlb edil-

məklə təhsilverənlərin əlavə təhsilinin dövlət sifarişi əsasında adambaşına maliyyələşdirilməsi;

5.7. təhsil müəssisələrinin keyfiyyət göstəricilərinə əsaslanan investisiya xərcləri sisteminin yaradılması;

5.8. ali təhsil müəssisələrində dövlət büdcəsi vəsaitindən istifadə olunmayaraq məqsədli kapital fondlarının yaradılmasının stimullaşdırılması;

5.9. aztəminatlı ailələrdən olan uşaq və gənclər üçün bərabər təhsil imkanlarının yaradılması məqsədi ilə maddi dəstək sisteminin yaradılması;

5.10. müəllimlərin maddi motivasiyasının yaxşılaşdırılması, onların illik əmək haqqının adambaşına düşən Ümumi Daxili Məhsula nisbətinin mərhələlərlə, səriştə və nəticə əsasında diferensiallaşdırmaqla 1,8-2 dəfəyədək artırılması;

5.11. tam orta təhsildə bir şagirdə düşən illik xərclərin adambaşına düşən Ümumi Daxili Məhsula nisbətinin mərhələlərlə 2 dəfəyədək artırılması;

5.12. müasir, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan təhsil infrastrukturunun, o cümlədən elektron təhsilin yaradılmasına əlavə vəsaitlərin ayrılması;

5.13. təhsil şəbəkəsində rasionallaşdırma tədbirləri həyata keçirməklə, regionlar arasında təhsilin keyfiyyətini bərabərləşdirmək üçün ucqar regionlarda yerləşən təhsil müəssisələri üçün əlavə maliyyələşmənin təmin olunması;

5.14. təhsilə çıxış imkanlarını yaxşılaşdırmaq üçün maliyyə mexanizmlərinin, o cümlədən tələbə kreditləri sisteminin genişləndirilməsi;

5.15. məktəbəqədər və ümumi təhsil müəssisələrində uşaqlara pulsuz əsasda müvafiq xidmətlərin (dərs və ya təlim vəsaitləri və s.) göstərilməsi.

**8. Strategiyanın həyata keçirilməsi**

Strategiyanın uğurlu həyata keçirilməsinin əsas şərtləri onun məqsədi və məzmunu haqqında aydın təsəvvürün yaradılması, ictimai dəstək qazanması və reallaşmasını təmin edən effektiv icra mexanizminin formalaşdırılmasıdır.

Strategiyanın məqsədi və məzmunu kütləvi informasiya vasitələri və digər üsullarla əhaliyə, təhsil müəssisələrinin pedaqoji heyətinə və digər hədəf qruplarına çatdırılır.

Strategiyanın həyata keçirilməsi üzrə fəaliyyət planı beynəlxalq ekspertlər cəlb olunmaqla hazırlanır və təhsil sisteminin hazırlığı nəzərə alınaraq, islahatların məqsədini və strateji istiqamətləri, seçilmiş prioritetləri, onların reallaşdırılması üçün qəbul olunmalı dövlət proqramlarını, icraya məsul və tərəfdaş qurumları, ara və yekun hədəfləri və icra dövrünü müəyyən edir.

Strategiyanın həyata keçirilməsi üzrə fəaliyyət planı Azərbaycan Respublikasının Prezidenti tərəfindən təsdiq olunur.

Azərbaycan Respublikasının Nazirlər Kabineti Azərbaycan Respublikasının Prezidentinə Strategiyanın icrasının gedişi barədə hər il üzrə hesabat təqdim edir.

# TƏHSİL SİSTEMİ MİLLİ DƏYƏRLƏRƏ VƏ PEŞƏKAR KOMPETENSİYALARA MALİK AZƏRBAYCAN VƏTƏNDAŞI YETİŞDİRMƏLİDİR



**Təhsil naziri Mikayıl CABBAROV:**
**"Azərbaycanın təhsil sisteminin və təhsil infrastrukturunun inkişaf səviyyəsinin dünyanın aparıcı təhsil sistemləri səviyyəsinə çatdırılması əsas məqsədlərdəndir"**

*Yeni dərs ili ərəfəsində təhsil prosesi, onun keyfiyyət göstəriciləri, həllini gözləyən problemlər və qarşıda duran hədəflər ictimaiyyətin aktual müzakirə predmetinə çevrilmişdir. 5 ay öncə dövlət başçısı tərəfindən bu sahədə ciddi dəyişikliklərə rəvac verilməsinin və aparılan kadr əvəzlənməsinin məntiqi nəticəsindən danışmaq zaman baxımından hələ tez olsa da, təhsil sektorunda ciddi islahatların başlanması və bu sahədə ilkin uğurların əldə olunması danılmaz faktdır. Öz sabahımızdan - gələcək nəslin təhsilindən ciddi narahatlıq keçirən vətəndaşlara indi tam aydındır ki, təhsil sahəsində vəziyyət, sadə dillə desək, artıq əvvəlki kimi olmayacaq. Bu istiqamətdə ciddi dönüşün yaranmasını şərtləndirən əsas məsələ odur ki, valideynlərin, həmçinin şagird və tələbələrin uzun illərdir problem və nöqsan kimi səciyyələndirdiyi məqamlar indi yeni təhsil nazirinin öz dilindən də səslənir, daha gizlədilmir, təkzib olunmur və onların aradan qaldırılması fəaliyyət prioriteti kimi elan edilib.*

*Elə təhsil naziri Mikayıl Cabbarovla söhbətimizdə də məhz bu problemlərə nəzər saldıq. Yazılı mediaya ilk geniş müsahibəsində Mikayıl Cabbarov təhsil naziri kimi fəaliyyət göstərdiyi müddət ərzində görülmüş işlərdən, qarşıda duran problemlərdən*

*və onların həlli ilə bağlı həyata keçirilən tədbirlərdən danışdı.*

## Hər bir məzun üçün bərabər imkanların yaradılması ilə bağlı qərar özünü doğrultdu

*- Mikayıl müəllim, yeni dərs ili Sizin bir nazir kimi rəhbərliyiniz altında ölkənin təhsil ictimaiyyətinin qeyd edəcəyi ilk tədris ilidir. Ölkənin çoxminli təhsil işçiləri və təhsilalanları üçün nazirin bu münasibətlə bağlı fikirləri olduqca maraqlıdır...*

- Bilirsiniz ki, dərs ilinin ilk günü - Bilik Günü ölkədə ən geniş qeyd olunan, demək olar ki, bütün ölkə əhalisinin bayram kimi qəbul etdiyi günlərdəndir. Bu münasibətlə bütün xalqımızı, təhsil ictimaiyyətini, müəllim və şagirdləri, tələbələri, xüsusilə də məktəbə ilk dəfə qədəm qoyan uşaqları təbrik edirəm. Təhsilverənlərə və təhsilalanlara, ümumilikdə ölkənin bütün pedaqoji ictimaiyyətinə yeni-2013/2014-cü dərs ilində uğurlar arzulayıram.

Onu da qeyd edim ki, ümumtəhsil məktəblərində ilk dərs saatı vətənpərvərlik mövzusuna həsr ediləcək. Azərbaycanın müstəqilliyinin, dövlətçiliyinin günbəgün möhkəmlənməsi üçün savadlı, vətənpərvər gənclərin yetişdirilməsində hamı fəallıq göstərməli, həm ailədə, həm də məktəbdə uşaqlara vətənə məhəbbət hissi aşılanmalıdır. Ölkəmizin yeni cəmiyyət quruculuğunda ən ümdə məsələlərdən biri gənc nəslin vətənpərvərlik ruhunda yetişdirilməsi, onlarda təhsilə, elmə marağın daha da artırılması və geniş dünyagörüşün formalaşdırılmasıdır.

*- Yeri gəlmişkən, bir zəruri məqama da aydınlıq gətirək. Təhsildə keyfiyyət göstəricilərindən biri də məhz təhsil infrastrukturunun yeniləşdirilməsi, maddi-texniki bazasının möhkəmləndirilməsidir. Bu istiqamətdə son dövrlərdə daha genişmiqyaslı tədbirlər həyata keçirilib. Yeni dərs ilini bu sahədə hansı yeniliklərlə qarşılayırıq?*

- Öncə qeyd edim ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə son illər ölkədə çoxsaylı uğurlara imza atılmışdır. Hazırda ölkəmiz sürətlə inkişaf edir, müasirləşir. Dövlətimizin və xalqımızın qədimliyi ilə müasirliyinin gözəl bir sintezi əmələ gəlib. İstər Azərbaycanın iqtisadi sahədə olan uğurları, istər regionlarımızın inkişafı baxımından əldə edilən nailiyyətlər, istər beynəlxalq səviyyədə dövlətimizin nüfuzunun artması, təbii olaraq, bizim üçün də çox yüksək bir standart müəyyənləşdirir.

Azərbaycan Respublikasının təhsil sisteminin və təhsil infrastrukturunun inkişaf səviyyəsinin dünyanın aparıcı təhsil sistemləri səviyyəsinə çatdırılması əsas məqsədlərdən biridir.

Ölkədə son illər ərzində minlərlə tədris ocağı yenidən tikilib və yaxud əsaslı şəkildə təmir edilərək bərpa olunub. Bütün məktəblərdə kompyuterləşdirmə proqramı, informasiya texnologiyalarının tətbiqi məsələləri fəal şəkildə yerinə yetirilib. Ancaq bütün bunlara baxmayaraq, Azərbaycanın bir çox bölgələrində, regionlarında, ucqar kəndlərində, hətta Bakının özündə əsaslı təmirə ehtiyacı olan təhsil ocaqlarımız hələ də mövcuddur. Demək olar ki, bu məsələnin böyük bir hissəsi həll olunub. Bu il də həmin istiqamətdə xeyli iş görülüb.

Cari ildə Bakı şəhəri və respublikanın regionlarında 144 yeni məktəb binası və 13 mövcud məktəbdə əlavə tədris korpusları tikilib, 115 məktəbdə əsaslı təmir işləri həyata keçirilib. 2011-2013-cü illəri əhatə edən "Bakı şəhəri və onun qəsəbələrinin sosial-iqtisadi inkişafına dair" Dövlət Proqramında tikintisi və əsaslı təmiri nəzərdə tutulmayan, lakin təmir işlərinin aparılmasına ehtiyacı olan 164 ümumtəhsil müəssisəsində Təhsil Nazirliyi tərəfindən yay aylarında cari təmir işləri aparılıb.

Amma maddi-texniki baza dedikdə, biz bu məsələni təkcə binalarla, tikililərlə

məhdudlaşdıra bilmərik. Məncə, bu məsələyə bir az geniş baxılmalıdır. Təhsil müəssisələri müasir və yüksək keyfiyyətli tədris avadanlıqları ilə təmin edilməli, eyni zamanda, informasiya texnologiyalarının imkanlarından istifadə daha geniş yayılmalıdır.

*- Cənab nazir, bu il orta məktəbləri bitirən şagirdlərin hamısına attestat verilməsi ilə bağlı qəbul olunmuş qərar ictimaiyyətdə rəğbətlə qarşılandı. Bu addım hansı zərurətdən irəli gəldi?*

- İlk növbədə bu, bir daha nümayiş etdirdi ki, cənab İlham Əliyev hər bir Azərbaycan vətəndaşının Prezidentidir, hər bir məzun üçün bərabər imkanlar yaradılmasının tərəfdarıdır. Bu qərar nəticəsində məzunların böyük əksəriyyəti üçün ölkənin ali və orta ixtisas təhsili müəssisələrinə qəbul imtahanlarında iştirak etmək və sosial həyata aktiv şəkildə qoşulmaq imkanları yaranmış oldu.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 23 may 2013-cü il tarixli qərarı ilə təhsil haqqında attestat və digər sənədlərin verilməsi ilə bağlı münasibətləri tənzimləyən qanunvericilik aktlarına müvafiq dəyişikliklər edildi. Qəbul edilmiş qərar əsasında illik qiymətlərdən asılı olmayaraq bütün 9-cu sinif şagirdləri buraxılış imtahanlarına buraxıldılar. Onlar həmçinin buraxılış imtahanında alınan qiymətlərdən asılı olmayaraq, yekun attestasiyanın nəticələrini özündə əks etdirən şəhadətnamə almaq hüququna malik oldular.

11-ci sinif məzunları bütün fənlər üzrə müsbət illik qiymətlər (3 və daha yuxarı) almaq şərti ilə buraxılış imtahanlarına buraxıldılar. Bu kateqoriya məzunların attestat qiyməti 10-cu və 11-ci siniflər üzrə illik qiymətlər və imtahan nəticəsində alınmış qiymətlərin yuvarlaq orta qiymətidir.

2012/2013-cü tədris ilinin yekunlarına görə, ölkə üzrə ümumtəhsil məktəblərinin XI siniflərini 84769 şagird bitirmişdir. Onların 84121 nəfəri buraxılış imtahanlarına buraxılmış və attestat almışlar. Bu, məzunların ümumi sayının 99,3 faizini təşkil edir.

Bu il buraxılış imtahanlarında “2” qiyməti almış 128 məzun qəbul imtahanlarında uğurlu nəticələr göstərərək ali məktəblərə qəbul olunub. Onların arasında I ixtisas qrupu üzrə 350, II ixtisas qrupu üzrə 301, III ixtisas qrupu üzrə 559, IV ixtisas qrupu üzrə 330 bal toplamış abituriyentlər də vardır.

## Təhsilin keyfiyyəti müəllimlərin peşəkarlıq səviyyəsindən bilavasitə asılıdır

*- Göründüyü kimi, orta məktəb buraxılışı ilə bağlı ilkin islahatlarınızın artıq real uğurları var. Orta məktəbə qəbul prosesində tələb olunan yaş məsələsinə də nəzər salmağınız oxucularımız üçün maraqlı olardı. Dünya təcrübəsinə nəzər saldıqda görürük ki, bəzən uşaqlar hətta 5 yaşında da məktəbə gedirlər. Məlum olduğu kimi, Avropa ölkələrində məktəbəqədər təhsil yüksək inkişaf etmişdir. Həmin ölkələrdə uşaqlar əsasən 3-4 yaşında ibtidai təhsilə hazırlıq proqramlarına cəlb olunurlar. Azərbaycanda bu proses necə tənzimlənəcək?*

- Xüsusi istedada malik uşaqların vaxtından əvvəl I sinfə qəbulu ilə əlaqədar Təhsil Nazirliyinin 17 iyul 2013-cü il tarixli əmri ilə qaydalar təsdiq edilib. Həmin qaydalara görə, vaxtından əvvəl I sinfə qəbul hər il 16 sentyabr - 31 dekabr müddətində 6 yaşı tamam olan uşaqlara şamil olunur.

Burada söhbət yalnız uşağın I sinif üzrə proqram materiallarını mənimsəməsindən getmir. Başlıca məsələ uşağın idraki inkişafında, sabit fiziki duruma, çevik təfəkkürə, psixoloji dayanıqlığa, məntiqi mühakimə qabiliyyətinə malik olmasındadır. Proqram materialını mənimsəyən hər uşağa xüsusi istedadlı uşaq demək mümkün deyil. Ola bilər ki, hər hansı bir uşaq 5 yaşında məktəb təliminə hazır olsun. Belə faktlar,

əlbəttə, vardır. Lakin bu keyfiyyət, ümumilikdə, az faiz uşaqlara nəsib olur. Bu, bir çox hallarda məktəbəqədər təhsil şəbəkəsinin əhatə dairəsindən və keyfiyyətindən asılı məsələdir. 3-4 yaşından uşağın ibtidai təhsilə hazırlıq proqramlarına cəlb olunması məsələsinə gəlincə, bunun üçün xüsusi tədris proqramları hazırlanmalıdır.

Bəzi mütəxəssislər hesab edirlər ki, uşağın qayğısız uşaqlıq həyatını, sərbəstliyini əlindən almaq olmaz. Ətraf aləmlə, təbiətlə, həmyaşıdları ilə ünsiyyət uşağın inkişafında, dünyagörüşünün formalaşmasında mühüm əhəmiyyətə malikdir.

Bütün bunları nəzərə alaraq valideynlərə məsləhətim budur ki, bəzi zahiri əlamətlərinə görə uşaqlarını ehtiyac olmadan parta arxasında oturtmağa cəhd göstərməsinlər.

*- Bu gün təhsilin keyfiyyətinin artırılması prioritet məsələlərdən biridir. Bu baxımdan neçə vaxtdır ki, müzakirə olunan məsələ - müəllimlərin attestasiyasının keçirilməsi gözlənilirmi? Müəllimlərin nüfuzunun yüksəldilməsi ilə bağlı digər tədbirlərin görülməsi də nəzərdə tutulurmu?*

- Əslində sizin bu sualınız cəmiyyətdə daha səriştəli müəllimlərə ehtiyacın artdığını göstərir. Bu gün ölkə üzrə 4515 ümumtəhsil məktəbində 150 mindən artıq pedaqoji işçi çalışır.

Təhsilin keyfiyyəti müəllimlərin peşəkarlıq səviyyəsindən bilavasitə asılıdır. Bu mənada müəllimlərin attestasiyası məsələsi cəmiyyətdə xeyli müddətdir davam edən müzakirə mövzusudur. Beynəlxalq təcrübədə müəllimlərin karyera inkişafı və maddi həvəsləndirmə məqsədilə onların fəaliyyətinin attestasiyası həyata keçirilir. Bu məsələ “Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasında nəzərdə tutulub və müvafiq normativ-hüquqi baza yarandıqdan sonra tətbiq ediləcək.

Müəllimlərin əksəriyyəti xüsusi bir missiya daşıyıcısıdır. Biz düşünmürük ki, müəllimlərin müəllim olmaq istəyinin yeganə səbəbi məhz maddi təminatla, məvaciblə bağlıdır. Eyni zamanda mən bunu da vurğulamaq istəyirəm ki, müəllimlərin məvacibi, həyat səviyyəsi, rifahı məsələsi bu gün bizi qane edən səviyyədə deyil. Amma çox mühüm və əhəmiyyətli məsələ odur ki, bu necə həyata keçirilməlidir. Bunun düzgün mexanizmi nədir, bu gün bütün müəllimlərin əməkhaqqının, məvaciblərinin, sosial təminatlarının avtomatik şəkildə artırılması kimi yanaşma bizim təhsilimizin keyfiyyətinə, müəllimlərin və müəllim olmaq istəyən insanların stimullaşdırılmasına düzgün bir yanaşmadırmı? Yoxsa biz burada daha kreativ, dünya təcrübəsinə daha uyğun bir yanaşma seçməliyik? Bu gün bütün bu məsələlər səmərəli formada müzakirə olunur. Təbii olaraq müvafiq qərarların qəbul olunması üçün məsələni hərtərəfli araşdırmalıyıq.

## Valideynlərin məktəbin həyatında iştirakı prosesində tam şəffaflığın tərəfdarıyıq

*- Məktəb-valideyn münasibətlərinin daha səmərəli təşkili istiqamətində müvafiq addımların atılması haqqında müəyyən fikirlər bildirmisiniz. Bu istiqamətdə hansı tədbirlərin həyata keçirilməsi nəzərdə tutulub?*

- İlk növbədə qeyd edim ki, hər bir şəxsin formalaşmasında ailə və valideynlər mühüm rol oynayır. Bəzi valideynlər bir çox hallarda övladlarının təhsil almasını yalnız məktəbin problemi, dövlətin vəzifəsi kimi görür. Əslində bu məsələdə valideynlər də üzərlərinə düşən vəzifələri düzgün dəyərləndirməlidirlər.

Bu gün məktəblərimizdə valideyn komitələri, valideyn assosiasiyaları adlı qurumlar var. Həmin qurumlar, yaxud valideynlər bu və ya digər məqsədlər üçün dövlət büdcəsində nəzərdə tutulmayan, misal üçün, mədəni tədbirlərin qrup şəklində ke-

çirilməsi, şagirdlərin asudə vaxtlarının təşkili və digər bu kimi tədbirlər keçirə bilərlər. Məlumdur ki, bu gün məktəblərin mühafizəsi üçün maliyyə vəsaiti ayrılmır. Valideyn komitələri həmçinin bu istiqamətdə də fəaliyyət göstərə bilərlər, təbii ki, könüllü şəkildə həyata keçirilən təşəbbüslər olarsa.

Vətəndaş cəmiyyətinin və valideynlərin məktəbin həyatında iştirakı prosesini biz məhdudlaşdırmaq niyyətində deyilik. Amma bu yanaşmadan heç bir şəkildə sui-istifadə etmək yolverilməzdir. Yəni biz bu məsələlərdə də tam şəffaflığın tərəfdarıyıq.

Valideynlərin məktəb həyatında, təhsil ocaqlarının idarəolunması prosesində iştirakı artmalıdır. Valideyn komitələri təhsil müəssisələri ilə valideynlər arasında əsas körpüyə çevrilməlidir. Bir neçə müstəqil valideyn komitəsinin fəaliyyət göstərdiyi məktəblərin direktoru ilə görüşlərimiz zamanı məlum oldu ki, həmin məktəblərdə müstəqil valideyn komitələrinin işi daha şəffaf və səmərəli şəkildə təşkil olunmuşdur.

Valideyn komitələrinin gördüyü işlərin şəffaf hesabatları hazırlanmalı və məktəblərdə xüsusi guşədə asılmalıdır. Məktəb direktorları və müəllimlər valideyn komitələrinin maliyyə məsələlərinə müdaxilə edə bilməzlər. Valideyn komitələrini valideynlər özləri müstəqil şəkildə idarə etməlidirlər.

Qeyd etdiyimiz kimi, valideyn komitələrinin fəaliyyətindən heç bir halda sui-istifadə halları olmamalıdır. Valideynlər biləndə ki onların məktəbə könüllü yardımı övladı üçün daha yaxşı tədris şəraitinin yaradılmasına sərf edilir, o zaman məktəblə daha yaxın təmasda olmağa səy göstərirlər.

## Xaricdə təhsil proqramı dünyada mövcud olan nadir layihələrdəndir

*- Cənab nazir, xaricdə təhsil üzrə Dövlət Proqramı Azərbaycan gənclərinin dünyanın nüfuzlu universitetlərində ali təhsil alması baxımından çox böyük əhəmiyyətə malikdir. Bu il dövlət proqramına qəbul prosesinə nə kimi yeniliklər tətbiq olundu?*

- Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 16 aprel tarixli 2090 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" ölkəmizin peşəkar mütəxəssis potensialının gücləndirilməsi istiqamətində ən önəmli təşəbbüslərdən biridir. Proqram gənc kadrların xaricdə təhsilinə böyük məbləğdə vəsait yatırılması yönündə dünyada mövcud olan nadir layihələrdəndir.

Ümummilli lider Heydər Əliyevin uzaqgörən siyasəti nəticəsində ötən əsrin 70-80-ci illərindən azərbaycanlı gənclərin SSRİ-nin nüfuzlu ali məktəblərində oxumağa göndərilməsi ilə yaxşı bir ənənənin əsası qoyulub. Ulu öndər ölkəmizin müstəqillik illərində də xaricdə ali təhsil alan gənclərə xüsusi diqqət göstərirdi. Bu siyasət hazırda ölkə Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilməkdədir. Neft kapitalının insan kapitalına çevrilməsi strategiyası Azərbaycanda dövlət siyasətinin prioritet istiqamətlərindən biridir. Gəncliyin müasir tələblər səviyyəsində yetişməsinə ayrılan vəsait ölkənin, xalqın firavan gələcəyinin daha etibarlı təminatına zəmin yaradır.

Xaricdə təhsil üzrə Dövlət Proqramı ilə istər bir nazir kimi, istərsə də vətəndaş kimi fəxr edirəm. Düşünürəm ki, bu proqram cənab Prezidentin hər bir azərbaycanlı üçün bərabər təhsil imkanları yaratmasının daha bir təzahürüdür. Təyinatımın ilk günündən söz vermişəm və bu gün də bunu vurğulayıram ki, xaricdə təhsil alan hər bir azərbaycanlı tələbənin qayğıları, ehtiyacları bizim diqqət mərkəzimizdə olacaqdır. Həmkarlarımızla birlikdə bunun üçün əlimizdən gələni edəcəyik.

Dövlət proqramı çərçivəsində 2007-2012-ci illərdə ümumilikdə 1825 nəfər

azərbaycanlı tələbə xarici ölkələrin nüfuzlu ali məktəblərində oxumağa göndərilmişdir.

Bu günə qədər Azərbaycan Respublikasının Prezidenti yanında Təhsil üzrə Komissiya tərəfindən 2013/2014-cü tədris ilində xarici ölkələrin ali təhsil müəssisələrində dövlət proqramı çərçivəsində təhsil almaq üçün sənəd vermiş namizədlərdən 315 nəfər barədə müsbət qərar qəbul olunmuşdur. Hazırda bu proses davam etməkdədir.

Ötən illərdən fərqli olaraq, dövlət proqramına sənəd vermiş namizədlərin ilkin seçimi üçün Təhsil Nazirliyində təşkil edilən müsahibəni aparacaq komissiya fəaliyyət göstərir. Komissiyanın tərkibində Təhsil Nazirliyinin əməkdaşları ilə yanaşı, Səhiyyə Nazirliyi (tibb ixtisası istiqaməti üzrə müraciət edənlərlə), Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyası, Azərbaycan Diplomatik Akademiyası, Azərbaycan Dillər Universiteti və Xaricdə Təhsil Alan və Məzun Olmuş Azərbaycanlı Gənclərin Beynəlxalq Forumunun (ASAIF) (xaricdə təhsil təcrübəsi baxımından) nümayəndələri də təmsil olunur. Bu amil seçimlərin şəffaf aparılmasına və daha layiqli namizədlərin seçilməsinə əlverişli zəmin yaradır. Əminik ki, xaricdə təhsil alan tələbələr Azərbaycanı layiqincə təmsil edəcək və təhsillərini uğurla başa vurub Vətənə qayıtdıqdan sonra yüksək səviyyəli mütəxəssis kimi respublikamızın inkişaf prosesinə layiqli töhfə verəcəklər.

*- Cənab nazir, ümumtəhsil və ilk peşə-ixtisas təhsili müəssisələrinə müəllimlərin işə qəbulu prosesi artıq başa çatıb. Bu prosesin yekunu ilə bağlı nə deyə bilərsiniz?*

Əvvəlcə bildirim ki, bu il vakant yerlərin sayı 3286, müraciətlərin sayı isə 18782 olmuşdur. Müəllimlərin işə qəbulu üzrə müsabiqənin yekun nəticələrinə görə ümumilikdə 1474 nəfər işə qəbul olunub.

Əvvəlki illərdən fərqli olaraq, cari ildə müəllimlərin işə qəbulu üzrə vakant yerlərin sayı artsa da, keçid balı aşağı salınmamışdır. İşə qəbul olunacaq müəllimlərin peşəkar kompetensiyalarının daha yüksək olması müsabiqənin əsas meyarı kimi qəbul olunmuşdur.

Təhsil müəssisələrində boş qalan vakant yerlərə aid dərs yükünün digər müvafiq fənn müəllimləri arasında bölünməsi və ya əvəzçilik qaydasında uyğun ixtisas müəllimlərinə verilməsi nəzərdə tutulub.

## Orta təhsilin məqsədi tam şəkildə müstəqil həyata hazır olan Azərbaycan vətəndaşını formalaşdırmaqdır

*- Kurikulumun tətbiqi, dərsliklərin hazırlanması və yerlərə çatdırılması ilə bağlı vəziyyət necədir?*

- Ümumiyyətlə, hər hansı bir köklü dəyişikliklərin tətbiqindən öncə bu məsələ ciddi araşdırılmalıdır. Biz bu məsələni araşdırırıq və bu məsələ ətrafındakı müzakirələrdə fikir müxtəlifliyi var. Qəbul olunacaq qərar daha çox şagirdin maraqlarına cavab verəcək. Müasir dövrdə biz müəyyən səviyyə və biliklərə malik şagird hazırlamalıyıq.

Əhəmiyyətli məqam ondan ibarətdir ki, orta təhsilə və məktəbə ali təhsil üçün hazırlıq funksiyasını yerinə yetirən bir qurum kimi baxmamalıyıq. Hesab edirik ki, orta təhsilin məqsədi tam şəkildə müstəqil həyata hazır olan Azərbaycan Respublikasının vətəndaşını formalaşdırmaqdır.

Dərsliklərin hazırlanmasına gəldikdə, qeyd etməliyəm ki, Təhsil Nazirliyində dərsliklərin çapı və yerlərə çatdırılması məsələsi ilə əlaqədar yaradılmış işçi qrupu üzərinə düşən vəzifələrin öhdəsindən layiqincə gəlib. Belə ki, 2013/2014-cü dərs ili üçün II, IV, VI, VIII, IX və XI siniflər üçün 139 adda 4011000 nüsxə dərslik və müəllim üçün metodik vəsait hazırlanmış, çap edilmiş və yerlərə çatdırılmışdır.

VI sinif dərslikləri ilk dəfə olaraq kurikulum əsasında hazırlanıb. IX sinfin

"Alman dili" dərsliyi də yeni dərslikdir. Digər dərsliklər isə əvvəlki nəşrlər üzərində redaktə işi aparılmaqla çap olunub.

TQDK tərəfindən monitorinqi aparılmış II, IV və VII sinif dərsliklərində redaktə və korrektə işləri aparılıb. Dərsliklər növbəti illərdə tam tirajla çap olunarkən monitorinqin nəticələri nəzərə alınacaq.

Yeni dərs ilində orta ixtisas təhsili müəssisələri üçün 13 adda 17800 nüsxə dərslik, dərs vəsaiti və metodik vəsait (elektron versiyaları ilə birgə) ilk dəfə hazırlanıb nəşr edilib və orta ixtisas təhsili müəssisələrinə paylanıb.

*- Təhsildə son illərdə mövcud olan problemlərdən danışarkən peşə-ixtisas yönümü sahəsindəki vəziyyət diqqəti daha çox cəlb edir. Burada hansı dəyişikliklər nəzərdə tutulur? İlk peşə-ixtisas təhsilinin ölkə iqtisadiyyatının tələbatına uyğunlaşdırılması istiqamətində nə kimi tədbirlər həyata keçiriləcək?*

- Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi siyasət sayəsində ilk peşə-ixtisas təhsilinin statusunun artırılması istiqamətində son illər bir sıra mühüm qərarlar qəbul edilib. Ölkə iqtisadiyyatının sürətli inkişafı prosesinin uğurla davam etdirilməsi ixtisaslı kadrlara olan tələbatı daha da artırıb.

Peşə təhsili sisteminin əhatə dairəsinin genişləndirilməsi və kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəldilməsi məqsədilə Təhsil Nazirliyi Müasir Azərbaycan Peşəkarları Layihəsinin icrasına başlayıb. Bu layihə çərçivəsində müasir tipli pilot peşə təhsili komplekslərinin yaradılması nəzərdə tutulub. Bu il ilk peşə-ixtisas təhsili müəssisələrinin inkişaf prioritetlərinə uyğun olaraq 5 pilot layihə reallaşdırılacaq, ölkəmizin peşə təhsili sistemində ilk dəfə məzunlara beynəlxalq ixtisas dərəcəsi veriləcək.

Növbəti tədris ilindən etibarən ilk peşə-ixtisas təhsili müəssisələrində çalışan müəllimlərin attestasiyasına başlamağı nəzərdə tutmuşuq. Həmçinin regionların sosial-iqtisadi inkişafı Dövlət Proqramına uyğun olaraq ehtiyac duyulan bir sıra yeni ixtisasların açılmasını planlaşdırırıq.

İlk peşə-ixtisas təhsili müəssisələri rəqabətə hazır olmalı və mövcud qanunvericilik çərçivəsində maddi-texniki bazalarının gücləndirilməsi işinə əlavə təkan verməlidirlər. Bu baxımdan kommersiya fəaliyyəti ilə məşğul olmaqla əlavə qazanc əldə etmək daha səmərəli üsullardandır.

Ümumiyyətlə, bu istiqamətdə aparılan islahatların əsas məqsədi peşə məktəblərinin müasir tələblər səviyyəsində inkişafına nail olmaqdan ibarətdir. Həyata keçirilən pilot layihələrin nəticələrinin digər peşə məktəblərində bir model kimi tətbiq olunması nəzərdə tutulub.

*- Mikayıl müəllim, sonda Sizin fəaliyyət prioritetinizi də bilmək maraqlı olardı: bu gün yeni inkişaf mərhələsinə qədəm qoyan, mütərəqqi islahatlar dövrünün astanasında olan təhsil sistemimizin qarşısında duran əsas məqsəd və vəzifələr nədən ibarətdir?*

- Təhsil sistemi müstəqil Azərbaycanın milli dəyərlərini mənimsəmiş Azərbaycan vətəndaşı formalaşdırmalı, qloballaşan və müasir dünyada rəqabətədavamlı, peşəkar kompetensiyalara və biliklərə malik olan bir insan yetişdirməlidir. Təhsilimiz bir tərəfdən milli olmalı, yəni xalqımızın adət-ənənələrinə sadiq vətəndaşın formalaşdırılmasına xidmət etməli, digər tərəfdən müasir dünyanın olduqca sərt tələblərinə cavab verən yüksək səviyyəli mütəxəssis yetişdirməyə qadir olmalıdır. Əminəm ki, birgə səylə bu məqsədə çatacağıq.

"Azərbaycan" qəzeti,
15 sentyabr 2013-cü il

***Pedaqogika***

# PEDAQOJİ İNNOVASİYALAR PROBLEMİNƏ MÜASİR YANAŞMALAR

**Əjdər Ağayev**
***pedaqoji elmlər doktoru, professor***

***Açar sözlər:*** *pedaqogika, innovasiya, təhsil, elm, yeni pedaqoji texnologiyalar, interaktiv metod, praktika, dərs.*

***Ключевые слова:*** *педагогика, инновация, образование, наука, новые педагогические технологии, интерактивный метод, практика, урок.*

***Key words:*** *pedagogy, innovation, education, science, new teaching technologies, interactive method, practice, lesson.*

İnnovasiya problemi insanın fəaliyyət göstərdiyi bütün sahələrdə diqqəti cəlb edir. Bu gün innovasiya anlayışı daha çox işlənsə də, o, bütün zamanlarda yeniləşmə prosesinin mahiyyətini təşkil etmişdir. Anlayışın bu gün daha aktual olması elmi-texniki tərəqqinin, texnoloji imkanların müqayisəolunmaz dərəcədə artması ilə əlaqədardır.

Yeniləşən cəmiyyətdə yeniləşmənin məzmunca əks olunması və yeniləşmə prosesinə təkan verilməsi, ilk növbədə, təhsillə əlaqədardır. Ona görə də təhsilin özəyini təşkil edən pedaqoji proses yeniləşən cəmiyyətin, müasir elmin və texnoloji tərəqqinin tələblərinə uyğun olaraq qurulmalıdır.

Pedaqoji innovasiyalar problemi öncə təhsilin intibahı ilə bağlıdır. Hələ orta əsrlərdə Şərqdə öyrənmə və öyrətmə prosesində yanaşmaların yeniləşməsinə diqqət yetirilmişdir. Təbii ki, o zaman ərəbdilli elm nümayəndələrinin latın dilində yazılmış əsərlərdə "innovato" sözünə rast gəlmələrinə baxmayaraq, onlar yeni terminləri ərəb dilindən istifadə edərək vermişlər. Hazırkı innovasiyaların rüşeymini məhz orta əsr Şərq elmi və pedaqoji innovasiyaları təşkil edir.

İnnovasiyanın mahiyyəti haqqında, əsasən, vahid fikir olsa da, mövqe müxtəliflikləri olmuşdur. Bu, innovasiyalardan istifadənin yeri, imkanları, metodikası ilə bağlı olmuşdur.

Araşdırmalar göstərir ki, innovasiya anlayışının izahında tədqiqatçılar eyni mənbələrə istinad edirlər. Gəlinmiş nəticəyə görə, innovasiya — yüksək səmərəliliyə malik yeniliyin tətbiqi, insanın intellektual fəaliyyətinin, kəşfinin, ixtirasının son nəticəsidir. İnnovasiya fəaliyyətinin nəticəsi yeni və ya təkmilləşdirilmiş məhsul (iş, xidmət), texnoloji proses, həmçinin ictimai münasibətlərin müxtəlif sahələrində təşkilati-texniki, maliyyə-iqtisadi və digər hallar hesab edilir.

"İnnovasiya" termini latın dilində "innovato" sözündən olub, "yenilənmə" və "yaxşılaşma" deməkdir. Termin elmi tədqiqatlarda XIX əsrlərdə meydana gəlmişdir. "İqtisadi innovasiya" anlayışı XX əsrin əvvəllərində Avstriya iqtisadçısı Yozef Şumpeterin "The Theory of Economic Development" (1934) əsərindən geniş ictimaiyyətə daxil olmuşdur (2).

İnnovasiya təhsilin və elmin bütün istiqamətlərində və sahələrində tətbiq olu-

nur. Belə ki, ümumtəhsil, orta ixtisas təhsili, ali təhsil, texniki-peşə təhsili, ixtisasartırma təhsili və digər təhsil istiqamət və sahələrində geniş yer tutur.

Elmi-tədqiqat işlərində, həm fundamental tədqiqatlarda, həm də tətbiqi tədqiqatlarda elmi nəticənin səmərəliliyini və müasirliyini təmin etmək üçün innovasiyalardan istifadə edilir.

İnnovasiyalardan istifadənin metodikasına bələdlik innovativ-nəzəri məlumatların daha səmərəli tətbiqinə imkan verir. Bəlli olduğu kimi, xarici ədəbiyyatda öz əksini tapan yanaşmalar Azərbaycanda da əsas götürülür. İnnovasiyaların mərhələləri onun səmərəli nəticəyəqədərki keçilən yolunu əhatə edir. Mövcud ədəbiyyatda təqdim olunan mərhələlər yığcam şəkildə belə ifadə edilir:

İşləmələr. Bu, həmin yeni ideyanın maddi təzahür formasını hazırlamaq deməkdir.

Lahiyələşdirmə. Bu mərhələdə yeni qurğunun, cihazın, maşının və s. texnologiyanın texniki dildə təsviri həyata keçirilir (rəsmxət, düsturlar, hesablamalar, iqtisadi səmərəlilik və s.)

Yeni məlumat və ya texnologiyanın yaradılması, inşa edilməsi;

Yeni məlumatın sınaqdan keçirilib mənimsənilməsi;

Praktiki, kütləvi, davamlı istehsal (2).

Göründüyü kimi, innovasiyalar, ilk növbədə, istehsalda, iqtisadi proseslərdə öz əksini tapmışdır. İrəlidə qeyd etdiyimiz kimi, təsərrüfatın bütün sahələrində innovasiya mahiyyətcə eyni məqsədə xidmət edir, lakin hər bir təsərrüfat sahəsinin məzmunu və formasına uyğun olaraq müvafiq innovasiyalardan istifadə edilir.

Yığcam şəkildə qeyd etdiklərimdən mövzunun təkcə təhsil sahəsi, pedaqoji proses üçün deyil, təsərrüfatın bütün sahələri üçün aktual olduğu meydana çıxır.

Bu məqalədə əsas məqsəd pedaqoji innovasiyalar probleminə yanaşmaları müəyyənləşdirmək, innovativliyi təmin etmək üçün fəal təlim metodlarından istifadəni və məktəb təcrübəsini meydana çıxarmaqdır.

Məqalə hazırlanarkən elmi-pedaqoji ədəbiyyatdan, internet materiallarından istifadə edilmiş və onların müqayisəli təhlili verilmişdir. Eyni zamanda, məqsədəuyğun olaraq bir neçə dərs nümunələri müşahidə edilmiş, öyrənilmiş və praktik nəticə olaraq təqdim edilmişdir.

Pedaqoji innovasiyaların, girişdə qeyd etdiyim kimi, mahiyyəti və məzmunu haqqında nəzəri olmasa da, müəyyən təsəvvür vardır. Bu məlumatlar, əsasən, xarici ədəbiyyatdan, internetdən alınır.

Cəmiyyət inkişaf etdikcə, hər sahədə olduğu kimi, pedaqoji sahədə də yeni-yeni tələblər irəli sürülür. Bu isə pedaqoji prosesi təkmilləşdirməyi, yeni məzmun, forma və metodları tətbiq etməyi zəruri edir.

Pedaqoji sistemin təkmilləşdirilməsi iki yolla həyata keçirilir: a) intensiv yol; b) ekstensiv yol. İntensiv yol pedaqoji sistemin daxili ehtiyatlarını işə salmaqla bağlıdır. Ekstensiv yol pedaqoji prosesə əlavə qüvvə, vaxt və vəsait cəlb olunmasını nəzərdə tutur. Məsələn, gənc nəslə daha möhkəm bilik vermək üçün təlim müddətini uzatmaq, proqramları genişləndirmək olar. Bu, ekstensiv yoldur. Halbuki bunsuz da həmin məqsədə çatmaq olar. Məsələn, yeni metodlar tətbiq etməklə, mövcud forma və məzmunu təkmilləşdirməklə, şagirdlərə müstəqil iş bacarıqları aşılamaqla, onları özünütəhsilə cəlb etmək mümkündür. Bu, intensiv yoldur.

Pedaqoji prosesdə yeniliklərin miqyası müxtəlif ola bilər: müəyyən bir metodu, formanı təkmilləşdirmək, yeni iş texnologiyaları tətbiq etmək, yaxud təhsil-tərbiyə sistemini yeniləşdirmək və s.

Respublikamızda hazırda təhsil sahə-

sində islahatlar aparılır, təhsilin maddi bazasında, təhsil və tərbiyə işinin məzmununda, metodikasında, müəllim-şagird münasibətlərində, idarəetmədə böyük dəyişikliklər baş verir.

Pedaqoji sistemdə yeniliklərin əsas istiqamətləri aşağıdakılardan ibarətdir:

- məktəbin demokratikləşdirilməsi;
- pedaqoji prosesin humanistləşdirilməsi;
- əməkdaşlıq pedaqogikasının tətbiqi;
- təhsil və tərbiyə işinin məzmununun genişlənməsi;
- təlim-tərbiyə prosesinin optimallaşdırılması;
- yeni pedaqoji texnologiyaların tətbiqi;
- məktəbin idarə edilməsi sisteminin təkmilləşdirilməsi;
- ixtisasartırma sisteminin yenidən qurulması;
- təhsilin dünya standartlarına uyğun qurulması və s. (3).

Təlim – öyrənmə və öyrətmə, bilik, bacarıq və vərdişlərə yiyələnmə və yiyələndirmədən ibarət min illər boyu mövcud olan tarixi dialektik prosesdir. Təhsillənmə təhsil sisteminin bütün pillə və mərhələlərində pedaqoji prosesdə həmişə həyata keçirilmiş, nəticədə insanın fəal mövqeyini təmin edən inkişaf əldə olunmuşdur.

Qədim dövrdən bu günə qədər öyrətmənin məqsədi, vəzifəsi, mahiyyəti, məzmunu, prinsipləri, metodları, öyrənmənin formaları, yolları və s. haqqında nəzəri fikir və ideyalar irəli sürülmüş, praktik təlim-tədris işləri ümumiləşdirilmiş, yayılmışdır. Cəmiyyətin inkişafı, sosial-ictimai, mənəvi-mədəni tələblər, elmi-texniki tərəqqi, iqtisadi münasibətlərin yeniləşən formaları, dövlətin inkişaf strategiyası kimi mühüm amillər təhsilin məqsədi və vəzifəsini, təlimin məzmununu, metodları və texnologiyasını yeniləşməyə məcbur etmiş, innovasiyalar yeni cəmiyyət quruculuğunun fəal amilinə çevrilmişdir. Bu proses xüsusilə hər yeni gələn əsrin başlanğıcından yeni mərhələyə keçid dəyişiklikləri ilə diqqəti cəlb etmişdir. Yeni dövrün yeni təlim nəzəriyyəsi və praktikasını meydana gətirənlər, ilk növbədə, keçilmiş tarixi inkişaf təcrübəsini diqqətlə öyrənmiş, ondan bəhrələnmiş, nəyisə ataraq, nəyisə yeni formada inkişaf etdirərək, bu prosesin mahiyyətini düzgün qavramaqla zəmanəsinin tələblərinə cavab verən təlim-tədris metodikasını müəyyənləşdirmişlər.

Dünyanın ən mütəfəkkir pedaqoqlarından Nəsirəddin Tusi (XII əsr) “Əxlaqi-Nasiri”, Y.A.Komenski (XVIII əsr) “Böyük didaktika”, J.J.Russo (XVIII əsr), K.D.Uşinski (XIX əsr), L.N.Tolstoy (XIX əsr) və başqaları əsərlərində özlərindən əvvəl keçilmiş inkişaf yolunu və bu yolun nailiyyətlərini ümumiləşdirmiş və yeni mərhələ yaradan öz konsepsiyalarını–təlim-tərbiyə nəzəriyyələrini meydana qoymuşlar...

XXI əsr özünəqədərki bütün əsrlərin inkişaf zirvəsini təşkil etməklə, insanın şəxsiyyət olaraq intellektuallıq səviyyəsini daha da aktuallaşdırdı. Ağlın hökmranlığını, insani hislərin daha fəallığını, ədalətin və demokratiyanın, vətəndaş cəmiyyətinin bərqərar olmasını təhsilin baş məqsədi səviyyəsinə qaldırdı. Çünki elmi-texniki tərəqqi çox yüksək inkişaf səviyyəsinə çataraq, görünməmiş nailiyyətlər əldə etdiyi kimi, insanları fəlakətlərə düçar edən nəticələri də doğurdu. Və fəlakətlərə gəlib çatmamaq üçün insan ağlının və insanilik duyğusunun fəallaşdırılması, özünüdərk və özünüqiymətləndirmənin yüksəldilməsi, fəaliyyətin, münasibətlərin dəyərləndirilməsi, vətəndaşlıq missiyasının gücləndirilməsi və s. kimi qlobal vəzifələr meydana çıxdı. Bu vəzifələri yerinə yetirmək üçün forma və metodlar yarandı. Yeni təlim metodları və iş formaları ilə əqli nəticələrdə mühüm rol oynayan tən-

qidi təfəkkürün, müstəqil fikri fəaliyyətin və əməli işlərin inkişaf etdirilməsi ön plana keçdi...

Hazırda, digər inkişaf etmiş ölkələrdə olduğu kimi, Azərbaycanda da innovasiyalardan istifadəyə geniş yer verilir və bu barədə çox danışılır, yazılır. Bunlar yaxşıdır. Lakin bu yenilikçi işlərə qərb ölkələrindəki təcrübənin təqlidi və ya köçürülməsi açıq-aydın hiss olunur. İnnovasiyaların – yeni təlim metod və texnologiyalarının nə sosioloji-fəlsəfi, nə də pedaqoji-psixoloji əsasları – nəzəri baxışlar, fikir və ideyalar, başqa sözlə desək, metodologiyası haqqında əhəmiyyətli fikir deyilmir. Yəni təlimin məqsədi və prinsipləri açıqlanmır. Sadəcə olaraq, ən yaxşı halda pedaqoji terminologiyaya yeni daxil olan anlayışlar yığcam izah edilir və yeni metodlar haqqında xarici ədəbiyyatdan əldə edilmiş məlumatlar sadalanır. Bunlar isə çox halda hamı tərəfindən eyni yüksək səviyyədə qavranılmır və hətta bir çoxları tərəfindən qəbul edilmir. Çünki ötürülən bu məlumatlarda qərb cəmiyyətinin, qərb insanının ruhu vardır. O insanın ki, onu Şərq günəşi isitməyib, Muğan, Şirvan, Mil torpaqları yetirməyib, 11 iqlim qurşağından 9-u əvəzinə 3-4-nü hiss edib, Şərq elmi və müdrikliyindən irsən faydalanmayıb və s. Ona görə maraqlı, faydalı qərb iş təcrübəsi milli-müasir təcrübə ilə qovuşaraq, milli zəminə uyğun olaraq əxz olunmalıdır ki, həm milliləşsin, həm də kütləviləşsin. Buna görə də Azərbaycan təhsil tarixini, xüsusilə təlim metod və texnologiyalarını bilmək, öyrənmək zərurəti meydana çıxır. Məhz bu məqsədlə biz təhsil tariximizdən bu gün də əhəmiyyətini itirməyən müəyyən məsələlərə aydınlıq gətirməyi məqsəduyğun sayırıq. Çünki tarixiliyi, varisliyi və müasirliyi nəzərə almadan hər hansı inkişafın problemlərini daha düzgün müəyyənləşdirmək və həll etmək mümkün deyildir (1).

İnnovasiyalar orta əsrlərdə, əsasən, təlim texnologiyalarının təkmilləşməsində tətbiq edilmişdir. Təlim metodları, təlim prosesinin təşkili, təhsilin məqsədi və mahiyyəti cəmiyyətin inkişaf səviyyəsinə uyğun olaraq yeniləşmə prosesi keçirmişdir. Rəsm, riyaziyyat, mexanika, astronomiya və digər yer və göy cisimlərini öyrənən elmlərdə innovasiya, təbii ki, texniki tərəqqi nailiyyətləri ilə müşayiət olunmuşdur. Hər halda həm tarixi-nəzəri baxışda, həm də müasir baxışda innovasiyalar başlıca olaraq təlim texnologiyalarının tətbiqində istifadəyə məruz qalmışdır.

Müasir dövrümüzdə də təlim-tərbiyə işinin əsas vəzifələrindən biri insanların yüksək, müstəqil düşüncə və fikir sahibi olmalarına, söz və əməl birliyinə riayət etmələrinə nail olmaqdır və bunun üçün müxtəlif təlim-tərbiyə metodlarından, texnologiyalarından istifadə etməkdir.

Deməli, müasirlərimiz olan gənclərdə məntiqi, tənqidi, yaradıcı təfəkkürü, ünsiyyət mədəniyyətini formalaşdırmaq, onları praktik fəaliyyətə real olaraq hazırlamaq üçün istifadə etdiyimiz yeni metodların məqsədini klassik pedaqoji irsimizə söykənərək cilalamalı və bununla kamil insanın, fəal vətəndaşın yetişməsinə şərait yaratmalıyıq.

Təbii ki, XIX və XX əsrlərdə təhsil, təlim təcrübəsi cəmiyyətin, elmi-texniki nailiyyətlərin yeni inkişaf səviyyəsinə uyğun olaraq qurulmuş, bütün dünyada, xüsusilə Qərbdə yeni nəzəriyyələr və təcrübələr meydana çıxmışdır. XXI əsrdə qloballaşmanın tələbinə uyğun olaraq hər hansı ölkədə olan qabaqcıl təcrübə dünyanın digər ölkələri tərəfindən öyrənilir, özününküləşdirilir, tətbiq olunur. Belə tendensiya Azərbaycanda da mövcuddur.

Pedaqoji innovasiyaların tətbiqi prinsiplərinin nəzərə alınması pedaqoji prosesin yeni dövrün tələblərinə uyğun olaraq nəticələnməsinə kömək edir.

Fikrimcə, pedaqoji innovasiyaların

tətbiqinin qeyd etdiyim bir neçə prinsipinin nəzərə alınması daha kütləvi olaraq istifadə oluna bilər: innovasiyanın tətbiq modelinin tapılması və ondan səmərəli istifadə edilməsi prinsipi; müəllimin innovasiyalara bələdliyi prinsipi; innovasiyadan pedaqoji prosesdə məqsədəuyğun olaraq istifadə edilməsi; təlim prosesində innovasiyadan istifadənin tərbiyəvi məqsədlərə yönəldilməsi; tərbiyə prosesində innovasiyadan istifadənin bilikləri dərinləşdirmə istiqamətinə yönəldilməsi; yeni təlim modellərinin hazırlanmasına innovasiyadan istifadənin təsiri prinsipi; təlim metod və texnologiyalarından istifadə zamanı innovativ yanaşmanın dəqiq müəyyənləşdirilməsi prinsipi;

Pedaqoji prosesdə meydana çıxan qanunauyğunluqlar, ziddiyyətlər, nüanslar və bunların həlli zamanı innovasiyalardan istifadə edilməsi müəllimin qarşıya qoyduğu problemi həll etməsinə xeyli kömək edə bilər.

Tədqiqatçılar arasında prinsiplərə münasibət müxtəlif ola bilər. Çünki innovasiyadan istifadə sinfin (auditoriyanın) səviyyəsindən və müəllimin biliyi və metodik ustalığından xeyli dərəcədə asılıdır. Ona görə də hər kəs öz anlamına və təcrübəsinə uyğun olaraq prinsiplər müəyyənləşdirə və nəzərə ala bilər.

Görkəmli Azərbaycan pedaqoqları və təhsil xadimləri Əhməd Seyidovun, Mehdi Mehdizadənin, Mərdan Muradxanovun, Yusif Talıbovun, Zahid Qaralovun, Yəhya Kərimovun, Bəşir Əhmədovun pedaqoji irsini bilməyən kəs Azərbaycan milli təhsilinin elmi şərhinə girişə bilməz. Çünki XX əsr Azərbaycan təhsil təcrübəsi və nəzəri baxışları, praktik metodik reallıqları, milli-pedaqoji problemlərinin həlli onların ardıcılları olan digər milli pedaqoq alimlərin əsərlərində, tədqiqatlarında öz əksini tapmış və minlərlə praktik müəllimin malı olmuşdur. Nəticədə zəngin milli təhsil təcrübəsi və pedaqoji elmlər formalaşmışdır.

Yaradılmış milli pedaqoji irsə bələdlik onun müasir inkişafının, yeniləşmə tendensiyasının da düzgün qavranılmasını təmin edir. Çünki təhsil sosial həyatın xüsusi sahəsi olaraq konkret milli sosial, iqtisadi, mənəvi dəyərlərə söykənir. Təhsilin gücü və təsir dairəsi onun bütün bunları bilən peşəkar kadrlar tərəfindən həyata keçirilməsindədir.

Təlimin fəal metodları dedikdə, öyrənənlərin məlumatlanmasını, idrak müstəqilliyini, fikri fəallığını, yaradıcılığını artıran metodlar nəzərdə tutulur.

İnter ['intæ] – ara (insanlararası), qarşılıq (insanların qarşılıqlı anlaşması, əməkdaşlığı, işi və s.) kimi başa düşülür. Metod olaraq interaktivlik təlim prosesində müəllim və şagird arasında işin gedişindən – mövzudan, şərhdən, dialoqdan, rollu oyundan həmin anda meydana çıxan yanaşma, izah, dialoq və s. dir. Yəni tərz irəlicədən planlaşdırılmır, işin – təlim prosesinin gedişi bu məqamı ortaya çıxarır və daha çox şagirdin müstəqilliyi, müdaxiləsi ilə baş verir. Digər tərəfdən, interaktivlik şagirdlərin özləri arasında da ola bilir. Əsas cəhət odur ki, bu prosesdə əməkdaşlıq edən öyrənənlər və öyrədən eynihüquqlu mövqedə dayanırlar. Təbii ki, müəllim öyrədən olaraq təşkilatçılıq, koordinator, məsləhətçi, fasilitator funksiyasını yerinə yetirir: şagirdlərin işlərinə müdaxilə etmədən problemləri qoyur, istiqamət verir, nəzarət edir, axtarış strategiyasını hazırlamağa kömək edir, amma təlim tapşırıqları üzərində uşaqlar özləri birlikdə - öz aralarında mübahisə edərək, diskussiya apararaq işləyirlər (1).

Beləliklə, istər interaktiv, istərsə də fəal adlanan metodların müəyyənləşdirilməsi və tətbiqi müəllimin məharətindən və peşəkarlıq səviyyəsindən, nəzəri və praktik hazırlığından asılıdır. Müəllim interaktiv metodlar sırasına özünün təcrübədən hasil etdiyi metodları daxil edə bilər.

İnteraktiv metodlar sırasına daxildir: rollu oyun, debatlar, söz assosiasiyaları, əqli hücum, kiçik qruplarda iş, ideyalar xalısı, qərarlar ağacı, təqdimat (prezentasiya), sənədlərlə iş, vəziyyət üzrə praktikum, sosioloji tədqiqat, diskussiya, hərə digərini öyrədir, fikrən gəzinti, mozaika, mediasiya, danışıqlar, problemin həlli, mövqe tutur və s.

Bu adların verilməsi nəzəri ideyadan deyil, praktikadan – təlim təcrübəsindən irəli gəlmişdir. Əgər hər hansı işini mükəmməl bilən, yaradıcı işləyən müəllim öz təcrübəsində şagirdlərarası fəallaşdırmanı təmin edən hansı metodusa işləyib, tətbiq edərsə, özü də onun adını verə bilər (1).

Nümunə üçün bəzi yenilikçi müəllimlər tərəfindən tətbiq edilməyə başlanılan innovativ-interaktiv metodlara diqqət yetirək.

İsmayıllı şəhər E.Məmmədov adına 3 nömrəli tam orta məktəbin Ana dili və ədəbiyyat müəllimi Muradlı Çingiz Məzahir oğlunun VI sinifdə Ana dili fənni üzrə dərs nümunəsini nəzərdən keçirək.

Standart: 4.1 3.1. Alt standart: 4.1.2.; 4.1.4.; 3.1.2.

Mövzu: Felin lüğəvi məna növləri

Təlim nəticələri:

✓ Fikir və mülahizələrini əsaslandırır, məlumatlarını fakt və hadisələr əsasında zənginləşdirir.

✓ Ümumi qrammatik mənasına görə sözləri fərqləndirir.

✓ Nitq hissələrinin yazılışı və durğu işarələrindən istifadə qaydalarına əməl edir




İnteqrasiya: Ədəbiyyat.

Üsullar: Əqli hücum, anlayışın çıxarılması

İş forması: Böyük qruplarla iş, kiçik qruplarla iş

Resurslar: iş vərəqləri, A4 vərəqləri, FlipChart vərəqləri, marker, yapışqanlı lent (skoç), bir sıra ədəbi nümunələr yazılmış vərəqlər, dərslik.

DƏRSİN GEDİŞİ

I mərhələ - Motivasiya, problemin qoyuluşu.

Dərsin əvvəlində “əqli hücum” üsulundan və “anlayışın çıxarılması” texnikasından istifadə edərək aşağıdakı kimi motivasiya yaradıram.

Şagirdlərin fərziyyələrini dinləyib, FlipChart vərəqlərində qeydlər aparıram. Sonda şagirdlərdən doğru cavabı – Fel cavabını alandan sonra tədqiqat sualı ilə sinfə müraciət edirəm.

Tədqiqat sualı: “Nə et?” sualına cavab verən fellər bir-birindən hansı xüsusiyyətlərinə görə fərqlənir?

II mərhələ - Tədqiqatın aparılması.

Şagirdləri 1, 2, 3 saydırmaqla üç qrupa bölürəm və hər bir qrupa iş vərəqləri paylayıram.

III mərhələ - Məlumat mübadiləsi

Qrupun üzvləri tərəfindən seçilmiş liderlər qrup işlərinin təqdimatını keçirirlər. İş vərəqləri – təqdimatlar lövhədən asılır.

IV mərhələ - Məlumatların müzakirəsi və təşkili

➢ Tapşırıqlara əsasən qruplaşdırdığınız fellər felin hansı məna növləri idi?

➢ Felin neçə məna növü olduğunu öyrəndiniz?

➢ Fellər niyə lüğəvi məna növlərinə bölünür?

➢ Fellərin lüğəvi mənalarını tanımasaq, onları bir-birindən fərqləndirə bilməsək nə olar?

V mərhələ - Nəticə və ümumiləşdirmə

Şagirdlərin diqqətini yenidən tədqiqat sualına yönəldərək qeyd edirəm ki, bütün fellər "Nə et?" (və ya Nə ol?) sualına cavab versələr də, amma onlar bir-birindən fərqlənirlər. Belə ki elə fellər var ki, onları gözlə görmək mümkün olduğu halda, məsələn: qaçmaq, uçmaq, kəsmək və s., bəzi felləri yalnız təsəvvür əsasında dərk edirik, məsələn: fikirləşmək, anlamaq, sevinmək, ağarmaq və s. Məhz bu cür xüsusiyyətlər felin lüğəvi məna növləri anlayışını formalaşdırır və felləri 5 lüğəvi məna növləri olaraq qruplaşdırmağa əsas verir.

VI mərhələ - Yaradıcı tətbiq etmə

Felin lüğəvi məna növlərindən istifadə etməklə "Mən oxudum, mən öyrəndim, mən yaratdım" mövzuzunda 5-7 cümləlik kiçik, bədii, rabitəli mətn qurun.

VII mərhələ - Qiymətləndirmə

Qiymətləndirməni dərs boyu müşahidələrim əsasında, qrupları əvvəlcədən hazırladığım meyarlara əsasən aparıram.

Digər bir nümunə.

Qobustan rayonundakı A.O.Çernyayevski adına şəhər 1 nömrəli tam orta məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimi Musasoltan Eyyublunun dərsinə nəzər yetirək.

Vizual Dərs nümunəsi

V sinif "Ədəbiyyat"

Mövzu: M.Hüseynin "Odlu qılınc" hekayəsinin təhlili

Standartlar:

1.2. Ədəbi əsərlərin təhlili üzrə bacarıqlar nümayiş etdirir.

1.2.4. Ədəbi yazı nümunələrinin (nağıl, təmsil, hekayə) mövzu və ideyasını izah edir.

Təlim nəticələri:

a) Hekayənin ideyasının və bədii xüsusiyyətlərinin mənimsənilməsi;

b) Vətənpərvərlik hissinin daha da gücləndirilməsi;

c) Tənqidi və yaradıcı təfəkkürün inkişaf etdirilməsi.

İş forması:

Qrupla iş, bütün siniflə birgə iş

Üsul:

Beyin həmləsi, karusel, anlayışın çıxarılması, diskussiya

Resurs:

Dərslik, iş vərəqləri, el qəhrəmanlarının şəkilləri

İnteqrasiya:

Tarix

Dərsin gedişi:

Motivasiya

Hekayə nə üçün "Odlu qılınc" adlanır? Şagirdlər müxtəlif versiyalar söyləyirlər. Qılınc döyüş rəmzidir. Yurdumuzun şanlı qəhrəmanlıq tarixindən söz açır. Aydın olur ki, tarix boyu düşmənlərin gözü torpaqlarımızda olub. Lakin Tomrisin qeyrəti, Cavanşirin uzaqgörən siyasəti, Babəkin vuran qolu, Koroğlunun misri qılıncı, Nəbinin aynalı tüfəngi, Mehdinin sərrast atəşi nəticəsində düşmənlərimiz öz cavablarını almışlar. Şagirdlər belə qənaətə gəlirlər ki, babalarımızın bizə miras qoyduğu müqəddəs torpaqlarımızı göz bəbəyimiz kimi qorumalıyıq. "Torpaq, əgər uğrunda ölən varsa, vətəndir!" "Torpaqdan pay olmaz".

Tədqiqat sualı:

"Odlu qılınc" nəyin rəmzidir?

Tədqiqatın aparılması:

Şagirdlər 4 qrupa bölünür. Qruplara ad verilir:

1) "Babək", 2) "Cavanşir", 3) "Koroğlu", 4) "Tomris"

Qruplara iş vərəqi paylanır.

Məlumat mübadiləsi:

Hər qrup öz tapşırığının nəticəsini təqdim edir. Məlum olur ki, qrupların işində bəzi tamamlanmamış fikirlər, mülahizələr var. Bu çatışmazlığı aradan qaldırmaq üçün qruplar arasında sorğu aparılır.

Məlumat müzakirəsi:

Müzakirə üçün istiqamətləndirici sual-

lardan istifadə olunur:

1. Hekayənin ideyası nədir?
2. Nə üçün torpaqdan pay olmaz?
3. "Odlu qılınc" nəyin rəmzidir?
4. Qoca Varaz nə üçün "Bu ölkə heç vaxt məğlub olmayacaq" deyir.
5. Hekayədəki ideya bu günlə necə səsləşir?
6. "Biz torpaqlarımıza qayıdacağıq" fikrinə münasibətiniz.

Nəticənin çıxarılması:

Bu mərhələdə bütün deyilənlərin səmərəli yekununa çalışılır. Şagirdlər öz düşüncələrini, axtarışlarını davam etdirirlər. Sonda şagirdlər əsərin ideyası ilə bağlı əldə etdikləri nəticələri bildirirlər:

Azərbaycan aslanlar yurdudur.

Vətənin hər qarış torpağını göz bəbəyi kimi qorumalıyıq.

Torpaqdan pay olmaz.

Torpaq, əgər uğrunda ölən varsa vətəndir.

Vətənin şərəfi bizim şərəfimizdir.

Yaradıcı tətbiqetmə:

Şagirdlərə mövzuya uyğun olaraq test tapşırıqları verirəm.

Ev tapşırığı:

Səhifə 176. Mövzunu öyrənmək.

Qiymətləndirmə (4).

Həqiqət naminə qeyd etməliyik ki, ötən əsrlərdə Azərbaycan məktəbinin qabaqcıl təcrübəsində fəal metodlardan istifadəyə yer verilsə də, interaktivliyə - şagirdlərarası əməkdaşlığa və müəllim-şagird əməkdaşlığına bu qədər geniş və çevik yanaşılmırdı, şagirdlər fundamental biliklərlə yüklənirdilər, sərbəst, müstəqil fikir və düşüncəyə yiyələnə bilmirdilər.

Cəmi ikicə dərs nümunəsindən innovasiyadan istifadənin təlim prosesinə nə qədər güclü təsir göstərdiyi bəlli olur. İnnovativ yanaşmalar çoxaldıqca tədrisin keyfiyyət səviyyəsi də yüksəlir. Belə ki, qarşıya qoyulan hədəflərə çatma asanlaşır, öyrənənlərin fəallığı və müstəqilliyi inkişaf edir, sərbəst düşüncə formalaşdırılır.

**İstifadə edilmiş ədəbiyyat**

1. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006
2. http://az.wikipedia.org/wiki/İnnovasiya
3. http://kayzen.az/blog/451/pedaqoji-prosesin-yeniləşməsi-innovasiyalar.html
4. "Təhsil və zaman" qəzeti. 2012-ci il sayları.

**Э.Агаев**

**Современные подходы к проблеме педагогических инноваций**

**Резюме**

В статье говорится о проблеме педагогических инноваций в обновленном обществе. Автор комментировал интерактивные методы, основные их направления,масштаб новостей педагогического процесса, предложил некоторые примеры уроков.

**A.Agayev**

**Modern approaches to pedagogical innovation**

**Summary**

In this article it is spoken about the problems of pedagogical innovation in the renewing society. The author comments the scale of innovations, their directions, interactive methods sand gives some lesson examples.

***Psixologiya***

# YENİ PEDAQOJİ TƏFƏKKÜR KONSEPSİYASI HAQQINDA

**Əbdül Əlizadə**
***psixologiya elmləri doktoru, professor***

***Açar sözlər:*** *pedaqoji təfəkkür, müasir dərs, ənənəvi didaktik sistem.*
***Ключевые слова:*** *педагогическое мышление, современный урок, традиционная дидактическая система.*
***Key words:*** *pedagogical thinking, modern lesson, traditional deductive system.*

I. ...XX əsrin 80-ci illərində yeni pedaqoji təfəkkür artıq sistemli psixopedaqoji konsepsiya kimi formalaşmağa başladı. İllərin sorağında hafizə laylası ilə uyuşmuş məktəbin üfüqləri təfəkkür və təxəyyül şüaları ilə bəzəndi. Şagirdə, müəllimə, təhsilə, məktəbə əsrin köklü paradiqmaları ilə yeni münasibət formalaşdı...

Cəmiyyətin inkişafının hər bir mərhələsində özünəməxsus pedaqoji təfəkkür formalaşır və bu pedaqoji təfəkkür təkcə uşaqların təlim-tərbiyəsi barəsində cəmiyyətin pedaqoji dəyərlərini deyil, həm də bəlkə də, ilk növbədə, fəlsəfi-psixoloji dəyərlərini əks etdirir. Cəmiyyət inkişaf etdikcə onun təhsil siyasətində də yeni cəhətlər meydana çıxır, pedaqoji nəzəriyyədə əvvəllər bərqərar olmuş stereotiplər tədricən köhnəlir, onların köhnəldiyi dərk olunanda artıq yeni pedaqoji təfəkkür formalaşmağa başlayır.

Əvvəlki dövrlərdə yeni pedaqoji təfəkkürün formalaşmasında həmişə pedaqoqlar önəmli rol oynayıblar. XX yüzillikdə isə pedaqoji təfəkkürün inkişafında psixologiyanın əhəmiyyəti xüsusilə artıb. Elmi-texniki inqilab şəraitində psixologiya elminin böyük uğurları yeni pedaqoji təfəkkürün formalaşmasında həlledici rol oynayıb.

Yeni pedaqoji təfəkkür şagirdin bir şəxsiyyət kimi formalaşdırılmasını təhsil sisteminin başlıca vəzifəsi sayır. Bu köklü vəzifənin həyata keçirilməsi üçün təhsil humanistləşdirilməli və humanitarlaşdırılmalı, təlim inkişafetdirici və tərbiyəedici olmalıdır.

Yeni pedaqoji təfəkkürün özgür paradiqmaları əsasında yeni pedaqoji texnologiyanın əmələ gəlməsilə nəinki fənlərin tədrisi metodikasının, həm də tərbiyə metodikasının inkişafında yeni mərhələ başlayır.

Yeni pedaqoji təfəkkür təhsil nəzəriyyəsi və təcrübəsinin inkişafında önəmli vəsilə kimi meydana çıxmışdır. Müasir məktəb ancaq bu yolla inkişaf edə bilər və etməlidir. Onun mahiyyətcə başqa alternativi yoxdur.

Yeni pedaqoji təfəkkür klassik pedaqogikanın deyil, “köhnə” pedaqoji təfəkkürün - durğunluq illəri pedaqogikasının və ya ənənəvi didaktikanın alternativi kimi bərqərar olmuşdur. Klassik pedaqogika yeni pedaqoji təfəkkürün əsas qaynaqlarından birini təşkil edir. Yenilikçi alimlər və müəllimlər klassik pedaqogikanı müasir ölçülərlə oxuyur, onun zamanla səsləşən işıqlı ideyalarına arxalanırlar.

Çoxcəhətli elmi axtarışlar, xüsusilə

təhsilin sosiologiyası, yaş və pedaqoji psixologiya, məktəbəqədər və məktəb pedaqogikası sahələrində aparılan maraqlı tədqiqatlar, qabaqcıl müəllimlərin bənzərsiz eksperimentləri yeni pedaqoji təfəkkürün köklü qaynaqları olub.

Yeni pedaqoji təfəkkürün inkişafında şərti surətdə iki mərhələni fərqləndirmək olar. Birinci mərhələdə ənənəvi didaktik sistemin elmi-tənqidi təhlili axarında dərsin optimallaşdırılması başlıca psixoloji və pedaqoji problem kimi xüsusi əhəmiyyət kəsb edirdi. Ənənəvi dərsin alternativi kimi müasir dərs anlamı da bu mərhələdə yaranmışdı.

Müasir dərs haqqında təsəvvürlərin formalaşması yeni pedaqoji təfəkkürün bərqərar olmasında həlledici əhəmiyyətə malik olmuşdur. Onun başlıca ölçüləri öz əksini, ilk növbədə, müasir dərs konsepsiyasında tapır.

K.D.Uşinski təxminən 100 il bundan əvvəl qətiyyətlə göstərmişdi ki, müəllim informator, biliklərin translaytoru olmamalıdır, şagirdlərdə yeni bilikləri müstəqil mənimsəmək qabiliyyəti tərbiyə etməlidir. Nə qədər təəccüblü olsa da müasir təhsil nəzəriyyəsi müxtəlif axtarışlar rolunda məhz bu fundamental paradiqmalara gəlib çıxmışdır.

Yeni pedaqoji təfəkkür çağdaş psixologiya və pedaqogikanın uğurlarına arxalanır, yeni (müasir) pedaqoji texnologiyalara xüsusi əhəmiyyət verir.

60-70-ci illərdə müasir dərs uğrunda mübarizə yeni pedaqoji təfəkkür uğrunda mübarizə idi. Köhnə üsullarla işləyən adi müəllimlər hələ öz iş təcrübələrində ənənəvi pedaqoji sistemə söykənsələr də, tanınmış psixoloq və pedaqoqlarımızla bir cərgədə qabaqcıl müəllimlərimiz də artıq bu vüsətli mübarizəyə qoşulmuşdular.

Müasir dərs konsepsiyasının müxtəlif yönümlərdə təhlili axarında yeni problemlər əmələ gəlirdi. Bir həqiqət artıq bütün aydınlığı ilə dərk olunurdu: təhsilin nəzəri-metodoloji paradiqmalarını dövrün ölçüləri ilə yenidən qurmadan öz-özlüyündə dərsin müasirləşdirilməsi istənilən effekti vermir və verə də bilməzdi.

Yeni pedaqoji təfəkkürün inkişafında mahiyyətcə yeni (ikinci) mərhələ əmələ gəldi. Müasir təhsil konsepsiyasının yayılması və müasir dərs konsepsiyasının məhz bu konsepsiya kökündə işlənilməsi ikinci mərhələnin ana xəttini təşkil edirdi. Hətta birinci mərhələdə xüsusi aktuallıq kəsb edən anlamlar (məsələn, şagirdlərin idrak fəalliyyətinin aktivləşdirilməsi və s.) ikinci mərhələdə yeni mənalarda səslənirdi. Şagirdlərdə nəzəri təfəkkürün və təxəyyülün inkişafı önəmli məsələ kimi meydana çıxır və şəxsiyyət baxımından dəyərləndirilirdi. Tərbiyə anlamı mahiyyətcə yeni məzmun kəsb edirdi.

İdeoloji maneələr aradan qalxdıqca müasir təhsil konsepsiyası dünya psixologiyası və pedaqogikasının uğurları ilə daha da zənginləşirdi. Bu gün yeni pedaqoji təfəkkür inkişaf edərək zamanın təhsil konsepsiyasına çevrilmişdir.

Yeni pedaqoji təfəkkürün formalaşması təkcə psixoloji-pedaqoji hadisə deyil, bəlkə də, ilk növbədə, böyük əhəmiyyətə malik olan ictimai-siyasi hadisədir.

Təhsilin fəlsəfi problemlərini araşdıran mütəxəssislər bu köklü məsələni tarixi faktlarla açıqlayırlar. Onlar göstərirlər ki, maarifin başlandığı gündən bir çox Qərb ölkələri dəfələrlə böhranlı situasiyaya düşmüşlər və ondan çıxmaq üçün təhsildən yaxşı vasitə tapmamışlar. Böyük fransız inqilabından sonra belə olmuşdur. İkinci Dünya müharibəsindən sonra ABŞ da, Almaniya da, Yaponiya da bu yolla, daha dəqiq desək, təhsil sahəsində köklü islahatlar keçirmək yolu ilə getmişlər.

İslahatlaşdırılmış təhsil! Fəlsəfi ədəbiyyatda islahatlaşdırılmış təhsil zamanın nəbzini düzgün tutan, gələcək inkişafı qa-

baqlayan, köhnəlik və mühafizəkarlıq buxovlarından azad olan və bununla da köhnə ilə yeni arasındakı uçurumu kataklizmlərsiz dəf etməyə kömək edən təhsil kimi səciyyələndirilir. Mütəxəssislərin fikrincə, böyüyən nəslə biliklərin verilməsinin ənənəvi formalarını inadkarlıqla qoruyub saxlayan ölkələr vətəndaşlarda sosial böhranlarla zəngin olan qeyri-adekvat sivilizasiya sindromunun əmələ gəlməsi üçün zəmin yaradırlar. Bu ölkələrin özləri isə... tarixin dramında ikinci yerə gəlib düşürlər.

N.S.Yulina məsələnin mahiyyətini sosial-tarixi yönündə açıqlayaraq göstərir ki, bu gün bəşəriyyət olduqca müxtəlif böhranların - ekoloji, informasiya, demoqrafik, milli və b. böhranların artması ilə üzləşmişdir. Və o, şüurlu sürətdə təhsilin qabaqlayıcı adaptasiya imkanlarına müraciət edir. Təsadüfi deyildir ki, YUNESKO XXI yüzilliyi artıq "Təhsil əsri" elan etmişdir. Dünyanın müxtəlif ölkələrində 25 ildən çoxdur ki, pedaqogika nəzəriyyəçiləri adamları dəyişən dünyaya hazırlamaq üçün, Alfin Tofflerin sözləri ilə desək, yeni nəslin gələcəyə "yumşaq enməsi" naminə "XXI əsr üçün təhsil" ideyası üzərində işləyir, yeni paradiqmalar irəli sürür və onu daha da təkmilləşdirirlər. Yeni pedaqoji təfəkkürün formalaşmasının əhəmiyyəti ancaq bu ölçülərlə dayandırılmalıdır.

Yeni pedaqoji təfəkkürün əsas müddəaları hansılardır? Təhsil nəzəriyyəsi və təcrübəsi üçün onların nə kimi əhəmiyyəti vardır? Bu gün hər bir müəllim bu önəmli məsələlər barəsində nəinki aydın təsəvvürə malik olmalı, həm də, ilk növbədə, təlim - tərbiyə işini zamanın pedaqoji konsepsiyası baxımından köklü surətdə yenidən qurmalıdır.

II. Dərsin müxtəlif tipləri məlum olsa da, ənənəvi didaktik sistemdə ən çox məlumatverici dərs tipindən istifadə olunur. Görünür, bu, məlumatverici dərs tipinin özünün xüsusiyyətləri ilə bağlıdır. Onlar ənənəvi didaktik sistemin əsas prinsiplərini bilavasitə əks etdirir. Ənənəvi pedaqoji sistemdə müəllim üçün məsələ ancaq proqram materiallarının öyrənilməsindən ibarətdir. Şagirdin özü, təlim motivləri isə, V.Okonun sözləri ilə desək, onu, təəssüf ki, narahat etmir.

Bundan başqa, bir məsələni də görünür, nəzərə almaq vacibdir. Məlumatverici dərs tipi müəllimdən onsuz da xüsusi yaradıcılıq səyi tələb etmir. Bu sxemlə dərs deməkdən ötrü şagirdlər üçün (diqqət edin, müəllimlər üçün deyil, məhz şagirdlər üçün) yazılmış dərsliyi sadəcə olaraq oxumaq və danışmaq kifayətdir.

Müəllim ev tapşırıqlarını yoxladıqdan sonra yeni mövzunun şərhinə keçir: "Uşaqlar, bu gün ... mövzunu öyrənəcəyik" və dərsi danışmağa başlayır...

**Haşiyə:** Ənənəvi didaktik sistemdə müəllimi ancaq proqram materialının öyrədilməsi maraqlandırır. Soruşa bilərlər: məgər müasir təhsil konsepsiyası proqram materialının öyrənilməsini nəzərdə tutmur?

Proqram materialının öyrənilməsinə müasir təhsil konsepsiyası da xüsusi məna verir. Yeni pedaqoji təfəkkür baxımından bu, məktəbin önəmli vəzifələrindən biridir. Ancaq müasir təhsil nəzəriyyəsinə görə, proqram materiallarının öyrənilməsinin ənənəvi pedaqoji sistemdə nəzərə alınmayan köklü xüsusiyyətləri, psixologiyanın uğurlarına söykənən yeni pedaqoji texnologiyası var. Müasir təhsil konsepsiyası ilə ənənəvi didaktik sistem, ilk növbədə, bu problemin qoyuluşunda və həllində bir-birindən köklü şəkildə ayrılırlar. Onun mahiyyətini açıqlamaq üçün hələlik iki məsələni nəzərə almaq lazımdır.

Birinci məsələ. Proqram materialının öyrənilməsi məqsəddir, yoxsa vasitədir? Ənənəvi pedaqoji sistemdə proqram materialının mənimsənilməsi məqsəd hesab edilir. Bu önəmli vəzifə, təəssüf ki, çox vaxt

səhv başa düşülür və birtərəfli həll olunur. Hələ 1977-ci ildə müəllimlər üçün çap olunmuş "Dərsin psixoloji əsasları" adlı bir kitabda göstərilirdi ki, müəllimlərin heç də hamısı dərsin məqsədini eyni şəkildə başa düşmür, çünki məktəbin təlim-tərbiyə işi sistemində dərsin rolunu onlar müxtəlif ölçülərlə müəyyən edirlər. Dərsin vəzifələrinin anlaşılması iki suala - "Dərsdə şagirdlərə nəyi öyrətməli?" və "Necə öyrətməli?" suallarına cavab verməyi nəzərdə tutur. Bu məsələlərin həllində iki meyil özünü göstərir. Birinci meyilə görə şagirdin şəxsiyyəti dərsin mərkəzi məsələsidir. Dərsdə müəllimin mümkün qədər çox proqram materialını əhatə etmək, proqramda nəzərdə tutulan daha çox fakt və qaydaları şagirdlərin mənimsəməsinə nail olma niyyəti birinci meyillə bağlıdır. İkinci meyil axarında isə müəllimin niyyəti keyfiyyətcə yeni məzmun kəsb edir: bu zaman, o, şagirdin informasiyanı müstəqil surətdə əldə etmək tələbatını inkişaf etdirmək, özünün iş üsullarını təkmilləşdirmək, şagirdlərə nəzəriyyəni praktika ilə əlaqələndirməyi öyrətmək üçün proqramdan mümkün qədər səmərəli istifadə etməyə çalışır.

İkinci məsələ. Gəlin indi də məlumatverici dərslə problemli situasiya metodunu müqayisə edək. Problemli dərsdə şagirdlərdə idrak tələbatı yaradılır. Şagirdlər dərsdə sözün əsl mənasında düşünür, mühakimə yürüdürlər. Onlar nəinki problemi ayırd edir, həm də formula və həll edirlər. Məlumatverici dərsdə isə...

Psixoloqların biri məlumatverici dərsin məhz psixoloji baxımdan çatışmazlıqlarını maraqlı bir misalla sərrast göstərir. O, deyir ki, gəlin sadə bir eksperiment keçirək. Küçədə hər hansı bir adama yaxınlaşıb deyək: "Dünən Braziliyada hava çox isti keçib". O, çox güman ki, sizə nə isə qəribə bir adam kimi baxacaq və dərhal hansı səmtəsə uzaqlaşacaqdır. Dərsi yuxarıdakı sxemlə quranda da elə sinifdə buna oxşar hadisə baş verir. Bircə zahiri fərq nəzərə çarpır: müəllim yeni mövzunun adını deyəndə, şagirdlər istər-istəməz oturub ona qulaq asırlar.

Müəllim yeni dərsi danışıb adətən sinfə nəzər yetirir. Və... çox vaxt şagirdlərdən soruşur: - Kim dərsi başa düşmədi? Dərsi başa düşən də, düşməyən də - kimsə laqeyd və sadəlövh baxışlarla, kimsə sual dolu baxışlarla müəllimə baxır. Ancaq bir qayda olaraq onlar dərsi guya başa düşdüklərini uşaq fəhmilə etiraf edirlər.

**Haşiyə:** Kim dərsi başa düşmədi? Təcrübəsiz müəllimlər yeni dərsi danışıb - qurtarmamış adətən sinfə göz gəzdirib tələm-tələsik bu sualla şagirdlərə müraciət edirlər. Kimə nə aydın olmadı? Kimin sualı var? Halbuki dərsin başa düşülüb-düşülmədiyini birbaşa suallarla müəyyən etmək "üsul"u nəinki primitivdir, həm də səmərəsizdir. Hətta ağıldankəm adama belə bu sualı verəndə özünü sındırmır və şəstlə başa düşmədiyi mətləbi başa düşdüyünü deyir.

Müəllim şagirdlərin dərsi nə dərəcədə mənimsədiyini bilməlidirmi? Mütləq bilməlidir. Bu adi həqiqəti müəllimlərin özləri emprik surətdə kəşf ediblər. "Kim dərsi başa düşmədi " sualı da təcrübə axarında əmələ gəlib və məktəb təcrübəsində köklü yer tutub. Bəzi təcrübəli müəllimlər bu sualı nisbətən yumşaldıblar: onlar şagirdlərin dərsi başa düşüb-düşməməsini müəyyən etmək üçün daha səlist suallardan ("Kimə nə aydın olmadı", "Kimin sualı var" və s.) istifadə edirlər. Şagirdlərin dərsdə ağıllı suallar verməsini nəinki rəğbətləndirmək, həm də bunun üçün psixoloji cəhətdən əlverişli şərait yaratmaq zəruridir. Lakin bu gün şagirdlərin dərsi başa düşüb-düşmədiklərini müəyyən etmək üçün kibernetik ölçülərə əsaslanan yeni pedaqoji texnologiya əmələ gəlmişdir. Dərsdə əks əlaqənin yaradılması bu texnologiyanın ana xəttini təşkil edir.

Bir məsələni də qeyd edək. Sinfin

tərkibi yekcins deyil. Sinifdə bütün fənlərlə eyni dərəcədə maraqlanan, onları başa düşən və başa düşdüyü üçün müəllimi ardıcıl dinləyən şagirdlərlə yanaşı, daha çox bir və ya iki fənlə maraqlanan, gələcəkdə ədəbiyyatçı, bioloq və ya riyaziyyatçı olmaq istəyən şagirdlərin də öz yeri var. Lakin sinifdə dərslə maraqlanmayan, müəllimə qulaq asmayan, asanda da yalandan qulaq asan şagirdlər də az deyildir. Fənnin xarakterindən asılı olaraq bu şagirdlərin nisbəti də eyni bir sinifdə dərsdən-dərsə köklü surətdə dəyişir. Ədəbiyyat və tarix dərslərində belə şagirdlərə nisbətən az təsadüf edilir. Biologiya və kimya, fizika və riyaziyyat dərslərində isə onların sayı, təəssüf ki, xeyli artır.

Görəsən, bu şagirdlər proqram materialını mənimsəyə bilərmi? - sualına cavab vermək üçün gəlin, əvvəlcə, riyaziyyat və ya fizika dərslərində müşahidə aparaq, riyaziyyatı və fizikanı yaxşı mənimsəyən şagirdləri sadəcə olaraq sayaq. Sinifdə nə qədər şagirdin riyaziyyatı və ya fizikanı nəinki yaxşı bilmədiyinin, həm də əməlli-başlı bilmədiyinin şahidi olacağıq. Elmi-texniki inqilab dövründə, bu, şübhəsiz ki, kədərli pedaqoji “statistikadır”. Ancaq fakt faktlığında qalır. Bu gün biz onun psixoloji səbəbləri haqqında qətiyyətlə danışmalıyıq. Səbəb isə aydındır: ənənəvi didaktik sistem şagirdlərə proqram materialını öyrətməyi özünün əsas məqsədi saysa da, onu həyata keçirmək üçün səmərəli vasitələrdən istifadə edə bilmirdi, idrak fəaliyyətlərinin subyekti kimi şagirdin xüsusiyyətlərini nəzərə almırdı. Ənənəvi didaktik sistemdə müəllimin şagirdlərin idrak fəaliyyətini necə aktivləşdirdiyinə və daha çox hansı psixi prosesi aktivləşdirdiyinə diqqət yetirsək, məsələnin mahiyyətini açıqlaya bilərik.

Müəllim dərsdə həmişə bir psixoloji zərurətlə rastlaşır: proqram materiallarını öyrətmək üçün, ilk növbədə, şagirdlərin idrak fəaliyyətini aktivləşdirmək lazımdır, yəni dərsdə elə şərait yaradılmalıdır ki, şagirdlər ona qulaq assınlar, dərsi başa düşsünlər, yadda saxlasınlar(?)... Bu mühüm məsələni azı iki yolla - psixoloji üsullarla və necə deyərlər, güc üsulları ilə, avtoritar üsullarla həll etmək olar. Təəssüf ki, adi müəllimlər məhz güc üsulundan daha çox istifadə edirlər. Şagirdlərin idrak fəaliyyətini aktivləşdirmək onlar üçün əslində sadəcə olaraq intizam məsələsidir. Şagirdlərdən başlıca olaraq dərsə diqqətlə qulaq asmağı və yadda saxlamağı tələb edirdilər. Güc üsulları ilə də öz istəklərinə nail olurdular. Hətta sözdə şagirdlərin idrak fəaliyyətinin aktivləşdirilməsindən ağız dolusu danışırdılar, sinifdə, bu canlı psixoloji laboratoriyada isə uşaq ağlını az qala bəla kimi mənalandırırdılar. Pedaqoji şurada uşaqların dərslə maraqlanmasından yana-yana danışıb şagirdlərin idrak fəaliyyətini aktivləşdirməyin əhəmiyyətini sübut etməyə çalışan müəllimlər onların əsl fəallığını, məsələn, sual verməsini rəğbətləndirmirdilər.

Müəllimlərin çoxu avtoritar-inzibati üsulları asanlıqla mənimsəmişdi. Onlar “Pedaqogika” dərsliklərində də səxavətlə təsvir olunan cəzalandırma üsullarından “gen-bol” istifadə edirdilər. Nəinki şagirdlərlə, həm də valideynlərlə çox vaxt əmr formasında danışırdılar. Valideynləri dəvət etmirdilər, ancaq çağırırdılar.

Mütəxəssislərin fikrincə, məktəb bu yolla da şagirdləri öz işinin məqsədindən vasitəsinə çevirir, onları əslində təlim prosesindən uzaq salır, yadlaşdırırdı. Təlim şagird üçün öz mənasını itirirdi, öyrəndiyi biliklər ona özünün real həyat problemlərini həll etməkdə kömək etmirdi. Məktəbin “çətin ” uşaqlar problemi yaranırdı.

**Haşiyə:** Yeni pedaqoji təfəkkür anlamı özünəməxsus metaforadır. XX əsrin 70-80-ci illərində ənənəvi psixoloji və pedaqoji paradiqmaların alternativi kimi əmələ gələndə onları yeni pedaqoji təfəkkür kimi mə-

nalandırdılar.

Yeni pedaqoji təfəkkür konsepsiyasının özünəməxsus nəzəri-metodoloji qaynaqları var. Bizim fikrimizcə, bu konsepsiya nəinki sırf psixoloji, həm də sırf pedaqoji araşdırmalarda formalaşmayıb. Onun ilk səhifələri təhsilin fəlsəfəsində yazılıb. Təhsilin sosiologiyası kontekstində aparılmış araşdırmaların da bu sahədə töhfəsi az olmayıb.

Yeni pedaqoji təfəkkürün nəzəri-metodoloji qaynaqlarının təhlili göstərir ki, bu konsepsiya nəinki təhsilin fəlsəfəsi və sosiologiyasının, həm də psixologiyasının, pedaqogikasının, hətta biologiyasının inteqrasiyası kökündə əmələ gəlmişdir. Lakin bu faktorlar öz-özlüyündə nə qədər əhəmiyyətli olsa da, yeni pedaqoji təhsil konsepsiyası bilavasitə önəmli sosial faktorlarla şərtlənir. XX əsrdə dövrün qabaqcıl fəlsəfəsində və sosiologiyasında təhsilə yeni münasibət formalaşmağa başlamışdı. Təhsil artıq ölkənin (cəmiyyətin) sosial-ictimai inkişafının əsas vasitəsi kimi dəyərləndirilirdi. Psixologiya və pedaqogika bu dəyərləri mənimsəyəndə onlar məktəb təcrübəsinə nüfuz etməyə başladılar və dövrün tezarusunda yeni anlam - yeni pedaqoji təfəkkür anlamı vüsətlə səslənməyə başladı.

Təəssüflə qeyd etmək lazımdır ki, respublikamızda yeni pedaqoji təfəkkür konsepsiyası, nə qədər təəccüblü olsa da, mahiyyətcə psixoloji-pedaqoji kontekstində açıqlanır. Təhsilin fəlsəfəsi və sosiologiyası məsələlərinə isə əslində əhəmiyyət verilmir.

Bu axtarışlar nəinki Azərbaycan, həm də dünya pedaqoji-psixoloji fikrində önəmli hadisə kimi dəyərləndirilməlidir.

Yeni pedaqoji təfəkkürün formalaşması Azərbaycan məktəb tarixinin önəmli psixopedaqoji hadisəsidir.

**İstifadə edilmiş ədəbiyyat**

1. "Təhsil Qanunu". Bakı, 2009.

2. Abbasov Ə. Yeni kurikulumun səciyyəvi xüsusiyyətləri. Kurikulum, 2008. № 1.

3. Veysova Z. Fəal (interaktiv) təlim. Bakı, 2008.

4. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004.

5. Xəlilov C. Şərq və Qərb, Bakı, 2004.

6. Конфурация по проблемам образования и профессионального развития // Вопроцы психологии. 2009, № 4.

7. Чидивекий В.Э. Стылочизненыб асрект совчеменного процесса образования // Вопросы Психологии 2009, № 4.

**Э.Ализаде**

**О концепции нового педагогического мышления**

**Резюме**

В статье коснулось нового педагогического мышления и проблем педагогики и психологии, комментировались основные принципы нового педагогического мышления.

**A.Alizadeh**

**About a new pedagogical thinking conseption**

**Summary**

In the article the new pedagogical thinking and problems of pedagogy and psychology are reviewed, the main theses of new pedagogical thinking are commented.

***<u>Təhsil islahatı fəaliyyətdədir</u>***

# TƏHSİLİN PRİORİTET İSTİQAMƏTLƏRİNDƏN BİRİ

**Aydın Əhmədov**
***Təhsil Nazirliyinin şöbə müdiri***

**Ənvər Abbasov**
***Təhsil Problemləri İnstitutunun direktor müavini***

Təhsil sistemində islahatların məqsədi ondan ibarətdir ki, Azərbaycanın təhsil sistemi dünya təhsil sisteminin standartları ilə uyğunlaşsın.
**Heydər Əliyev**

***Açar sözlər:*** *inteqrasiya, təhsildə inteqrasiya, inteqrativ təlim, inteqrativ dərs, inteqrativ məzmun, inteqrativ standart, ümumi təlim nəticələri.*

***Ключевая слова:*** *интеграция, интеграция в образовании, интегративное обучение, интегративный урок, интегративное содержание, интегративный стандарт, общие результаты обучения.*

***Key word:*** *integration, integration in education, integrative training, integrative lesson, integrative content, integrative standard, general training results.*

Təhsildə inteqrasiya anlayışı ilkin olaraq onun semantikasını düşünməyi tələb edir. Müəllimlərin təbii olaraq öyrənmək istədikləri bu anlayış qloballaşmanın meydana qoyduğu mühüm tələblərdən biri olmaqla müasir təhsil prosesinin özünəməxsus keyfiyyət göstəricilərindən biri kimi diqqəti cəlb edir. Daha çox fəlsəfi yöndə başa düşülən inteqrasiya sözü həyatın bütün sahələrinə aid olmaqla sintetik xarakter daşıyır və bütövləşmə istiqamətində yeni yaranışın əsasında durur. Xüsusən cəmiyyət hadisəsi kimi inteqrasiya onun inkişaf istiqamətində dəyişikliklərini tənzimləməklə müasirliyi təmin edir.

"İnteqrasiya latın dilində "integer" – "bütöv", "bütövləşmə" deməkdir, əslində sözün etimologiyası inteqrasiyanın siyasi proses kimi məzmun və missiyasını daha aydın ifadə edir. "İnteger" sözündən yaranan "integratio" sözü də latın dilində "bərpa", "tamamlanan" mənasını verir" [1].

İnteqrasiya termini XX əsrin sonundan daha fəal istifadə olunmağa başlasa da, onun ifadə etdiyi mahiyyət və məzmun həyat yarandığı gündən mövcud olmuş, onun varlığını təşkil etmişdir. Zaman-zaman diferensial yanaşmalar hissələrə bölünməni, ayrılmaları tənzimlədiyi kimi, inteqrasiya prosesləri də bütövləşmələrin, tamamlanmaların nəticəsi kimi meydana çıxmışdır. Bəşəriyyətin tarixi boyu proqressiv xarakter daşıyan yeniliklər diferensial və həmçinin interaktiv yanaşmaların fonunda yaranmışdır. Bütün elm sahələrində, o cümlədən sosiologiyada, eləcə də pedaqogikada inteqrasiya önəmli yer tutmuşdur. Ona görə də pedaqogikada "inteqrasiya", "inteqrativlik", eləcə də "təhsildə inteqrasiya" və s. anlayışlardan daha çox istifadə olunmağa başlamışdır.

Qlobal dünyanın təhsil aləmində inteqrasiya aparıcı yer tutur. Ona görə də informasiyaların genişləndiyi bir dövrdə cəmiyyətin sürətlə və dəyişkən dinamikasını izləmək və ona müvaze olaraq inkişaf etmək üçün birləşmələr, bloklar yaratmaqla ümumiləşdirmələr aparmaq ən səmərəli strategiyalardan biri kimi qəbul edilir. Başqa sözlə, inteqrasiyaya müasir təhsilin sadə epitetlərindən biri kimi şou xarakterli anlayış kimi yanaşmaq olmaz. "Təhsildə inteqrasiya dəb, növbəti kompaniya deyildir. O, bu gün insan fəaliyyətinin bütün sferasını xarakterizə edən, əks etdirən bir tendensiyadır"[2].

Təhsilin bütün struktur elementlərinə aid olan inteqrasiya son dövrlərdə "inteqrativ təlim", "inteqrativ dərs", "inteqrativ fənn" və s. anlayışlarda işlənir. Eyni zamanda inteqrativ təlimə xüsusi pedaqoji texnologiyalardan biri kimi yanaşılır.

Son dövrlərdə təhsildə inteqrasiya ilə bağlı yaranmış fikirləri bir neçə qrupa bölmək olar. Onlardan birincisi, inteqrasiyanın ümumipedaqoji və eləcə də fənlərə aid məsələ kimi qoyulması, onlar barəsində mülahizələrin irəli sürülməsi, onların inteqrasiya olunması məsələsidir. Burada fənlərin birləşdirilməsi, biliklərin fənlərarası və fəndaxili əlaqə müstəvisində dəyərləndirilməsi, didaktik sistemin sintezi kimi müddəalar prioritet təşkil edir. Göründüyü kimi, bu müddəalar konseptual mahiyyət kəsb edir və daha ümumi xarakter daşıyır. Fikrimizcə də təhsildə inteqrativliyin konseptual yanaşma kimi nəzərə alınması onun şəxsiyyətyönümlü mahiyyət kəsb etməsindən irəli gəlir. Şəxsiyyətyönümlülük isə daha çox inteqrativ bilik və bacarıqlara söykənən dəyərlərin mənimsənilməsini tələb edir ki, buna da yalnız inteqrativ təhsil prosesində nail olmaq mümkündür. Çünki "təlimdə inteqrasiyanın nəticəsi şagird təfəkkürünün inkişafında özünü göstərir. O, tədris-idrak fəaliyyətinin səmərəliliyində, sistemləşdirilməsində, eləcə də mədəni savadlılığın mənimsədilməsində təzahür edir" [2].

Bütün bunlar isə koqnitiv (idraki) təhsilin atributlarındandır ki, ona yalnız inteqrativlik şəraitində nail olmaq mümkündür.

İkinci fikir daha ümumi xarakter daşımaqla inteqrasiyanın təhsil prosesinin bütün mexanizmlərində özünü göstərməsi, onun mahiyyətinə çökməsi ilə bağlıdır. Bu zaman inteqrasiya üçün zəruri hesab edilən zahiri görüntülər, əlamətlər istisna olunur.

Azərbaycan pedaqoji fikrində "inteqrativ təhsil", yaxud "təhsilin inteqrasiyası", eləcə də "inteqrativ təlim", "inteqrativ dərs" və s. anlayışlar artıq özünə yer tutmaqla istifadə olunmaqdadır. Müasir təhsil quruculuğunda onlardan yaradıcı şəkildə istifadə edilməkdədir. Azərbaycan təhsilinin elmi-nəzəri, psixopedaqoji problemləri ilə bağlı geniş tədqiqatları olan görkəmli psixoloq prof. Əbdül Əlizadə islahatın ilk dövrlərində yazırdı ki, "Müasir dövrdə humanitar fənlərin təbii-elmi fənlərlə inteqrasiyası daha çox vurğulanır. Bu ideya özü-özlüyündə son dərəcə durumludur. Bir tərəfdən elmi-tərəqqi şəraitində məktəb sadəcə olaraq humanitar fənlərin ekstensivləşdirilməsi yolu ilə inkişaf edə bilməz. Digər tərəfdən, fənlərin inteqrasiyasını dövrün sərt məntiqi ilə "təhsil gündəminə" çıxarıb. Respublikamızda bu sahədə ilk addımlar atılıb. "İnsan və cəmiyyət" inteqrativ fəndir. Bu sahədə əldə edilmiş təcrübə elmi-metodik meyarlarla təhlil olunmalıdır. Ən başlıca fənlərin inteqrasiyasının konseptual modeli işlənməlidir. Humanitar fənlərlə təbii-elmi fənlərin inteqrasiya məsələsi də ancaq bu konteksdə həll oluna bilər" [3, səh. 65-66].

XX əsrin ilk illərindən ölkəmizdə aparılan təhsil islahatları dövründə prioritet fəaliyyət istiqamətlərindən biri inteqrativ təhsilin formalaşdırılması sahəsində görülmüş işlər olmuşdur. Bu işləri də iki istiqamətdə qruplaşdırmaq mümkündür ki, bütün

hallarda ümumi təhsil, eləcə də digər pillələrdə əldə olunmuş fənlərarası, fəndaxili əlaqələr sahəsində nailiyyətlər öyrənilərək ümumiləşdirilmiş, yeni təcrübənin yaradılmasında onlardan istifadə olunmuşdur. Eyni zamanda inteqrasiya məfhumuna aid mülahizələr nəzərə alınmış, yeni təhsil konsepsiyasının yaradılmasında onlardan istifadə edilmişdir. Belə qənaətə gəlinmişdir ki, "inteqrasiya müəyyən təhsil sistemi çərçivəsində şagirdlərin təfəkküründə dünyanın bütöv və bölünməz obrazını formalaşdırmaq, onları inkişafa və özünüinkişafa istiqamətləndirmək məqsədi ilə təlimin bütün məzmun komponentləri arasında struktur əlaqələri qurmaqla onları sistemləşdirməkdir" [4, səh.170].

Qeyd etmək lazımdır ki, 1995-ci ildə Azərbaycan Respublikası Konstitusiyasının qəbul olunması ilə müstəqillik yolunda ilk addımlarını atan Azərbaycan bütün sahələrdə, o cümlədən təhsildə ümumi siyasətin zəruri prioritet istiqamətlərini müəyyənləşdirdi. Ulu öndər Heydər Əliyev ölkənin təhsil sahəsində milli siyasətin müəyyənləşdirilməsi ilə bağlı öz töhfələrini verdi. O, Azərbaycanın inkişaf etdirilməsi və müasir dünyadakı mövqeyinin möhkəmləndirilməsi məqsədilə Təhsil İslahatı komissiyasının iclasında çıxış edərək bildirdi ki, "indi bizdə təhsil sistemində islahatların məqsədi ondan ibarətdir ki, Azərbaycan dünya təhsili sisteminin standartlarına uyğunlaşsın" [5, səh.101]. Həmin dövrdə qəbul olunmuş İslahat Proqramında bu fikir prioritet istiqamət kimi əsas götürülməklə fəaliyyətlərin əsasına gətirildi. Artıq ilk dəfə olaraq dövlətin islahatçılıq fəaliyyətinin didaktik əsasını təşkil edən prinsiplər qəbul edildi. "Demokratikləşdirmə, humanistləşdirmə, inteqrasiya, diferensiallaşdırma, fərdiləşdirmə, humanitarlaşdırma prinsiplərinə əsaslanmaqla yeni təhsil sisteminin yaradılması" [6, səh. 6] mühüm vəzifələrdən biri kimi İslahat Proqramına daxil edildi və islahatların aparıldığı dövrdə praktik olaraq həmin prinsiplərin reallaşdırılması istiqamətində işlər görüldü. Bu ideya aparıcı bir xətt kimi davam etdirilməklə 2009-cu ildə Təhsil Qanununda bir daha təsbit olundu.

Təhsil islahatı ilə bağlı aparılan quruculuq işlərinin inteqrasiya prinsipi əsasında aparılmasında başlıca istiqamətlərdən biri məzmunun müasir müstəvidə formalaşdırılması olmuşdur. Təhsilin məzmunu anlayışından danışarkən həmişə onun bilik, bacarıq və vərdişlər sistemindən ibarət olması və proqramlarda, dərsliklərdə əks edilməsi xüsusi olaraq vurğulanır. Təbii ki, bu özlüyündə yaddaş məktəbinin göstəricilərindən biri olmaqla zamanında əhəmiyyətli rol oynasa da, sürətlə informasiyaların artdığı elmi-texniki inkişaf dövrünün tələblərinə cavab vermir. Artıq müasir dövrdə insanların həyati bacarıqlara nail olmaları, idraki vərdişlər qazanmaları üçün təfəkkür məktəbini keçməli, məntiqi, tənqidi və yaradıcı təfəkkür qabiliyyətlərinə yiyələnmələri əsas tələb kimi meydana çıxır. Bu isə öz növbəsində məktəb təhsilinin məzmununun inteqrasiya müstəvisində qurulmasını zəruri tələb kimi qarşıya qoyur. Ona görə də ümumi təhsilin yeni məzmununun qurulması zamanı cəmiyyətin ehtiyac və tələbatları nəzərə alınmaqla ölkə miqyasında ümumi təhsilin müxtəlif səviyyələri üçün ümumi nəticələr hazırlanmışdır. Bu nəticələr hər təhsil səviyyəsinin sonu üçün müəyyənləşdirilməklə daha çox insanın idraki, hissi və fiziki inkişafına aid edilmişdir. Milli səviyyədə qəbul olunmuş bu nəticələri mahiyyət etibarı ilə kompetensiyalar kimi də adlandırmaq mümkündür.

Qəbul olunmuş nəticələrin milli səviyyədə reallaşdırılması üçün fənlər müəyyənləşdirilmişdir. Bu fənlərin inteqrativ xarakterdə olması onların şagird şəxsiyyətinin formalaşdırılmasına yönəldilməsi başlıca cəhət kimi nəzərə alınmışdır.

Ümumiyyətlə, fənn təhsildə nəzərdə tutulmuş məqsədlərin və nəticələrin həyata keçirilməsində mühüm əhəmiyyəti olan məzmun elementidir. Onlar elm sahələrinə əsaslansalar da, zəruri elmi anlayışlardan ibarət müəyyən sistemi təqdim etsələr də, məzmun və struktur elementlərinə görə fərqlidirlər. Fənlər pedaqoji, psixoloji, fizioloji elementləri ilə daha çox öyrədici xarakterə malik olduğundan praktik əhəmiyyət daşıyır. Şagirdlərin müəyyən yaş səviyyəsində inkişafını başlıca məqsəd kimi qarşıya qoyur. Ona görə də fənlərə məzmun sahəsində pedaqoji araşdırmaların nəticəsi kimi yanaşılır. Onun həm adlandırılmasında, həm də məzmununun müəyyənləşdirilməsində inteqrativliyin nəzərə alınması vacib tələblərdən hesab edilir. Təhsil islahatlarının aparıldığı dövrdə bu cəhət xüsusilə nəzərə alınmış, məzmun islahatlarının aparılmasında inteqrativliyin gözlənilməsinə önəm verilmişdir.

Təhsil islahatının gedişi dövründə bu cəhət nəzərə alınmaqla ümumtəhsil fənlərinin tərkibi ölkə səviyyəli ümumi təlim nəticələri (standartlar) baxımından yeniləşdirilmişdir. Hər fənnin ümumi təhsil sistemindəki yeri və rolu əsaslandırılmış, ondan gözlənilən nəticələr müəyyən olunmuşdur. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1999-cu ildə qəbul etdiyi "Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları" ilə müqayisədə 2010-cu ildə təsdiq etdiyi "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" sənədində fənlərin sayı azaldılmışdır. Belə ki, "İnsan və cəmiyyət", "Azərbaycan Respublikasının Konstitusiyası", "İqtisadiyyatın əsasları", "Təbiətşünaslıq", "Həyat bilgisi"nə, "Rəsmxət", "Əmək hazırlığı", "Texnologiya"ya, "Astronomiya", "Fizika"ya inteqrasiya olunmaqla fənlərin sayı 26-dan 18-ə endirilmişdir. Bütün fənlərin praktik istiqamətdə gücləndirilməsi, onların şəxsiyyətin formalaşdırılmasına yönəldilməsi prioritet hesab edilmişdir. Ən başlıcası onların koqnitiv (idraki) istiqamətdə funksiyalarının artmasına üstünlük verilmişdir.

İnteqrativ fənlərin yaradılması məntiqi olaraq inteqrativ proqram və dərsliklərin, eləcə də dərs vəsaitlərinin yaradılması zərurətini doğurur. Təhsil siyasətindən irəli gələn vəzifə kimi yeni fənlər üzrə təhsil proqramlarının (kurikulumların) inteqrativ xarakterə malik olması, onların şəxsiyyətin formalaşması baxımından konseptual xarakter daşıması, istiqamətverici mənbəyə çevrilməsi mühüm şərt hesab edilir. Yeni təhsil proqramlarında (kurikulumlarda) bu məsələyə xüsusi olaraq diqqət yetirilmiş, şagirdlərin siniflər, səviyyələr üzrə inkişafına qoyulan standart tələblər hazırlanmışdır. Ölkə miqyasında ilk dəfə hazırlanan bu standartlar özlərinin inteqrativ xarakterinə görə təlim əhəmiyyəti daşıyır. Əvvəla, onlar hər mərhələdə şagirdlərin inkişaf səviyyələrinə qoyulan dövlət tələbi hesab edilməklə həm təlim, həm də inkişafın idarə olunması baxımından maraq doğurur. Təhsildə maraqlı olan hər kəsin fəaliyyətinin nizamlanmasına imkan yaradır.

İkinci isə fənlər arasında və fəndaxili inteqrasiyanın nəzərə alınmasıdır. İnsanlar özlərini inkişaf etdirmək üçün bu təhsil yanaşmasına həmişə istinad etmişlər. Ona görə də ənənəvi və klassik pedaqogikada bu məsələyə yer ayrılmış, fənlərarası əlaqə və fəndaxili əlaqələrin əhəmiyyətindən bir prinsip, yaxud metod kimi danışılmışdır. Fənlərin tədrisi metodikasında həmin məsələ praktik əhəmiyyəti olan bir problem kimi özünə yer tutmuş, ötən əsrin sonlarında ayrı-ayrı fənlərin proqramlarına gətirilmiş, orada xüsusi qeydlərin verilməsi məqsədəuyğun hesab edilmişdir. Bu qeydlər ümumi epizodik xarakter daşısa da, müəllimlərin marağına səbəb olmuş, tədris fəaliyyətlərinin səmərəli qurulmasında əhəmiyyətli rol oyna-

mışdır. Müasir dünyada informasiyaların çoxalması əlaqələrin sıxlaşması, ardıcıl və sistemli qurulması zərurətini yaratmışdır. Xüsusilə təhsildə onun didaktik əsasda qurulması mühüm pedaqoji problem kimi meydana çıxmışdır. Fənlərarası və fəndaxili əlaqələrin inteqrasiya müstəvisinə gətirilməsi, onun mühüm təhsil prinsiplərindən birinin tərkib hissəsi kimi nəzərə alınmaqla tətbiq olunması məqsədəmüvafiq hesab edilmişdir. Elə bu səbəbdən də təhsilin bütün səviyyələri üzrə təlimin məzmunu, təşkili və idarə olunması parametrlərində onun ciddi nəzərə alınması barədə nəticələrə gəlinmişdir.

Son illərdə aparılmış təcrübələrə əsaslanaraq demək olar ki, fənlərarası və fəndaxili münasibətlərin sadəcə əlaqə deyil, inteqrasiya xarakteri daşıması bu münasibətlərin daha sıx və möhkəm olmasına, onun bütöv bir prosesə çevrilməsinə şərait yaradır. Müəllimlər pedaqoji prosesdə ondan daha səmərəli qaydada istifadə etmək imkanı qazanırlar. Bundan əlavə, fənlərarası və fəndaxili inteqrasiya interaktiv öyrənməyə geniş yol açır. Şagirdlərin təbiət, cəmiyyət və insanlar haqqında qarşılıqlı əlaqələr şəraitində qurulmuş biliklərə yiyələnməsini stimullaşdırır.

“İnteqrativ öyrənmə şagirdlərin ətraf mühitin müəyyən aspektlərini müxtəlif fənlərə aid biliklər vasitəsilə geniş araşdırmasıdır” [7, səh. 22]. Fənlərarası və fəndaxili əlaqə bu imkanları genişləndirməklə şagird fəaliyyətini məntiqi, tənqidi və yaradıcı məcrada istiqamətləndirir, onun koqnitiv xarakter almasına təsir göstərir.

Yeni konsepsiyaya uyğun yaradılmış təhsil proqramlarında (kurikulumlarda) inteqrasiya əsas tələblərdən biri kimi nəzərə alınmışdır. Orada bütün hissələrin arasında inteqrativliyin gözlənilməsinə xüsusi diqqət yetirilmişdir. Ona görə də hər bir fənn üzrə yeni təhsil proqramlarının (kurikulumların) məzmun, strategiya və qiymətləndirməyə aid hissələri arasında bağlılıq yaradılmış, onları bütöv bir konseptual sənəd kimi formalaşdırmaq mümkün olmuşdur.

Fənlər üzrə təhsil proqramlarında (kurikulumlarda) inteqrasiya fənnin təlimi məzmununun komponentlərindən biri kimi hazırlanmışdır. Xüsusi cədvəllər formasında verilən həmin materiallarda fənlər üzrə uyğun gələn nəticələrin əlaqəliliyi ifadə edilmişdir. Nəticələrin kodları göstərilməklə əlaqəlilik koordinasiya olunmuşdur. Hər bir fənnə aid nəticələrin məntiqi bağlılığı, ardıcıl inkişafa xidmət göstərməsi mühüm tələb kimi diqqət mərkəzində saxlanılmışdır.

Təhsil proqramlarının (kurikulumların) məzmununda fənlərarası və fəndaxili inteqrasiyanın nəzərə alınması, təhsil standartlarının əlaqəliliyi baxımından onların konkret olaraq göstərilməsi və təsdiq olunaraq istifadəyə verilməsi, ilk növbədə, bu inteqrasiyanın ciddiliyinə dəlalət edir və onun yerinə yetirilməsini şərtləndirir. Hər hansı dərslik komplektinin yazılmasında ona minimum tələb kimi dəyər verilir. Ona görə də dərslikləri və dərs vəsaitlərini yazan, birinci növbədə, təhsil proqramlarının (kurikulumların) xüsusiyyətlərini yaxından öyrənməli və fəaliyyətlərinin əsasına gətirməlidirlər.

Odur ki, yeni təhsil konsepsiyasında təlimin inteqrativ məzmununun ardıcıl olaraq davam etdirilməsi, onun yeni texnologiyalar zəminində mənimsənilməsini tələb edir. Başqa sözlə, inteqrativ məzmun inteqrativ texnologiyanın olması zərurətini meydana çıxarır. Sinkretik xarakterinə görə dərs bunların içərisində ən əhəmiyyətlisi hesab edilir. Akad. M.M. Mehdizadənin təbirincə demiş olsaq, “...dərs pedaqoji prosesin hüceyrəsi deyil, onun özəyidir, onun həlledici hissəsidir. Onda pedaqogikanın xeyli hissəsi deyil, şagirdlərin təlim və tərbiyəsinin məzmunundan, yollarından, prinsip və metodlarından bəhs olunan əsas hissəsi cəmlənir”

[8]. Bu mənada dərs özü də təlimin ən inteqrativ formalarından biri kimi dəyərləndirilir və orada müxtəlif parametrli pedaqoji fəaliyyətlərin birləşdirildiyi aydın görünür.

Təbii ki, bu inteqrativlik, ilk növbədə, təlimin inteqrativ məzmununun məntiqi davamıdır. Onun növbəti addımında reallaşdırılmasıdır. İkinci isə müəllimin bir dərs saatında fəaliyyətini istiqamətləndirən plandır. Bu planda inteqrasiya elementinin olması, ona mövzu, məqsəd, üsul və təchizatlar sisteminin daxil edilməsi müasir pedaqoji tələblərdən hesab edilir. Belə ki, müəllim özünün gündəlik dərs planında təlim məqsədinə uyğun olaraq reallaşdırdığı strategiyalara inteqrasiya məsələlərini daxil edir. Fəaliyyətinin inkişafyönümlü olmasında ona mühüm amil kimi yanaşır. Müəllim həm də planının ümumi müddəalarında dərsin gedişinə aid apardığı qeydlərdə inteqrasiyadan necə istifadə etdiyini nəzərə çatdırır. Təhsil proqramlarına daxil edilən dərs planı nümunələrinə inteqrasiya elementlərinin seçilməsi, yerləşdirilməsi, bir texnologiya kimi ondan istifadə olunması barədə tövsiyələr verir.

Belə tövsiyələr təlim prosesinin, onun təşkilat formalarının bilavasitə inteqrativ əsasda qurulmasına aid istiqamətverici bir resursudur. Ona bir nümunə kimi yanaşmaq və ondan yaradıcı istifadə etmək hər bir müəllimin vəzifəsidir. Bundan əlavə, təhsil proqramlarında (kurikulumlarda), perspektiv (illik) planlaşdırma nümunələrində də inteqrasiya xüsusi komponent kimi nəzərdə tutulur.

Azərbaycan Prezidenti tərəfindən təsdiq olunmuş "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında ölkəmizdə aparılan təhsil islahatlarına, onun məzmununda gedən dəyişikliklərə xüsusi qiymət verilir. Göstərilir ki, "Təhsilin məzmunca yeniləşməsinə istiqamətlənmiş islahat tədbirləri görülmüş, Azərbaycan təhsilinin Avropa təhsil məkanına inteqrasiya istiqamətində əhəmiyyətli addımlar atılmışdır" [9].

İlk növbədə, burada ümumi təhsilin kulturoloji yanaşma tərzi ilə formalaşmış şəxsiyyətyönümlü və nəticəyönümlü məzmununun yaradılması bu addımlardan biri kimi diqqəti cəlb edir. Eyni zamanda ümumi təhsildə dəyərləri ifadə edən ümumi nəticələrin (kompetensiyaların), eləcə də inteqrativ fənlərin yaranması, ümumiyyətlə, fənlərdə inteqrativliyin güclənməsi əldə olunmuş nailiyyətlərdəndir.

Hazırda aparılan islahatyönümlü işlərə və onların sürətinə gələcəyin prizmasında daha yüksək tələblər qoyulur. "Azərbaycan-2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında qeyd olunur ki, "Azərbaycan təhsilinin dünya və Avropa təhsil məkanına inteqrasiyası güclənəcəkdir" [9]. Bu fikir ulu öndər Heydər Əliyevin 90-cı illərin sonunda Azərbaycan təhsilinin dünya və Avropa təhsilinə inteqrasiya olunması barədə söylədiyi fikirlərin davamı kimi səslənməklə müasir dövrdə təhsil sahəsində vəzifələrimizi müəyyənləşdirir.

Dünya və Avropa təhsilinə inteqrasiya olunma, hər şeydən əvvəl, təhsilin bütün sahələrində qlobal təhsil tendensiyalarını davam və inkişaf etdirmək zərurətini doğurur. Bu tendensiyalardan biri təhsildə inteqrasiyadır.

Gələcəkdə ümumi təhsilin məzmununun inteqrasiyasında nələr prioritet ola bilər?

Bu ritorik sualın ətrafında düşünərkən əldə olunmuş təcrübələri və təhsildəki mövcud durumu nəzərə almaqla bir daha "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasının təhsil haqqında müddəalarına qayıtmaq məntiqi cəhətdən məqsədəuyğun hesab edilir. Bu sənəddə qeyd olunur ki, "12 illik ümumi təhsil sisteminə keçid təmin ediləcək. Şagirdlərin idrak fəallığını, ümumi inkişafını ləngidən mövcud "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktə-

bi”nə keçidin təmin olunması məqsədilə sistemli tədbirlər həyata keçiriləcəkdir” [9].

Bu müddəadan Azərbaycanın gələcək məktəbinin üfüqləri görünür. Həmin üfüqlərdə bərq vuran, parıldayan “düşüncə məktəbi”nin zərrin işıqlarıdır ki, ona çatmaq üçün ümumi təhsilin elmi-metodiki sferasını dəyişmək, müvafiq yanaşmalardan, texnologiyalardan istifadə etmək lazımdır. Dünya təhsilində “inteqrativ təhsil” belə texnologiyalardan biri hesab edilir ki, islahatın ilk illərindən başlayaraq ondan istifadə olunur. Pedaqoji mənbələrdə göstərilir ki, “XX əsrin 70-ci illərindən başlayaraq təbiət elmləri sahəsində yeni fənlərarası elmi istiqamət − sinergetika meydana gəlir. Hansı ki, həmin sahə müxtəlif mürəkkəb makrosistemlərin − fiziki, kimyəvi, bioloji, texniki, iqtisadi, sosial və sair elmlərin özünütəşkilini, ümumi qanunauyğunluqlarını, prinsiplərini ehtiva edir... Fənlərarası biliklərin metodologiyasının spesifikası başlıca olaraq inteqrativlik, sintezləşdirmə tendensiyası ilə bağlıdır” [10, səh. 191].

Araşdırmalardan belə nəticəyə gəlinir ki, “...sinergetikanın nailiyyətləri humanitar və dəqiq elmlərin ənənələrinin, metodlarının və yanaşmalarının köməyi ilə təhsilin modernləşdirilməsi üçün geniş imkanlar açır” [10, səh. 191]. Modernləşmə prosesində humanitar və dəqiq elmlərin qovşağı yaranır. Həmin qovşaqda inteqrativ standartlar hazırlamaq, inteqrativ dərslər keçmək və inteqrativ düşüncə tərzi formalaşdırmaq istiqamətində fəaliyyətlər birləşir.

Məlum olduğu kimi, ümumi orta təhsil icbaridir. Təhsil Qanununda onun məqsədi belə göstərilmişdir: “Ümumi orta təhsilin məqsədi təhsilalanların şifahi nitq və yazı mədəniyyətinin, ünsiyyət bacarığının, idrak fəallığının və məntiqi təfəkkürünün inkişafını, təhsil proqramına daxil olan fənlər üzrə və eləcə də dünya sivilizasiyasının inkişafı haqqında müvafiq bilik və təsəvvürlərinin formalaşdırılmasını, müasir informasiya-kommunikasiya vasitələrindən istifadə etmək qabiliyyətini, hadisələri qiymətləndirmək və öz gələcək fəaliyyət istiqamətlərini müəyyənləşdirmək bacarığını təmin etməkdən ibarətdir” [11].

Göründüyü kimi, ümumi təhsilin bu səviyyəsində şagirdlərin inkişafı ilə bağlı müəyyən olunmuş məqsədlər daha çox həyati xarakterdə olub, praktik əhəmiyyət daşıyır. Onları reallaşdırmaq üçün şagirdlərə ən zəruri biliklər əsasında daha çox praktik faydası olan bacarıqlar, qabiliyyətlər aşılamaq lazımdır. Bu təhsil səviyyəsi üçün Milli Kurikulumda müəyyən olunmuş ümumi nəticələr də bilavasitə idraki, hissi və psixomotor bacarıqlardan ibarət dəyərlərin formalaşmasına yönəldilmişdir. O səviyyəyə aid fənlər də məhz həmin tələblər əsasında bir daha nəzərdən keçirilməli və müvafiq fənlərin birləşməsindən ibarət inteqrativ fənlər yaradılmalıdır.

Bu baxımdan kimya, fizika, biologiya fənlərinin inteqrasiya olunaraq bir fənn kimi tədris planına daxil edilməsi məntiqə uyğun hesab edilir. Eyni zamanda şagirdlərin artıq təlim yükündən azad olması, onlarda inteqrativ təfəkkürün formalaşması baxımından faydalı bilinir.

Ümumi orta təhsil səviyyəsində şagirdlərdə ictimai şüurun formalaşdırılması, onlarda müəyyən təsəvvürlərin yaradılması heç də ictimai elmlərin diferensiasiya olunaraq geniş planda tədrisini tələb etmir. Əksinə, ictimai fənlərin bir müstəvidə inteqrasiya olunması şagird şəxsiyyətinin formalaşdırılması baxımından əhəmiyyət daşıyır.

Azərbaycan dili və ədəbiyyat fənlərinin təlimi sahəsində ölkəmizdə böyük ənənə yaranmış və geniş təcrübə toplanmışdır. Son dövrlərdə bu fənlər üzrə yeni təhsil proqramları (kurikulumları) hazırlanarkən bu baxımdan həm Azərbaycanda, həm də dünyanın inkişaf etmiş ölkələrində mövcud vəziyyət öy-

rənilərək təhlil olunmuş, yeni fənn standartlarının yaradılmasında onlara istinad edilmişdir. Azərbaycan dilinin müxtəlif üslublu mətnlər üzərində öyrədilməsi texnologiyası praktik əhəmiyyəti olan təcrübə kimi genişləndirilmiş, onun icbari təhsil səviyyəsində ədəbiyyatla birləşdirilərək inteqrasiya olunması imkanlarını reallaşdırmışdır. Əslində bu reallıq hər iki fənnin məqsəd və vəzifələrinə uyğun olaraq hazırlanmış sinif standartlarındakı oxşarlıqdan irəli gəlmişdir. Eyni zamanda hər iki fənnin nitq mədəniyyəti formalaşdırmaq istiqamətində müəyyənləşdirilmiş vəzifələrinin məntiqi davamı kimi meydana çıxmışdır. Ona görə də bu fənlərin icbari təhsil səviyyələrində bir adda inteqrasiya olunması gələcəkdə həyata keçiriləcək islahatyönümlü tədbirlərdən biri ola bilər.

Ümumi təhsildə inteqrasiyanın aparılması bu sahədə ciddi elmi, pedaqoji, metodik araşdırmaların təşkilini istisna etmir. İnteqrasiya sahəsində praktik fəaliyyətimizin nəzəri-pedaqoji əsaslarının öyrənilməsi, bütövlükdə islahatçılıq fəaliyyətimizin əsasına gətirilməsi bu günümüzün təxirəsalınmaz vəzifələrindən biri kimi öz həllini gözləyir.

**İstifadə edilmiş ədəbiyyat**

1. www.anl.az/down/meqale/azerbaycan/azerbaycan.../69130.htm
2. ido.tsu.ru/ss/?unit=356&page=1158
3. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür: ideyalar, prinsiplər, problemlər. Bakı: Adiloğlu, 2001.
4. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.
5. Azərbaycanın təhsil siyasəti (1998-2004). Bakı: Çaşıoğlu, 2005.
6. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı, 1999.
7. Kərimov F., Əhmədova M., Varella G., Reyli Ə. İnteqrativ kurikulum: mahiyyəti və nümunələr. Bakı: Adiloğlu, 2006.
8. Mehdizadə M. Ümumtəhsil məktəblərində təlim və tərbiyə prosesinin təkmilləşdirilməsi yolları. Bakı: Maarif, 1982.
9. http://www.president.az/
10. Педагогические технологии: Учебное пособие для студентов педагогические специальностей/ Под общей ред. В.С.Кукулина. Москва ККЦ "Мар Т"; Ростов Н/Д: Издательский центр "Мар Т", 2004.
11. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2009.

**А.Ахмедов,**
**Э.Аббасов**

**Одно из приоритетных направлений образования**

**Резюме**

В статье исследуются понятие содержания интеграции, а также теоретико-педагогическое начало. Все подходы обобщаясь выдвигаются адекватные положения. Определяется решающая роль интеграции в создании нормативно - правовой базы образования и главные направления применения её в обучении в Азербайджане.

**A.Ahmadov**
**A.Abbasov**

**One of the priority directions of education**

**Summary**

In the article the theoretical and pedagogical sources of the conception, content and usage of integration in education sphere are researched, relevant conclusions are made by summarizing approaches. The key role of integration in forming the normative-law base of education in Azerbaijan, the basic directions of using it in training is defined.

# TƏLİMİN KEYFİYYƏTİNİN YÜKSƏLDİLMƏSİ ƏSAS MƏQSƏDİMİZDİR

**Vaqif Ələkbərov**
***Sumqayıt Şəhər Təhsil Şöbəsinin müdir müavini***

***Açar sözlər:*** *təhsil, tərbiyə, müəllim, şagird, yeni texnologiyalar, monitorinq.*
***Ключевые слова:*** *образование, воспитание, учитель, ученик, новые технологии, мониторинг.*
***Key words:*** *education, upbringing, teacher, student, new technologies, monitoring.*

Ümummilli lider Heydər Əliyev ideyalarının Respublikamızın Prezidenti cənab İlham Əliyev tərəfindən davamlı olaraq, yaradıcılıqla həyata keçirilməsi sayəsində şəhərlərimizin, kəndlərimizin siması yaxşı mənada dəyişir, dünya iqtisadiyyatında maliyyə böhranının dərinləşdiyi bir dövrdə ölkəmizdə iqtisadiyyatın dinamik inkişafı təmin edilir, əhalinin maddi-rifah halı yüksəlir.

Həyata keçirilən iqtisadi, sosial, mədəni islahatlar nəticəsində ölkəmiz dinamik inkişaf yolu ilə inamla irəliləyir, onun beynəlxalq nüfuzu getdikcə güclənir. Qlobal enerji-kommunikasiya layihələrinin əsas iştirakçısı kimi Azərbaycanın Qafqaz regionu, Avropa və ümumiyyətlə, müasir dünya üçün önəmi artır. Bir tərəfdən, ölkəmizin davamlı sosial-iqtisadi tərəqqisi, digər tərəfdən isə müasir dünyada gedən qloballaşma, rəqabət və inteqrasiya prosesləri respublikamız üçün bütün sahələr üzrə yüksək təhsilli mütəxəssislərin hazırlanmasına tələbatı artırır. Bütün bunları nəzərə alan ölkəmizin rəhbərliyi təhsil sahəsinin inkişafına böyük önəm verir, onu dövlət siyasətinin prioritet istiqamətlərindən biri kimi ön plana çəkir və bu sahədə əsaslı dövlət proqramları həyata keçirir.

Məlumdur ki, təhsilin ayrı-ayrı sahələrinin inkişafı üzrə real vəziyyətin təhlili əsasında hazırlanıb təsdiq edilmiş proqramların reallaşdırılması nəticəsində təhsil infrastrukturunun müasir tələblərə uyğun təkmilləşdirilməsi, təhsilin məzmununun yeniləşdirilməsi və buna müvafiq yeni dərslik siyasətinin reallaşdırılması günün əsas tələblərindəndir. Təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni model və mexanizmlərin tətbiqi, əmək bazarının tələbatına uyğun kadr hazırlığı və təminatının yaxşılaşdırılması, təhsil müəssisələrinin informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilməsi və təhsil sisteminin informasiyalaşdırılmasına da ciddi fikir verilir. Son illərdə ölkəmizin təhsil sistemində istedadlı uşaqların inkişafı, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilinin təşkili, texniki peşə təhsilinin yeniləşdirilməsi, xaricdə təhsil və digər bu kimi sahələrdə əhəmiyyətli nailiyyətlər əldə olunmuşdur.

Son dövrlərdə şəhərimizdə 5 məktəb binası tikilmiş, 6 məktəb əsaslı təmir olunmuş, 7 məktəb yanında 2200 yerlik əlavə tədris korpusu tikilmişdir. Üç məktəbdənkənar müəssisədə, 6 ümumtəhsil məktəbində əsaslı təmir işləri aparılmışdır. Təhsil müəssisələrinin tədris-maddi bazasının möhkəmləndirilməsi sahəsində son 2-3 il ərzində əhəmiyyətli işlər görülmüşdür. Bütün bun-

lar, heç şübhəsiz, respublikamızın prezidenti cənab İlham Əliyevin təhsilimizə xüsusi diqqət və qayğısı sayəsində mümkün olmuşdur.

Yeni dərs ilində keçirilməsi planlaşdırılmış "Fənn aylıqları" bütün pedaqoji kollektivlərdən, hər bir müəllimdən öz işinə yenidən baxmağı tələb edəcəkdir. Hesab edirik ki, fənn aylıqları çərçivəsində təşkil ediləcək tədbirlər ümumtəhsil məktəblərində təlimin keyfiyyətinin yaxşılaşdırılmasına, fənlərin tədrisi vəziyyətinin yüksəldilməsinə, müəllim və şagirdlərin məsuliyyət hissinin artırılmasına şərait yaradacaqdır.

Şəhər üzrə əlaçı şagirdlərin sayının 2011/2012-ci dərs ilindəki 6291 nəfərdən cari dərs ilində 7226-ya (17,7 faiz) çatması, əlaçı şagirdlərimizin sayının 935 nəfər artması məktəb pedaqoji kollektivlərinin müsbət işi kimi qiymətləndirilə bilər.

"4" və "5" qiymətlə oxuyanların sayı 15109 (37 faiz) olmaqla şəhər üzrə biliyin keyfiyyət göstəricisi 54,6 faiz təşkil edir. Yeni tipli məktəblər içərisində biliyin keyfiyyət göstəricisi "Təfəkkür" liseyində 100 faiz, TET Gimnaziyada 96 faiz, 40 nömrəli tam orta məktəbdə 70,4 faiz, 24 nömrəli tam orta məktəbdə 66,4 faiz, 12 nömrəli tam orta məktəbdə 62,5 faiz olmaqla ən yüksəkdir. Digər məktəblərdə də bu sahəyə diqqətin artırılması ilə bağlı konkret işlər görülür.

Tam orta təhsil üzrə buraxılış imtahanlarına buraxılmış 2892 şagirddən 2843-ü (98,3 faiz) attestat almışdır. Tam orta təhsil üzrə buraxılış imtahanında 2623 məzun imtahanlarda müsbət qiymət almış və müvəffəqiyyət göstəricisi 90,7 faiz olmuşdur. Ümumilikdə 255 məzun (onlardan 67 məzun hər iki imtahan fənnindən) "2" qiymət almışdır.

Ümumi orta təhsil üzrə imtahanlara buraxılmış 3666 şagirddən 2906-sı imtahanda müsbət qiymət almış və müvəffəqiyyət 79,3 faiz olmuşdur. 687 şagird, o cümlədən 226 şagird hər iki imtahan fənnindən "2" qiymət almışdır.

Ötən dərs ilində təlim-tərbiyə prosesinin yaxşılaşdırılması ilə əlaqədar 50-yə yaxın məsələ müzakirə edilmiş, mövcud vəziyyət təhlil olunmuş, işi yaxşılaşdırmaq üçün tədbirlər müəyyənləşdirilərək həyata keçirilmiş, lazımi intizam tədbirləri görülmüşdür.

Təlimin keyfiyyəti, böyük ölçüdə, müəllim-şagird münasibətlərinin necə qurulmasından asılıdır. Mövcud təhsil haqqında qanunun təhsilalanlar və təhsilverənlərin hüquq və vəzifələri bölməsindən görünür ki, bu münasibət müəllim-şagird əməkdaşlığıdır. Bu isə yenə məktəbdə rəhbərlik və nəzarətin təşkili vəziyyətindən, məktəbin idarə olunmasında valideynlərin iştirakı və rolunun artırılmasından asılıdır.

VII-XI sinif şagirdləri arasında Heydər Əliyevin nəsillərə nümunə olan həyat və fəaliyyətinə həsr edilmiş inşa müsabiqəsinin ilkin şəhər turunda 17 minə yaxın şagird iştirak etmiş, Respublika turunda isə Sumqayıt şəhəri 24 nömrəli tam orta məktəbin IX sinif şagirdi Xəlilli Vüqar 1-ci, 11 nömrəli tam orta məktəbin IX sinif şagirdi Salayev Anar 2-ci yerə layiq görülmüşdür.

Şagirdlərdə vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi ilə əlaqədar aparılan monitorinqin nəticələrinin təhlilindən məlum olur ki, bəzi şagirdlər vətənimiz, onun tarixi, coğrafiyası haqqında çox sadə, hətta dünyagörüşü xarakterli suallara belə cavab verməkdə çətinlik çəkirlər. Ən acınacaqlı hal isə odur ki, hər bir azərbaycanlının bilməyə borclu olduğu, torpaqlarımızın işğal tarixi, konkret olaraq Şuşa şəhərinin işğal günü haqqında suala monitorinqdə iştirak etmiş 576 şagirddən 218 nəfəri, yəni təxminən 38 faizi ya səhv cavab vermiş, ya da ümumiyyətlə cavablandırmamışdır.

Monitorinqdə iştirak etmiş şagirdlərin 8 faizi Zərdab rayonunun, 4 faizi Göyçayın, 5 faizi İmişlinin, 3 faizi isə Şəmkirin işğal

edilmiş rayonlar olduğunu düşünür. Bu, nəinki şagirdlərimizin coğrafi biliklərinin zəif olmasını, Azərbaycanın inzibati rayonlarını tanımamasını bildirir, həm də yuxarıda qeyd etdiyimiz kimi, onlarda vətənpərvərlik tərbiyəsi sahəsində aparılan işin yarıtmazlığından xəbər verir.

Müasir gəncliyimizə xas olan, heç bir yerdə qabarıq şəkildə göstərilməyən bu məsələni araşdırıb, ona diqqəti cəlb etməkdə məqsədimiz pedaqoji kollektivlərimizi bu məsələnin həllinə səfərbər etməkdir.

Respublika və beynəlxalq miqyaslı müsabiqələrdə Sumqayıt məktəbliləri uğurla çıxış edir və müvəffəqiyyət qazanırlar. 47 ölkənin qatıldığı ətraf mühitin mühafizəsi üzrə VII Beynəlxalq İNEPO layihəsində şəhərimizin 11, 12, 13, 14, 18, 19, 23, 24, 25, 27, 29, 30, 31 nömrəli tam orta məktəblərinin, TET Gimnaziyanın, “İstedad”, “Təfəkkür” və TTEL-in hazırladıqları layihələr qəbul olunmuş, təqdimat sərgisində Sumqayıt məktəbləri dörd bürünc, üç gümüş medal qazanmışlar.

“Dilimiz varlığımızdır” devizi altında keçirilən “Ana dilimizi sevək, sevdirək” mövzusunda IX Respublika müsabiqəsində 36 nömrəli tam orta məktəbin şagirdi Heydərova Türkan qızıl, 43 nömrəli tam orta məktəbin şagirdi Hüseynova Aytac gümüş medal almışdır.

Ölkə Prezidentinin sərəncamı ilə keçirilən “Ən yaxşı ümumtəhsil məktəbi” və “Ən yaxşı müəllim” müsabiqələrində şəhərimizin 5 məktəbi (30, 31 nömrəli məktəblər, TET Gimnaziya, TTEL, “İstedad” liseyləri) və 4 müəllimimiz qalib gəlmişdir. Beləliklə, müsabiqənin keçirilməyə başlandığı vaxtdan 17 məktəbimiz (onlardan üçü iki dəfə), 38 müəllimimiz bu mötəbər müsabiqənin qalibi adını qazanmışdır.

Fənn olimpiadalarının Respublika turunda Sumqayıt məktəbliləri hər il olduğu kimi, bu il də müvəffəqiyyətlə çıxış etmiş, 27 təmsilçimizdən iki nəfəri 1-ci, üç nəfəri 2-ci, yeddi nəfəri 3-cü, dörd nəfəri mükafata layiq 4-cü yerləri tutmuşlar ki, bu da rayon və şəhərlər arasında ən yüksək nəticə hesab olunur. Azərbaycan Respublikası Təhsil Nazirliyinin “Ümumtəhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılması barədə Təlimat” pedaqoji kollektivlərdə geniş müzakirə edilmiş və tətbiqi günün tələbinə çevrilmişdir.

Məktəblilərimizin qazandığı bu uğur və nailiyyətlər, əsasən şəhərin bir neçə məktəbinin adı ilə bağlıdır. Belə ki, müsabiqələrin və tədbirlərin məqsədyönlü təşkilində şəhərin 1, 5, 7, 11, 14, 21, 24, 26, 27, 30 nömrəli tam orta məktəbləri və yeni tipli TTEL, TET Gimnaziya, “Təfəkkür” və “İstedad” liseyləri yaxından iştirak etmiş, fərqlənmiş və mükafata layiq yerlər tutmuşlar.

Hər il olduğu kimi, bu il də şəhərimiz üzrə ali məktəblərə qəbul imtahanlarının göstəriciləri yüksək olmuş, respublika üzrə ən yaxşı nəticələrdən hesab edilmişdir. İlkin məlumata əsasən, bu il ali məktəblərə sənəd vermiş məzunlarımızın 54,3 faizi müxtəlif universitetlərə qəbul olunaraq, tələbə adını qazanmışdır ki, bu da ötən ilin göstəricisi ilə müqayisədə 3,3 faiz çoxdur. Beləliklə, son illərdə şəhər üzrə qəbul faizinin artımı davam etmiş, bu il artım tempi daha da yüksək olmuşdur. Yeni tipli məktəblərimiz qəbul imtahanlarında yüksək nəticələr göstərərək respublika üzrə ən yaxşı məktəblər sırasında yer almışdır. Ali məktəblərə qəbul TETG və TTEL-də 100 faiz, “İstedad” liseyində 94 faiz, “Təfəkkür” liseyində isə 82 faiz təşkil etmişdir. Digər ümumtəhsil məktəblərindən isə 1, 11 və 18 nömrəli tam orta məktəblərin göstəriciləri daha yüksək olmuşdur.

Bu ilki qəbul imtahanlarında TTEL-in məzunu Flora Qafarova ən yüksək nəticə göstərərək 700 bal toplamışdır. Şəhər üzrə ümumilikdə 98 nəfər (7 nəfər Sumqayıt Özəl Türk liseyindən, 1 nəfər “İdrak” liseyindən)

600-dən çox bal toplamışdır ki, bu da ötənilki göstəricidən çoxdur.

Sumqayıt şəhər Təbiət Elmləri Təmayüllü Gimnaziyanın şagirdi Şəfiyeva Yaxşı və Texniki və Təbiət Elmləri Liseyinin şagirdi Həsənli Elçin tam orta təhsili qızıl medalla başa vurmuş, qəbul imtahanlarında müvafiq olaraq 680 və 675 bal toplayaraq ümidləri doğrultmuşlar.

Məktəblilərin sağlamlığının qorunub saxlanması işinin təşkilində Nazirlər Kabinetinin qərarı ilə təsdiq olunmuş "Təhsil müəssisələrində iaşə və tibbi xidmətlərin təşkili Qaydaları və Normaları"nın icrasına nəzarətin gücləndirilməsi, Azərbaycan Respublikası Standartlaşdırma, Metrologiya və Patent üzrə Dövlət Komitəsi tərəfindən hazırlanmış qida standartlarına əməl olunması ilə bağlı məktəb direktorlarına ciddi tapşırıqlar verilmişdir.

Dərs ili ərzində məktəbdənkənar müəssisələrin fəaliyyətinə nəzarət diqqət mərkəzində olmuş, Turizm və Diyarşünaslıq Mərkəzi, Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi, Məktəbdənkənar Tərbiyə İşi Mərkəzi və 2 nömrəli Uşaq və Gənclər İdman Məktəbində reydlər keçirilmiş, müzakirələrdə bu müəssisələrin işində müəyyən irəliləyiş olduğu göstərilməklə, dərnək məşğələlərinə şagirdlərin davamiyyətinin lazımi səviyyəyə çatdırılması üçün tövsiyələr verilmişdir.

Ötən dərs ili ərzində qarşımızda duran əsas vəzifələrdən biri şagirdlərin, xüsusilə də yuxarı sinif şagirdlərinin dərsə davamiyyətinin yaxşılaşdırılması olmuşdur.

Artıq 3 ildir ki, şəhər təhsil şöbəsində yaradılaraq tətbiqinə başlanılmış "Elektron davamiyyət" sistemi vəziyyətə operativ nəzarət etməyə imkan verir, müəllim və şagirdlərin məsuliyyətini artırır və valideynləri bu məsələyə cəlb edərək idarəetmədə mühüm vasitəyə çevirir.

Azərbaycan Respublikasının təhsil naziri cənab Mikayıl Cabbarovun 17 iyul 2013-cü il tarixli 739 nömrəli əmri ilə "Xüsusi istedada malik uşaqların vaxtından əvvəl I sinfə qəbulu Qaydaları" təsdiq edilmiş, yeni qaydalar 6 yaşı dekabrın 31-dək tamam olan uşaqlara I sinfə qəbul olmaq imkanı vermişdir. Nazirin əmrinə uyğun olaraq şəhər təhsil şöbəsində, pedaqoji kollektivlərimizin ən nüfuzlu müəllimlərinin, metodist, psixoloq və həkimin də daxil edildiyi komissiya yaradılmışdır. Əhalinin maariflənləndirilməsi ilə əlaqədar yeni qaydalarla bağlı mətbuatda, yerli televiziya kanalında izahat işləri aparılmış, komissiyanın fəaliyyəti zamanı video çəkiliş təşkil edilərək, tam şəffaf və obyektiv seçim təmin edilmişdir.

*Rəyçi: dos. R.Qəndilov*

**В.Алекперов**

**Повышение качества является главной нашей целью**

**Резюме**

В статье говорится об удачах, завоеванных в области образования вследствии веденых реформ. Дается информация о подготовленной программе, которая способствует увеличению чувства ответственности учащихся и учителей, повышению уровня учебного процесса предметов, улучшению качества учебы в общеобразовательных школах в новом учебном году.

**V.Alakbarov**

**The goal is enhancing the quality of training**

**Summary**

In this article it is spoken about the achievements gained as a result of reforms in the sphere of education. The information is given about enhancing the quality of education, enhancing the teaching of subjects and about the programme designed for enhancing responsibility of teachers and students in the coming academic year.

# ƏNƏNƏLƏR YAŞAYIR

**Valeh Salehov**
***İsmayıllı Rayon İcra Hakimiyyətinin baş məsləhətçisi***

İsmayıllı rayonu təhsilimizin tarixində həmişə maarifçilik ənənələri olan bir rayon kimi tanınmışdır və bu ənənələr yenə də davam etdirilməkdədir. Bu rayon həmişə Azərbaycan təhsilinin qabaqcıl dəstələrindən biri olmuşdur.

Bu gün Azərbaycan təhsili özünün uğurlu inkişaf mərhələlərini yaşayır. Son illərdə təhsil sahəsində aparılan köklü islahatlar öz müsbət bəhrəsini verməkdədir. Milli təhsilimizə dövlət qayğısı ildən-ilə artır. Bu, ilk növbədə onunla bağlıdır ki, müstəqillik illərində ölkəmizdə təhsilə respublikanın inkişaf strategiyasının prioritet sahəsi kimi baxılır və pedaqoji işçilərə, müəllimlərə, təhsilin təkmilləşdirilməsinə, milli maraqların inkişafına ardıcıl qayğı göstərilir. Bu gün hər yerdə qarşıya qoyulan qlobal vəzifələr gələcək nəsillərin yetişdirilməsində müəllimlərimizin fədakarlıqla çalışmalarının bəhrələri kimi dəyərləndirilir. Ən hərəkətverici stimul, ən razılıq yaradan hal odur ki, müəllim əməyi özünün layiqli qiymətini alır. Səmərəli fəaliyyəti diqqətdə olan, uğurları mükafatlandırılan, əməyinə hörmətlə yanaşılan belə müəllimlər isə daha həvəslə işləyir, dövlətə, dövlətçiliyə ürəkdən bağlanır, onun yürütdüyü siyasətin həyata keçirilməsində aparıcı rol oynayırlar.

Təhsil tariximizə nəzər salanda, XX minillikdə Azərbaycanda elm, sənət, maarif və mədəniyyətimizin inkişafı yolunda çalışan şəxslərin danılmaz xidmətləri yada düşür. Məhz onların gərgin əməyi sayəsində həm milli, həm də dünyəvi dəyərlərin önəmini dərindən anlayan şəxsiyyətlər yetişmiş və onlar Azərbaycanımızı tanıtmışlar. Ölkəmizin təhsil sahəsindəki nailiyyətləri bütün dünyada qəbul olunur. İndi Azərbaycan əhalisi savadlılığına görə liderlər sırasındadır. 15 yaşından yuxarı əhalisinin oxuyub-yazmaq bacarığına görə Azərbaycan 99, 8 faiz göstərici ilə keçmiş sovet ölkələri sırasında Latviya və Estoniya ilə bir cərgədədir. Bu sahədə Azərbaycan qonşu Rusiya, Gürcüstan, Türkiyə, İran və Ermənistanı qabaqlayır. Əlbəttə, bu işdə təhsil fədailərimizin xidmətləri az olmamışdır. Yüz il ərzində çəkilən belə zəhmətlər XXI əsrdə də öz bəhrəsini göstərmişdir.

Bu baxımdan İsmayıllı rayonu öz keçmişi ilə də fəxr edə bilər. Hələ XX əsrin əvvəllərində Fərhad Ağazadə, Camo bəy Cəbrayılbəyli, Abdulla Şaiq, Hüseyn Cavid, Ağa bəy İsrafilov kimi maarif xadimləri ilə dostluq və əməkdaşlıq edən və ilk təhsilin İsmayıllıda alan həmyerlimiz Qafur Rəşad Mirzəzadə (1884-1943) pedaqoji mətbuatın ilk qaranquşlarından olan "Məktəb" (1911-1920) jurnalının təsisçisi olmuş, Azərbaycan Xalq Cümhuriyyəti dönəmində bir sıra yeni dərsliklərin hazırlanmasında fəal iştirak etmişdir. Qafur Rəşad həm də uşaqların dünyagörüşünün genişlənməsində, əxlaqi və mənəvi inkişafında mühüm rol oynayan hekayələr yazmışdır. Onun coğrafiyaya dair kitabları və dərslikləri bu gün də tədqiqatçıların istinad etdiyi mənbələrdəndir. Ötən əsrin 30-40-cı illərində Qafur Rəşad İsmayıllı təhsilinə bir sıra əməli köməkliklər də etmişdir. Pedaqoji fikir tariximizdən bəhs edən tədqiqatlarda onun adı hörmətlə çəkilir.

Uzun müddət İsmayıllı maarifinə başçılıq etmiş, pedaqoji elmlər namizədi

İsrayıl Həsənov onun haqqında çox maraqlı fikirlər söyləyərdi. İsmayıllılar bilirdilər və indi də bilirlər ki, onların bugünkü uğurları quru yerdə yaranmamışdır. Sovet dövründə də belə cəfakeş maarif fədailərimiz az olmamışdır. Məhz, təhsil fədailərinin ağır və şərəfli zəhmətlərinin nəticəsidir ki, rayonumuzda bacarıqlı təhsil xadimlərimiz yetişmişdir. Ölkəmizin pedaqoji mətbuatında onların adları çəkilir, məqalələri çap olunur. İsmayıllı məktəblərində çalışan müəllimlərin böyük əksəriyyəti indi də öz şərəfli vəzifələrinin öhdəsindən layiqincə gəlir, müqəddəs müəllim adını və şərəfini uca tutmağa səy göstərirlər.

Elə bu məqamda müəllimlərin təltifindən, mükafatlandırılmasından fərəhlə söz açmaq yerinə düşər. Hər il rayonumuzun bir neçə müəllimi müxtəlif təltiflərə layiq görülür. Bir faktı vurğulamaq kifayət edər ki, 2009-2010-cu tədris ilində respublikada keçirilən "Ən yaxşı ümumtəhsil məktəbi" və "Ən yaxşı müəllim" müsabiqələrinin nəticələrinə görə, İsmayıllı rayonu daha çox fərqlənmişdir. Belə ki, bu müsabiqədə rayonumuzun 4 məktəbi "Ən yaxşı ümumtəhsil müəssisəsi" və 3 müəllimi "Ən yaxşı müəllim" adlarına layiq görülmüşdür.

Belə uğurlar 2013-cü il də olmuşdur: şəhər 1 nömrəli, Lahıc qəsəbə və Talıstan kənd tam orta məktəbləri "Ən yaxşı ümumtəhsil müəssisəsi" müsabiqəsində qalib sayılmışlar. "Ən yaxşı müəllim" müsabiqəsində rayonumuzdan olan 4 müəllimin qalib gəlməsi və cənab Prezidentin sərəncamı ilə mükafatlandırılması bir daha onun sübutudur ki, İsmayıllı təhsili yüksəlişə doğru inamla addımlayır. Müsabiqənin keçirildiyi 6 il ərzində rayonumuzun 19 tam orta məktəbi "Ən yaxşı ümumtəhsil müəssisəsi", 16 müəllimimiz isə "Ən yaxşı müəllim" müsabiqəsinin qalibi sayılmışdır.

Cari ildə müəllimlərimizdən ən yaxşıları "Əməkdar müəllim" adına layiq görülüb, müxtəlif müsabiqə qalibləri kimi mükafatlar alıb. Ən yaxşı fənn müəllimləri və pedaqoji sahənin digər işçiləri üçün rayon müsabiqəsi elan olunmuş, direktorlardan başlamış laboranta qədər 24 nəfər qalib müəyyənləşdirilmiş və mükafatlandırılmışlar.

Bu uğurların səbəblərini onda axtarmaq lazımdır ki, rayonda yeni fənn kurikulumlarının tətbiqinə keçidlə əlaqədar başlanan prosesin təşkilinə ardıcıl fikir verilir, V, VI siniflərdə dərs demək kifayət qədər səriştəli və yüksək peşəkarlıq səviyyəsinə malik müəllimlərə tapşırılır. 2008-ci ildən başlayan ibtidai sinif müəllimlərinin kurslardan keçirilməsi də başa çatdırılmış, təhsil müəssisələrinin rəhbər və pedaqoji kadrlarının ayrı-ayrı kateqoriyalarının ixtisasartırma kurslarından keçməsi təşkil edilmiş, məktəblərin zəruri texniki vəsaitlərlə (kompyuter, notbuk, proyektor) təchizatı işi yaxşılaşdırılmışdır. Tədris prosesində istifadə olunan informasiya texnologiyaları şagirdlərin təqdimat bacarıqlarının inkişafına şərait yaradır, maraq dairəsini genişləndirir, təlimin motivasiyasını yüksəldir, şagirdlərin sərbəst və yaradıcı işlərini aktivləşdirir. Bununla da uğurlarımız ildən-ilə artır.

Təhsilin yüksəlişi bu sahədə mükəmməl infrasturukturun yaradılmasından, maddi-texniki bazadan, xüsusən müasir tələblərə cavab verən məktəb binalarından da asılıdır. Bu baxımdan rayonumuzda məktəblərin maddi-tədris bazası da möhkəmləndirilir. Son illərdə rayonda 18 yeni məktəb binası tikilib istifadəyə verilmişdir. Dövlət vəsaiti hesabına Müdrü, Yeniyol kənd tam orta, Mücü kənd ümumi orta məktəblərinin hər biri üçün 80 şagird yerlik, Pirəbilqasım kənd ibtidai məktəbi üçün 40 şagird yerlik məktəb binalarının yeni dərs ili ərəfəsində istifadəyə verilməsi də bu qəbildən olan nailiyyətlərimizdəndir.

Azərbaycan Respublikası Nazirlər

Kabinetinin 17 dekabr 2010-cu il tarixli 239 nömrəli qərarı ilə turizm və xidmət sahələri üçün ixtisaslı kadrların hazırlaşmasının təşkil edilməsi məqsədilə İsmayıllı Peşə Tədrisi Mərkəzi yaradılmışdır.

İsmayıllı şəhərində 140 yerlik yeni uşaq bağçası – körpələr evi tikilmişdir. Yaponiya səfirliyinin maliyyə dəstəyi ilə İsmayıllı şəhərində 40 yerlik uşaq bağçası da inşa edilmişdir. Pilot rayonu kimi İsmayıllı həmişə diqqət mərkəzindədir. Ona görə də, təhsilə göstərilən yüksək dövlət qayğısı öz müsbət nəticələrini verməkdədir. Ümumi təhsilin dövlət və cəmiyyət qarşısında ən mühüm vəzifələrindən biri də ayrı-ayrı sahələr üzrə istedadlı, xüsusi qabiliyyətilə fərqlənən şagirdlərin vaxtında aşkara çıxarılması və onların davamlı inkişafı üçün lazımi şəraitin yaradılmasıdır. Ulu öndərimiz Heydər Əliyevin sözləri ilə desək “Gələcək biliyin, elmin və istedadlı insanların çiyinləri üstə qurulur”. “Xüsusi istedada malik olan uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Praqramı” nın yerinə yetirilməsi istiqamətində rayonumuzda məqsədyönlü tədbirlər həyata keçirilmiş, istedadlı şagirdlərin uğurları ildən-ilə yüksəlmişdir. Şagirdlər ciddi sınaqlar qarşısında özlərini doğrultmuşdur.

Fənn olimpiadalarının respublika mərhələsində 8 nəfər qalibimizin olması ölkə üzrə ən yüksək göstəricilərdəndir. Ölkə üzrə keçirilən bilik yarışları şagirdlərimizi ruhlandırır.

Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının mərkəzləşdirilmiş qaydada keçirdiyi buraxılış imtahanlarında rayonumuzun məktəbliləri yüksək bilik səviyyəsi nümayiş etdirmişlər. Təhsildə qazandığı uğurlara görə Lahıc qəsəbə tam orta məktəbin məzunu Bayramlı Almaz, Təzəkənd kənd tam orta məktəbin məzunları Ağazadə Aydan, Alızadə Ramtik və Şahlarlı Murad qızıl medal almışlar.

Ali məktəblərə qəbul sahəsində rayon məktəblərinin məzunlarının uğurlu nəticələri də sevindiricidir. TQDK-nın dərc etdiyi rəsmi məlumatlara əsasən 2012-ci ildə ali məktəblərə keçirilən qəbul imtahanlarında rayonumuzun nəticəsi respublikada dördüncü, yüksək bal toplamış abituriyentlərin nisbətinə görə isə ikinci olmuşdur.

Məzunlarımızın riyaziyyat fənni üzrə göstəricisi respublikada ön sıradadır. Ana dili, ədəbiyyat, biologiya, fransız dili, kimya, fizika, coğrafiya fənlərindən məzunlarımızın qazandıqları nəticələr də respublikanın orta göstəricisindən xeyli yüksəkdir.

Rayon abituriyentlərinin qəbul imtahanlarında topladıqları orta bal da respublika üzrə orta göstəricidən yuxarıdır.

Ötən il rayonun 270 nəfər məzunu tələbə adını qazanmışdır. Onlardan 11 nəfər 600-dən yuxarı, 44 nəfər 500-600 arasında bal toplamışdır. Lahıc qəsəbə tam orta məktəbin məzunu Əlili Əliqulu qəbul imtahanlarında qazandığı yüksək nəticəyə görə Prezident təqaüdünə layiq görülmüşdür.

Ali məktəblərə tələbə qəbulunda cari ildə qazanılan nəticələr daha yüksəkdir. 320 nəfərdən artıq məzunumuz ali məktəblərə qəbul olmuşdur. Onlardan 21 nəfər 600-dən yuxarı, 52 nəfər isə 500-600 arasında bal toplamışdır.

Ali məktəblərə tələbə qəbulu imtahanlarında qazandıqları yüksək nəticələrə görə şəhər 1 nömrəli tam orta məktəbin məzunu Cəbiyeva Aygün, Təzəkənd kənd tam orta məktəbin məzunları Ağazadə Aydan və Ələkbərov Aqil, Cülyan kənd tam orta məktəbin məzunu Əmirxanlı Ceyhun Prezident təqaüdünə layiq görülmüşlər.

Ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş inşa yazı müsabiqəsinin rayon mərhələsinin qalibi, Cülyan kənd tam orta məktəbinin XI sinif şagirdi Fərmanlı Gülqədəm müsabiqənin Respublika mərhələsində də müvəffəqiyyətlə iştirak

edərək qaliblər sırasında yer tutmuş, Təhsil Nazirliyinin, Heydər Əliyev Fondunun və Yeni Azərbaycan Partiyasının qiymətli hədiyyələri ilə təltif edilmişlər.

Akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyi ilə əlaqədar "Ana müqəddəslik zirvəsidir" mövzusunda keçirilən inşa yazı müsabiqəsinin respublika mərhələsində isə şəhər 5 nömrəli tam orta məktəbin şagirdi Bağırlı Aysel həvəsləndirici yer tutmuşdur.

Şəhər 1 nömrəli tam orta məktəbin müəllimi Pərvanə Piriyeva ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi ilə əlaqədar müəllimlər arasında "Dövlətim üçün layiqli vətəndaş yetişdirirəm" adlı yazı - məqalə respublika müsabiqəsində I yer tutmuşdur.

Təhsil Nazirliyinin keçirdiyi "Elektron təhsil" müsabiqəsində şəhər 2 nömrəli tam orta məktəbin müəllimi Dünyabəyim Eminova I yer, Cülyan kənd tam orta məktəbin müəllimi Şərafət Bayramov III yer tutmuşdur.

"Bir şagird - bir kompyuter" müsabiqəsində şəhər 1 nömrəli tam orta məktəbin müəllimi Bahar Abdullayeva və Lahıc qəsəbə tam orta məktəbin müəllimi Rövşən Əliyev qaliblər sırasını sıxlaşdırmışlar.

"Fövqəladə Hallar uşaqların gözü ilə" adlı dekorativ, yaradıcı, texniki və intellektual Respublika müsabiqəsində Uşaq Yaradıcılıq Mərkəzinin 7 nəfər dərnək üzvü qaliblər sırasında yer tutmuşlar.

EKOERUDİT məktəblilərin Respublika ekoloji Breynrrinq bilik yarışının I müsabiqəsinin respublika turunda Təzəkənd kənd tam orta məktəbinin "Babadağ" komandası II yer tutumuşdur.

Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Dövlət Bayrağı Meydanı Kompleksi Təşkilatının keçirdiyi "Bayrağımız qürur mənbəyimizdir" mövzusunda rəsm müsabiqəsində şəhər 1, 3, 5 və 6 nömrəli tam orta məktəblərin şagirdləri qaliblər sırasında olmuşlar.

Göründüyü kimi, İsmayıllı təhsil işçilərinin uğurlarımızdan sevinməyə, daha xoşbəxt sabahımızdan danışmağa haqları çatır. Onları yeni-yeni uğurlar gözləyir. İsmayıllı təhsilinin sabahı da bu günü kimi parlaq olacaqdır. Rayonun ayrı-ayrı məktəblərində də ölkə səviyyəsinə çıxarılacaq yeniliklərimiz çoxdur. Hazırda bu sahədə rayonda geniş iş aparılır. Onların bu işlərinin düzgün istiqamətləndirilməsində RİH yaxından iştirak edir. Uzun müddət təhsil sahəsində çalışan, kollec direktoru, ali məktəblərdə prorektor, rektor kimi vəzifələrdə işləyən, rayonumuzu çox yaxşı tanıyan icra başçımız professor Mirdaməd Seyidovun təhsilimizə qayğısı yeni-yeni uğurların qazanılacağına ümid və şərait yaradır. İsmayıllı təhsilinin sağlam, işgüzar kollektivləri əldə olunan nailiyyətlərlə arxayınlaşmır, öz vəzifələrini daha əzmlə icra etməyi özlərinin şərəfli işi bilirlər.

Qeyd etmək lazımdır ki, hazırda rayonumuzun təhsil ocaqlarında yüksək bilikli, geniş dünyagörüşünə malik, vətənpərvər insanların yetişməsi üçün münbit şərait yaradılmışdır. Bunlar isə ancaq ilk növbədə, təhsil sistemimizdə aparılan köklü islahatlar, onillik təhsil sisteminin dünya standartlarına uyğun təşkil edilməsilə bağlı aktual problemlərə ölkə rəhbərinin gündəlik diqqət və qayğı göstərməsi ilə mümkün olmuşdur. Bunlar isə, ilk növbədə yüksək intellektə malik insanın formalaşmasına xidmət edir.

Əminik ki, İsmayıllı təhsil işçiləri gənc nəslin mənəvi-fiziki tərbiyəsinin günün məktəbləri səviyyəsinə qaldırılmasında qüvvələrini əsirgəməyəcək, müstəqil Azərbaycanın şərəfli adını uca tutacaqlar.

*Rəyçi: dos. N.Nəcəfov*

# DÖVLƏTİMİZİN QAYĞISI BİZİ RUHLANDIRIR

**Nadir Ağayev**
***Abşeron Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *müəllim, şagird, təlim, tərbiyə, dərs.*
***Ключевые слова:*** *учитель, ученик, учеба, воспитание, урок.*
***Key words:*** *teacher, student, training, upbringing, lesson.*

Azərbaycan dövlətinin təhsil siyasətinə müvafiq olaraq ölkəmizdə təhsilə qayğısı günü-gündən artır. Məktəblərin madditədris bazası möhkəmləndirilir, pedaqoji kadrlarla təminat yaxşılaşır, təlimin keyfiyyətinin yüksəldilməsi üçün əsaslı, köklü islahatlar aparılır. Məlumdur ki, hər bir cəmiyyətin inkişafında milli təhsil və onun inkişafı həmişə diqqət mərkəzində olmuşdur. Təhsil cəmiyyətin bütün sahələrinin inkişafına təsir göstərən, onu uğurlu bir istiqamətə yönəldən və mütərəqqi ənənələrə söykənməklə nailiyyətlərə doğru aparan amillərdən biridir. Bu gün Azərbaycan cəmiyyətində bütün sahələrdə olduğu kimi, təhsildə də əsaslı dəyişikliklər baş verir. Bu dəyişikliklər özünün ictimai, iqtisadi, mədəni xarakteri ilə daha dərin köklərə malik olduğunu göstərir. Azərbaycanın təhsillə bağlı tarixi ənənələri, xüsusən, ümumilli liderimiz Heydər Əliyevin keçən əsrin 70-80-ci illərində respublikamızda quruculuq işlərinə böyük qayğı göstərməsi bugünkü təhsilimizin inkişafında mühüm rol oynamışdır. Ulu öndər Heydər Əliyevin "Təhsil millətin gələcəyidir" fikri təhsil sahəsində fəaliyyət göstərən hər kəs üçün bir deviz kimi səslənir.

Təhsil alan hər kəsin həyat yolu məktəb mərhələsindən keçir. Bu mərhələni keçərkən məktəbin ab-havası, özünəməxsus mühiti onların əxlaqi-mənəvi keyfiyyətlərinin, fiziki kamilliyinin formalaşmasına ciddi təsir göstərir.

Son illərdə təhsilin inkişafı, bu sahədə aparılan məqsədyönlü islahatlar, həyata keçirilən proqramlar, beynəlxalq təşkilatlarla səmərəli əməkdaşlıq buna bir daha əyani sübutdur. Məktəbin fəaliyyətini şərtləndirən, bilavasitə təhsilin keyfiyyətinə təsir edən bir sıra amillər vardır. Bunlardan biri müəllim əməyinin stimullaşdırılması, qabaqcıl təcrübənin geniş tətbiqinə imkan yaradılmasıdır. Gənc və təcrübəsiz müəllimlərin yaxşı pedaqoq kimi yetişməsini təmin etmək üçün, məktəblərarası sağlam rəqabəti inkişaf etdirmək zəruridir. Son illərdə qabaqcıl təcrübənin öyrənilməsinə ciddi fikir verilməklə yanaşı, yaradıcı işlərin qiymətləndirilməsinə də diqqət artırılmışdır.

Azərbaycan Respublikası Prezidentinin sərəncamına uyğun olaraq "Ən yaxşı ümumtəhsil məktəbi" və "Ən yaxşı müəllim" müsabiqələrinin keçirilməsi də müəllim əməyinin dövlət tərəfindən stimullaşdırılmasıdır.

Müəllim əməyinə dövlət başçısının verdiyi qiymət rayonumuzun pedaqoji kollektivini də ruhlandırır. Daha böyük nailiyyətlər qazanmaq üçün rayon təhsil şöbəsi ilə ümumtəhsil müəssisələri əməkdaşlıq şəraitində fəaliyyətlərini davam etdirir.

Ötən tədris ilində rayonun təlim-tərbiyə müəssisələrində bir sıra müsbət işlər görülmüş, uğurlu nəticələr əldə edilmişdir.

Belə ki, əsasən, məktəblərdə təlim-tərbiyənin keyfiyyəti yüksəldilmiş, məktəb-ictimaiyyət-valideyn münasibətləri xeyli yaxşılaşdırılmış, təlim-tərbiyə işlərində demokratikləşmə, humanistləşmə və fərdiləşmə prinsiplərinə geniş yer verilmişdir.

Azərbaycan Respublikası Prezidenti cənab İ.Əliyevin müvafiq sərəncamına əsasən ötən dərs ilində keçirilmiş "Ən yaxşı ümumtəhsil məktəbi" və "Ən yaxşı müəllim" müsabiqəsinə rayonumuzun pedaqoji kollektivləri də qoşulmuş və 6 nəfər müsabiqənin iştirakçısı olmuşdur.

Onlardan müsabiqənin yekunlarına görə Xırdalan şəhər 1 nömrəli tam orta məktəbin tarix müəllimi Ülviyyə Musayeva təlim-tərbiyə işlərində yüksək nailiyyətlər əldə etmiş və şagirdlərin savadlı olmasında, vətənpərvərlik ruhunda tərbiyəsi işində yüksək nəticələr əldə etdiyi üçün çoxminlik respublika müəllimləri içərisində "İlin ən yaxşı müəllimi" müsabiqəsinin qalibi olmuşdur.

2011/2012-ci və 2012/2013-cü dərs illəri üzrə şagird artımının təhlili göstərir ki, respublikanın rayonlarından fərqli olaraq, Abşeron rayonunda yeni salınmış yaşayış massivlərinin tikintisi hesabına rayonumuzda şagird artımı yüksək olmuşdur. 2012/2013-cü dərs ilinin əvvəlki illə müqayisəsi göstərir ki, təkcə bir tədris ili ərzində 76 sinif komplektində 1656 nəfər şagird artımı olmuşdur. Bu da böyük bir məktəbin şagird kontingentinə bərabərdir. Yeni dərs ilində bu artımın daha çox olacağı gözlənilir.

Aparılmış təhlil göstərir ki, rayon üzrə məktəblərdə şagird sıxlığı sabit saxlanılmaqla yeni dərs ilində artım 138 sinifdə 3239 nəfər nəzərdə tutulmuşdur.

Şagird artımı nəticəsində şagird sıxlığı yüksəlmiş, Xırdalan şəhər 4 və 7 nömrəli, Mehdiabad 1 və 2 nömrəli məktəblərdə dərslərin 3 növbədə keçirilməsi məcburiyyəti yaranmışdır.

Hal-hazırda bu məktəblərdə şagird sıxlığını azaltmaq istiqamətində lazımi tədbirlər görülməkdədir.

Belə ki, Məhəmmədi kənd tam orta məktəbinin yararsız binası sökülmüş, onun yerində 960 şagird yerlik məktəb binası tikilmiş, Xırdalan şəhər 1, 4 və 7 nömrəli məktəblərdə əlavə tədris korpusları tikilməkdədir. Digər məktəblərdə də bu işlərin aparılması planlaşdırılmışdır. Göradil və Perekeşkül tam orta məktəbində əsaslı təmir işləri aparılır, yeni məktəblər istisna olmaqla, digər məktəblərimizdə mövcud kimya, biologiya və fizika laboratoriyaları Nazirlik tərəfindən quraşdırılır. Rayonun məktəb kitabxanalarına bütövlükdə 98 adda 93335 ədəd dərsliklər alınmış və şagirdlərə paylanmışdır. Hal-hazırda 57 adda 43189 ədəd dərslik alınıb məktəb kitabxanalarına verilmişdir.

İl ərzində təlim-tərbiyə müəssisələrində genişmiqyaslı təmir-tikinti işləri aparılmış, tədris müəssisələrinin yeni dərs ilinə hazırlığın vəziyyəti diqqət mərkəzində olmuş, mövcud vəziyyət dəfələrlə rayonda çağırılan müşavirələrdə müzakirə edilmiş, problemlərin həllinə yaxından köməklik göstərilmişdir.

2012-2013-cü dərs ilinin sonunda ümumtəhsil məktəblərinin XI siniflərində 1485 nəfər məzundan 1461 nəfəri tam orta təhsil haqqında attestat almışdır. Ötən il 98,4% XI sinif məzunu tam orta təhsili başa vurmuşdur.

2012-2013-cü dərs ilində rayonun Saray qəsəbə 3 nömrəli tam orta məktəbin məzunu Nəsirova Günay və Xırdalan 3 nömrəli tam orta məktəbin məzunu Cəbiyeva Güləndam təlim və tərbiyədə yüksək nailiyyətlərinə görə qızıl medala layiq görülmüşlər. Onlar ali məktəblərə yüksək ballarla qəbul olaraq aldıqları qızıl medalları doğrultmuşlar.

Zamanın tələbi şagirdlərə keyfiyyətli biliklər verməkdir. Təlim keyfiyyətini qal-

dırmaq istiqamətində rayonun çoxsaylı pedaqoji kollektivləri ciddi çalışır, müntəzəm olaraq təlimə yeni texnologiya və metodları tətbiq etməklə işlərini qurur. Bu da sözsüz ki, öz nəticəsini verir.

2012-2013-cü dərs ili məzunlarının ali məktəblərə qəbulu keçən illərə nisbətən yüksək olmuşdur. Belə ki, bu il ali məktəblərə 1102 nəfər sənəd vermiş, onlardan 672 nəfər tələbə adını qazanmışdır. Ali məktəblərə sənəd vermiş məzunların 60,9% tələbə adına layiq görülmüşdür. Bu da keçən dərs ili ilə müqayisədə 11,5% çox qəbul deməkdir.

Ali məktəblərə qəbulda rayonun orta göstəricisindən yüksək olan və ona bərabər məktəblərə müvafiq olaraq Ceyranbatan qəsəbə 2 nömrəli (90,9%), Fatmayi kənd tam orta məktəbi (90%), Xırdalan şəhər 2 nömrəli (75%), Xırdalan şəhər 9 nömrəli (75%), Məhəmmədi kənd tam orta məktəbi (72,4%), Mehdiabad qəsəbə 3 nömrəli (68,2%), Xırdalan şəhər 3 nömrəli (63,2%), Xırdalan şəhər 5 nömrəli (65%), Qobu qəsəbə 1 nömrəli (61,9%), Masazır 2 nömrəli (69,2%), Xırdalan 1 nömrəli (62,3%), Qobu qəsəbə 2 nömrəli (61,5%) məktəbləri olmuşdur.

Keçən dərs ilindən fərqli olaraq bu il ali məktəblərə qəbul zamanı 600 və ondan yuxarı bal toplayan məzunlarımızın sayı artmışdır. Ümumtəhsil məktəbləri üzrə 600-dən yüksək bal toplayan 16 nəfər olmuşdur ki, bu da keçən ilkindən 5 nəfər çoxdur.

Təqdirəlayiqdir ki, öz işlərini düzgün quran, müasir tələblər səviyyəsində dərs keçən və təlim-tərbiyə işlərində yüksək nəticələri olan müəllimlərimiz çoxdur.

Xüsusi ilə qeyd edilməlidir ki, Xırdalan şəhər 3 nömrəli məktəb-liseyin 16 nəfər məzunu ali məktəblərə qəbul üçün sənəd vermiş, onlardan 15 nəfəri tələbə adını almışlar.

Xırdalan şəhər 9 nömrəli tam orta məktəbin məzunlarından ali məktəblərə 19 nəfər sənəd vermiş və onların hamısı ali məktəbə qəbul olmuşlar. Bu sinfin şagirdlərindən 2 nəfəri 600-dən yüksək bal toplamış, bir nəfər məzun Həsənli Cahid Sərbəst güləş üzrə Dünya birinciliyinin mükafatçısı olduğu üçün Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə Azərbaycan İdman Akademiyasına imtahansız qəbul olmuşdur.

RTŞ bu istiqamətdə məqsədyönlü işlər aparır. Belə ki, keçən dərs ilində mütəmadi olaraq tədris fənləri üzrə aylıqlar keçirilmiş, burada məqsəd fənnin tədrisində müsbət və mənfi cəhətləri aşkar edib, müəllimlərə elmi-metodiki köməklik göstərməkdən ibarət olmuşdur. Aylığın sonunda 2 müəllim, Mehdiabad tam orta məktəbin biologiya müəllimi Ələkbərova Narınc, 5 nömrəli məktəbin kimya müəllimi Atayeva Şiranə qalib olmuş və hər iki müəllim 500 manat pul mükafatı almışlar.

Ümummilli liderimiz Heydər Əliyevin dediyi kimi “Təhsil sahəsi hamınızın ən gərəkli, ən mühüm sahəsidir. Bu gərəkli sahə zaman keçdikcə dövrün tələblərinə uyğun yeniləşməlidir”. Rayon Təhsil Şöbəsi bu vacib fikri əldə rəhbər tutaraq bir sıra tədbirləri həyata keçirmişdir. Belə ki, elmi-metodiki səviyyələrini yüksəltmək üçün rayon müəllimləri müntəzəm olaraq ixtisasartırma kursuna cəlb edilmiş, məktəblərdə tədris fənləri üzrə “dayaq məntəqələri” yaradılmış, qabaqcıl müəllimlərdən “öyrədənlərin öyrədənləri” proqramı üzrə hazırlıq kursları təşkil edilmişdir.

Aparılmış təhlillərin nəticəsində müəyyən olunmuşdur ki, tədrisin səviyyəsi aşağı olduğu məktəblərdə məktəb rəhbərliyi məktəbdaxili nəzarət xətti ilə təsirli tədbirlər görməmiş, metodiki işlər lazımi səviyyədə aparılmamış, müəllim və şagirdlərin dərslərə hazırlığına zəif nəzarət etmişlər.

Həm rayon təhsil şöbəsi tərəfindən aparılmış inspektor yoxlamaların, həm də

aparılmış müşahidələrin nəticələri Rayon Təhsil Şurası iclasında geniş müzakirə edilmiş və müvafiq qərarlar qəbul edilmişdir.

İstedadlı uşaqlarla iş Təhsil Şöbəsinin diqqət mərkəzində olmuşdur. Bu məqsədlə rayonda "olimpiadaya hazırlıq mərkəzi" yaradılmışdır. Mərkəzə səriştəli və peşəkar müəllimlər cəlb edilmişdir. Keçirilən məqsədyönlü tədbirlərin nəticəsində olimpiada iştirakçılarının sayı ilbəil artmışdır. Əvvəlki illərə nisbətən 2012-2013-cü dərs ilində iştirakçıların sayı və fəallıqları yüksəlmişdir. Rayon turunun II mərhələsində iştirak edən 120 nəfərdən 24 nəfər şagird respublika turuna göndərilmiş və 8 nəfəri II-IV yerləri tutmuşlar.

Azərbaycan Dövlətinin qurucusu, görkəmli dövlət xadimi və siyasətçi Heydər Əliyevin nəsillərə nümunə olan mənalı ömür yolu, həyat fəaliyyəti, zəngin yazılı irsi ilə şagirdlər sistemli şəkildə tanış edilmiş, 10 may tarixində məktəblərdə ilk dərslər ulu öndərin həyat və fəaliyyətinə həsr edilmiş, "Heydər Əliyev Lektoriyaları" yaradılmış, onun mənəvi–milli dəyərli fikirləri təbliğ edilmiş, şagirdlər arasında "Dahi rəhbər Heydər Əliyev haqqında bildiklərim" mövzusunda inşa, şeir və rəsm və s. müsabiqələri keçirilmişdir.

Tanınmış şair və yazıçıların yubileyləri ilə əlaqədar rayonun bütün təhsil müəssisələrində tədbirlər keçirilmiş, onların həyat və yaradıcılığı ilə şagirdlər yaxından tanış olmuşlar.

Beynəlxalq Uşaqların Müdafiə Günü münasibətilə rayonun mədəniyyət evində təbdirlər keçirilmiş, uşaqların əl işlərindən ibarət sərgi təşkil olunmuşdur.

Gənc nəslin təlim-tərbiyəsi sahəsində yüksək nəticələr əldə etmiş pedaqoji işçilərin əməyi yüksək qiymətləndirilmiş və bir qrup qabaqcıl müəllimlər Fəxri fərmanlarla təltif edilmişdir. Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə Güzdək qəsəbə tam orta məktəbin müəllimi Bədəlov Orucəli, Novxanı kənd 1 nömrəli tam orta məktəbin direktoru Mirzəyeva Taliyyə, Saray qəsəbə 14 nömrəli uşaq bağçasının müdirəsi Sadıqova Məhbubə əməkdar müəllim adına layiq görülmüşlər.

Təhsil sahəsi üzrə nailiyyətlərimiz ilbəil artmaqdadır. Belə ki, son yeddi ildə rayonumuzda 15 ümumtəhsil məktəbi üçün yeni bina, 2 tədris korpusunun tikilməsi, məktəblərdə təmir işlərinin aparılması, 3 məktəbin "İlin məktəbi", 7 müəllimin "İlin müəllimi",18 nəfərin "Əməkdar müəllim" adını alması, 9 nəfər müəllimin "Tərəqqi" medalına layiq görülməsi, habelə idmançılarımızın ölkə, Dünya və Beynəlxalq idman yarışlarında müvəffəqiyyət qazanması rayon təhsil işçilərinin rayonumuzun yaranmasının 50 illik yubileyinə gözəl töhfəsi olmuşdur.

Şagirdlərin asudə vaxtlarının səmərəli təşkili, fiziki hazırlığı həmişə diqqət mərkəzində olmuş və bu gün də diqqət mərkəzində durur.

Rayonun Uşaq Gənclər İdman Məktəbinin uğurları böyük olmuşdur. Belə ki, UGİM-nin sərbəst güləş bölməsinin güləşçiləri təkcə 2013-cü ildə ölkə birinciliyində 2 nəfəri I yer, 8 nəfəri isə III yerləri tutmuşlar. Dünya və Beynəlxalq turnirlərdə də güləşçilərimizin uğurları böyük olmuşdur.

Böyük iftixar hissi ilə qeyd etmək istəyirəm ki, Xırdalan şəhər 1 nömrəli tam orta məktəbin II sinif şagirdi Aslanov Ümüd Şahmat üzrə Avropa Çempionatında I yeri tutaraq, fəxri kürsünün ən yüksək pilləsinə qalxmış, Azərbaycanın bayrağını yüksəklərə qaldıraraq, Azərbaycan dövlət himnini səsləndirmişdir.

Məktəbdənkənar müəssisələrdən Gənc Texniklər Stansiyası və Ekoloji Tərbiyə Mərkəzi fəaliyyət planında olan tədbirləri həyata keçirmiş, bir sıra zona və respublika yarış və müsabiqələrdə iştirak etmiş, diplom

və mükafatlar almışlar.

"Novruz" bayramının rayonda mütəşəkkil keçirilməsi üçün təhsil müəssisələri tədbirlər planı tərtib etmiş, mərasimin planlı keçirilməsi məqsədilə tədbirlər planı hazırlanmışdır. 19 mart tarixində rayonun H.Əliyev parkında keçirilmiş ümumrayon tədbirlərində rayonun bütün təhsil müəssisələri iştirak etmiş, şagirdlərin əl işlərindən ibarət sərgilər təşkil edilmişdir. 31 Mart Azərbaycanlıların soyqırımına həsr edilmiş pedaqoji işçilərin elmi-praktik konfransı keçirilmiş, müəllimlərin məruzələri dinlənilmişdir.

Məktəblər soyqırım ilə əlaqədar tədbirlər keçirmiş, dərslərdə şagirdlərə onun mahiyyəti açıqlanmış, soyqırımın coğrafiyası, masştabı və azərbaycan xalqına qarşı aparılmış düşünülmüş məkrli siyasətin mahiyyəti izah edilmişdir.

Akademik Zərifə Əliyevanın 90 illik yubileyi ilə əlaqədar geniş tədbirlər planı tərtib edilmiş, inşa müsabiqəsi keçirilmişdir. Şagirdlər arasında qaliblər müəyyən olunmuşdur. Ceyranbatan qəsəbə 1 nömrəli tam orta məktəbin XI sinif şagirdi Mahir Şəbiyevin inşa yazısı rayon üzrə I yeri tutmuş və respublika müsabiqəsində baxılmaq üçün onun inşası Təhsil Nazirliyinə, Ailə Qadın və Uşaq problemləri üzrə Dövlət Komitəsinə göndərilmişdir.

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin anadan olmasının 90 illik yubileyi ilə əlaqədar rayon məktəblərinin IX-XI sinif şagirdlərinin iştirakı ilə inşa müsabiqəsi keçirilmişdir. Müsabiqədə I yerin qalibi Saray qəsəbəsi 3 nömrəli tam orta məktəbin X sinif şagirdi Qənirə Vəlizadə olmuşdur. Həmin yazı işi müsabiqədə baxılmaq üçün Təhsil Nazirliyinə göndərilmişdir.

Eləcə də "İşğal olunmuş rayonların tarixi və coğrafiyası haqqında nə bilirik?" mövzusunda rayon məktəbləri komandaları arasında bilik yarışı keçirilmiş, Xırdalan şəhər 1, 2, 3, 6, 7 nömrəli, Saray 1 və 3 nömrəli, Qobu 1 və 2 nömrəli, Novxanı 1 nömrəli məktəblərin komandaları fərqlənmişlər. Xırdalan şəhər 7 nömrəli məktəbin komandası I, Xırdalan 2 nömrəli məktəbin komandası II və Xırdalan şəhər 1 nömrəli məktəbin komandası III yerləri tutmuşlar. Qalib komandalar RTŞ-in diplomu və hədiyyələrlə təltif edilmişlər.

Respublika və rayon rəhbərliyinin təhsil işçilərinin qarşısına qoyduqları vəzifələri keyfiyyətlə yerinə yetirməsi üçün Rayon Təhsil Şöbəsi və onun aparatı fəal mövqe tutur, nöqsan və çatışmazlıqların aradan qaldırılması üçün konkret tədbirlər həyata keçilir. Bu istiqamətdə işlər bu gün də davam etdirilir. Nəticədə təlim-tərbiyə sahəsində nailiyyətlərimiz ilbəil yüksəlir. Bununla yanaşı rayonun ümumtəhsil məktəblərində təhsil dövlət standartları səviyyəsində qurulur, məktəblərdə təlim-tərbiyə işləri metodiki baxımdan düzgün təşkil edilir, nazirlik tərəfindən verilmiş əmr və sərəncamlar tədris müəssisələrinə vaxtında çatdırılır və onların icra vəziyyəti müntəzəm olaraq öyrənilir və təhlil edilir.

*Rəyçi: dos. N.Nəcəfov*

**Н.Агаев**

**Забота государства вдохновляет нас**

**Резюме**

В статье говорится об удачах реформы образования, о применении курикулума. Автор обосновывает свои мысли на примерах Абшеронского района.

**N.Agayev**

**State care encourages us**

**Summary**

In the article it is spoken about the successes of educational reforms and implementation of curriculum. The author supports his ideas with the examples from Absheron region.

# KEYFİYYƏTLİ TƏHSİL GÜNÜN TƏLƏBİDİR

**Ramiz Əmirov**
***İmişli Rayon Təhsil Şöbəsinin müdiri, əməkdar müəllim***

***Açar sözlər:*** *məktəb, şagird, müəllim, təlim-tərbiyə, sinifdənxaric işlər, metod.*
***Ключевые слова:*** *школа, ученик, учитель, учеба и воспитание, внеклассные работы, метод.*
***Key words:*** *school, student, teacher, training, out of school activity, method.*

XXI əsrdə müstəqil Azərbaycan dünyada siyasi cəhətdən ən stabil ölkələr sırasına çıxmış, iqtisadi inkişaf sürətinə görə lider ölkəyə çevrilmiş və nəhayət, ölkəmizdə təhsilin inkişafı üçün hərtərəfli şərait yaradılmışdır.

Artıq neçə illərdir ki, təhsilin mümkün olan zəruri, hüquqi bazası yaradılmış, təhsilin məzmunu və strukturunda müasir dünyanın tələblərinə uyğun dəyişikliklərin aparılması istiqamətində səmərəli işlər görülmüşdür.

Təsadüfi deyildir ki, Azərbaycan Respublikası Prezidentinin 2011-ci il, 11 iyul tarixli sərəncamına əsasən "2011/2021-ci illərdə Azərbaycan təhsilinin inkişafı üzrə Milli Strategiya"nın hazırlanmasına başlanılmışdır. Müstəqil Azərbaycanda informasiya cəmiyyətinin təşəkkülü və biliklərə əsaslanan iqtisadiyyata keçid şəraitində yeni təhsil modelinin qurulmasını təmin edəcək Milli Strategiyanın hazırlanması ölkə rəhbərinin təhsil sahəsinə göstərdiyi müntəzəm diqqət və qayğıya əyani sübutdur. Müasir şəraitdə məktəbin lazımi potensiala malik müəllim kadrları ilə təchizi, onların müasir təlim texnologiyaları ilə işinin təşkili, müəllim-valideyn, müəlim-şagird münasibətlərinin tənzimlənməsi, məktəb psixoloqunun işinin təşkili, və s. də diqqət mərkəzində duran əsas vəzifələrdəndir. Müəllimlərin innovasiyalara yiyələnməsi, treninqlərdə iştirakçılarının təmin edilməsi, eyni bir metodla işləmə prinsiplərindən əl çəkmələrinə nail olunması da bu qəbildəndir. Bir sözlə, təhsil islahatı proqramında deyildiyi kimi, idarəetmənin əsas məqsədi şəxsiyyətin, cəmiyyətin təhsilə olan tələbatını ödəmək üçün həyatımızda aparılan demokratikləşdirmə prosesinə uyğun nəzarət, planlaşdırma, əlaqələndirmə, tənzimləmə funksiyalarının yeni məzmun və formada qurulmasına, yeni idarəetmə modelinə, innovasiyaların tətbiqinə əsaslanmaqdır.

İmişli Rayon Təhsil Şöbəsi tərəfindən həm bu istiqamətdə, həm də 2012/2013-cü dərs ilində "Təhsil Qanunu" və qanunun tətbiq edilməsi ilə bağlı təsdiq olunmuş hüquqi-normativ sənədlərdə irəli gələn vəzifələrin həlli istiqamətində ardıcıl işlər görülmüşdür.

Hazırda rayonda 63 ümumtəhsil məktəbi fəaliyyət göstərir. Bu məktəblərdə 15500-ə qədər şagirdin təlim-tərbiyəsi ilə 1545 müəllim məşğul olur. Müəllimlərin 1180 nəfəri ali, 340 nəfəri orta ixtisas, 25 nəfəri isə ümumi orta təhsillidir. Rayon üzrə müəllimlərin 977 nəfərini (63%) qadınlar təşkil edir.

Ötən dərs ilində pedaqoji kadrların təminatı üzrə məlum "İnkişaf proqramı"nın yerinə yetirilməsi diqqət mərkəzində saxlanılmışdır. 2013/2014-cü dərs ilində rayonumuza Təhsil Nazirliyi tərəfindən 34 müəllim

göndərilmişdir. Onlardan 19 nəfər inkişaf proqramının 1-ci, 15 nəfər isə 2-ci istiqamətləri üzrə rayonun kənd tam orta məktəblərində vakant olan yerlərə təyin olunmuşdur. Rayonumuza gələn müəllimlər hər cür qayğı ilə əhatə olunacaq və onlara lazımi şərait yaradılacaqdır. Ancaq bununla belə, hələ də rayonumuzda əsas ixtisaslar üzrə 76 nəfər müəllimə ciddi ehtiyac vardır.

Məlum olduğu kimi, artıq 3 ildir ki, müəllimlərin işə qəbul olunmasında yeni qaydalar tətbiq olunmuş, onlar Bakı şəhərində imtahan verərək rayon məktəblərində vakant olan yerlərdə işləmək hüququ qazanmışlar. Əlbəttə, bu, çox vacib və əhəmiyyətli bir qaydadır. Bundan sonra təsadüfi adamlar müəllimlər sırasına daxil ola bilməyəcəklər.

2012/2013-cü dərs ilində rayonumuzun təhsil müəssisələrinin maddi-texniki bazasının yaxşılaşdırılması sahəsində xeyli iş görülmüşdür. Belə ki, ötən dərs ilində Hacıbabalı kənd ümumi orta məktəbi üçün 180 yerlik yeni məktəb binası tikilərək istifadəyə verilmiş, Surxanlı 1 nömrəli, Cavadxanlı, Buludlu, Cəfərli kənd 1 nömrəli tam orta məktəblərinin və Şəhər 5 nömrəli məktəb-liseyin binaları yüksək səviyyədə əsaslı təmir edilərək son tamamlama işləri aparılır və yeni dərs ilində istifadəyə veriləcəkdir. Hazırda Ölcələr və Cəfərli kənd 2 nömrəli tam orta məktəbləri üçün yeni məktəb binalarının tikintisinə başlanılmışdır.

2012/2013-cü dərs ilində ümumtəhsil məktəbləri lazımi tədris avadanlıqları və inventarlarla təmin edilmişdir. Yeni dərs ili ərəfəsində Təhsil Nazirliyi tərəfindən 20137 ədəd pulsuz dərsliklər alınaraq rayonun ümumtəhsil məktəblərinə paylanması davam etdirilir. Yenidən çap olunmuş VI sinif dərslikləri Təhsil Nazirliyindən alınaraq məktəblərə paylanacaqdır. Yeni dərs ili başlayana qədər təhsil müəssisələri müxtəlif məktəb sənədləri və sinif jurnalları ilə təmin ediləcəkdir. Hazırda rayonun məktəblərində 493 kompyuter var. 16 məktəb internet şəbəkəsinə qoşulmuşdur. İndi, hər bir təhsil işçisi çalışmalıdır ki, onlardan daha səmərəli istifadə olunsun.

Ötən tədris ilində bir nəfər “Əməkdar müəllim” fəxri adına, Nurulu kənd tam orta məktəbin direktoru Bəşir Məmmədov, Şəhər 1 nömrəli məktəb-liseyin müəllimi Rahilə Şükürova və rayon təhsil şöbəsi metodkabinetinin direktoru Sevdimalı Hüseynov isə “Qabaqcıl təhsil işçisi” döş nişanına layiq görülmüşlər. Ümumiyyətlə, son illərdə rayonumuzda 8 nəfər “əməkdar müəllim” fəxri adına layiq görülmüş, 15 nəfər isə müxtəlif medal və döş nişanı ilə təltif edilmişdir.

Çox sevindirici haldır ki, respublikamızda başqa sahələr kimi, təhsil sahəsi də dövlət tərəfindən hərtərəfli qayğı ilə əhatə olunmuş və daim inkişaf edir.

Respublikada, o cümlədən rayonumuzda təhsil sahəsinə göstərdiyi böyük diqqət və qayğıya görə Respublika Prezidenti cənab İlham Əliyevə və Heydər Əliyev fondunun prezidenti, YUNESKO və USESKO-nun xoşməramlı səfiri, millət vəkili Mehriban xanım Əliyevaya bütün rayon ictimaiyyəti, o cümlədən çoxsaylı təhsil işçiləri adından dərin minnətdarlığımızı bildiririk.

Ötən tədris ili ərzində Rayonda təhsilin səviyyəsini daha da yüksəltmək, pedaqoji kollektivlərə kömək etmək üçün məqsədyönlü tədbirlər həyata keçirilmişdir. Təhsil müəssisələrində təlim-tərbiyə prosesinin vəziyyətini öyrənmək və müvafiq istiqamətlər vermək üçün monitorinq və reydlər təşkil edilmiş, müşahidə olunan nöqsanları vaxtında aradan qaldırmağa çalışmışıq.

Tədris ili ərzində əmək intizamı, şagirdlərin məktəbə gündəlik davamiyyətinin yüksək olması diqqət mərkəzində saxlanılmışdır. Ötən tədris ilində də rayonda məktəb rəhbərləri tərəfindən müəllimlərin dərslərinin necə dinlənilib təhlil edildiyi, hansı tövsiyələr verildiyi nəzarətdə saxlanılmış, bu

barədə hər bir direktora fərdi məsləhətlər verilmşdir. Habelə məktəblərdə müəllimlərin müxtəlif ixtisaslar üzrə "Açıq dərslər"inin dinlənilməsi təşkil olunaraq onlara müvafiq təklif və məsləhətlər verilmişdir.

Məlum olduğu kimi, müasir tədris prosesində fəal, interaktiv təlim metodlarından səmərəli istifadə edilməsinə, dərs prosesinə müəllimlərin yaradıcı yanaşmasına xüsusi əhəmiyyət verilir. Qarşıdakı dərs ilində bu məsələlərə diqqəti daha da artıracağıq. Ümumiyyətlə, bilik, bacarığı ilə müasir tələblərə cavab verməyən müəllimlərlə xudahafizləşməyin vaxtı çatmışdır. Elmi və metodik biliyi artırmadan, müasir texnologiyalardan istifadə etməyi kifayət qədər bacarmadan nailiyyət əldə etmək mümkün deyildir.

Məlum olduğu kimi, ümumtəhsil məktəbi həm də tərbiyə məktəbidir. Unutmamalıyıq ki, cəmiyyətin qurucusu olan bütün vətəndaşlar, ilk növbədə, ailədə, məktəbdə formalaşır. Biz övladlarımızı, məktəbliləri yüksək mənəvi dəyərlərə malik, intellektual, məsuliyyətli, zəngin qabiliyyət və bacarıqlara sahib insanlar kimi yetişdirməliyik. Dəfələrlə qeyd etdiyimiz kimi, uşaqların yüksək səviyyədə tərbiyəsi və təhsili müəllim-valideyn əməkdaşlığından çox asılıdır. Bu mənada məktəbdə tərbiyə işinin təşkilinə bütün təlim-tərbiyə prosesinin kompleks vəzifələri kimi yanaşılmalıdır. Gənc nəslin öz ölkəsinin layiqli vətəndaşı kimi yetişməsində, onun kamil insan kimi formalaşmasında məktəbin həlledici rolu danılmazdır. Şagirdlər insan mənəviyyatına dair ilk məlumatları, öz xalqına mümkün qədər çox fayda vermək ideyasını məhz məktəb illərində qazanırlar. Onlar yetkinlik dövründə bəşəriyyəti narahat edən problemlərə münasibət bəsləməyə istiqamətlənməli, bu qlobal işlərdə fəal eştirak etmək üçün zamanın tələb etdiyi mənəvi dəyərlərə yiyələnməli, iqtisadi, sosial, siyasi və mədəni həyatda özünə yer tutmaq, cəmiyyətdəki demokratik cəhətləri fərqləndirə bilmək, yaşadığı mühitdən baş açmaq üçün hərtərəfli hazırlığa malik olmalıdırlar. Bu mənada mürəkkəb bir quruluşa malik olan məktəb tərbiyə sisteminin daim təkmilləşmə prosesi keçirməsi, onun əsl mahiyyətinin zamanın ruhuna köklənməsi günün tələblərindən sayılır.

Bildiyimiz kimi, son illərdə təhsil sahəsində aparılan yeniliklərdən biri də Milli Kurikulum İslahatlarıdır. Burada dövlətin ümumi təhsillə bağlı siyasəti, cəmiyyətin ehtiyac və tələbatı, eləcə də şagirdlərin maraqları üzvi şəkildə əlaqələndirilir. Şəxsiyyətyönlü yeni təhsil modelində uşaqda həyati bacarıqların formalaşdırılması, onun şəxsiyyət kimi inkişafı ön planda durur. Azərbaycan Respublikası təhsil nazirinin 18.07.2013-cü il tarixli 745 nömrəli əmrinə əsasən 2013/2014-cü tədris ilində İmişli rayonu üzrə ümumtəhsil məktəblərinin ibtidai və V-VI siniflərində dərs deyəcək və indiyədək təlimlərdən keçməyən müəllimlər üçün fənn kurikulumlarının tətbiqi üzrə təlim kurslarının təşkilinə ciddi hazırlıq işləri görülmüşdür. Təlimlərə cəlb olunacaq müəllimlərin siyahısı yekun variantda dəqiqləşdirilmiş, məşğələlərin keçirilməsi üçün nəzərdə tutulmuş məktəbdə lazımi şərait yaradılmış, hər bir təlim otağının zəruri texniki vasitələrlə (kompyuter, proyektor və s.) təchiz olunması təmin edilmişdir.

Ötən dərs ilinin yekunları bir daha göstərmişdir ki, yeni kurikulumlarla işin təşkili və onlara uyğun dərsliklərin tətbiqi təlim prosesində şagirdlərin yüksək fəallığının təmin olunması ilə nəticələnmiş, onların məntiqi, tənqidi və yaradıcı təfəkkürlərinin inkişafı sahəsində irəliləyişlərin olduğu müşahidə edilmişdir. Kurikulum islahatı mahiyyət etibarı ilə təhsilin bütün pillələrini əhatə edir. Hazırda V-XI siniflər üçün fənn kurikulumları hazırlanıb başa çatmışdır. Bütün təhsil işçiləri bu kimi yeni sənədləri

tam mənimsəməli və pedaqoji fəaliyyətini bu tələblərə uyğun qurmalıdır.

Ötən müddət ərzində rayonda pedaqoji kollektivlərin iş keyfiyyətini və məsuliyyətini artırmaq üçün məqsədyönlü, planlı tədbirlər həyata keçirilmiş, qarşıya çıxan nöqsanları aradan qaldırmağa çalışmışıq.

Belə ki, ötən dərs ili ərzində rayonun ümumtəhsil məktəblərində sinifdənxaric və məktəbdənkənar işlərin təşkili, Həyati Bacarıqlara Əsaslanan Təhsil kursu, ibtidai siniflərdə yeni fənn kurikulumunun tətbiqi, Mülki Müdafiə işlərinin təşkili, rayon müəllimlərinin informasiya-kommunikasiya texnologiyalarından istifadə bacarıqlarını öyrənmək üçün monitorinqlər aparılmış, nəticələr təhsil şöbəsində geniş təhlil və müzakirə edilərək pedaqoji kollektivlərə və fərdi olaraq ayrı-ayrı müəllimlərə müvafiq tövsiyələr, istiqamətlər verilmişdir. Eyni zamanda, il ərzində məktəblərdə şagirdlərin bilik və bacarıq səviyyəsi, bütövlükdə təlim – tərbiyə işlərinin təşkili vəziyyəti təhsil şöbəsi əməkdaşları tərəfindən öyrənilmişdir.

Ümumtəhsil məktəblərində təlim keyfiyyətini ciddi nəzarətə götürmək, proqram materiallarının şagirdlər tərəfindən mənimsənilməsi səviyyəsini, aşkara çıxarılmış nöqsan və çatışmazlıqların aradan qaldırılması üçün tədbirlər görülməsi istiqamətində ardıcıl iş aparılmışdır. Bu məqsədlə 2012/2013-cü il dərs ilinin I və II yarımillərinin nəticələrinə görə Azərbaycan dili və ədəbiyyatı, Azərbaycan tarixi, riyaziyyat, fizika, kimya, biologiya, coğrafiya, xarici dil fənləri üzrə keyfiyyət göstəriciləri təhlil olunmuş, həmin fənlər üzrə məktəblərin reytinq cədvəli tətbiq olunmuş, yüksək, orta və zəif göstəricisi olan məktəblər müəyyən olunmuşdur.

Ənənəvi olaraq son illərdə olduğu kimi, 2012-2013-cü dərs ilində rayonumuzun 8 nəfər şagirdi olimpiadaların respublika turunda iştirak etmək hüququ qazanmışdır. Şəhər 3 nömrəli tam orta məktəbin XI sinif şagirdi Vüsalə Eynişzadə Azərbaycan dili və ədəbiyyat, şəhər 1 nömrəli məktəb-liseyin IX sinif şagirdi Günəş Mirzəyeva biologiya fənni üzrə 4–cü yeri tutaraq Respublika olimpiadasının qalibi olmuş və Təhsil Nazirliyi tərəfindən müklafatlandırılmışlar.

Ötən tədris ilində ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 90-cı ildönümü münasibətilə məktəblilər arasında müxtəlif nominasiyalar üzrə müsabiqələr, bilik yarışları keçirilmişdir.

Ulu öndərin həyat və fəaliyyətinə həsr olunmuş inşa müsabiqəsində şəhər 1 nömrəli məktəb-liseyin IV sinif şagirdi Əfsanə Abbasova respublika mərhələsində uğurla çıxış edərək Təhsil Nazirliyinin diplomuna layiq görülmüşdür.

Akademik Zərifə Əliyevanın unudulmaz xatirəsinə həsr olunmuş "Ana-müqəddəslik zirvəsi" mövzusunda inşa və əl işləri müsabiqəsi keçirilmişdir. Hər iki nominasiya üzrə qaliblər Azərbaycan Respublikası Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinə göndərilmişdir.

Şəhər 5 nömrəli məktəb-liseyin XI sinif şagirdi Xumar Müslümova "qızıl medal"a layiq görülmüş, qəbul imtahanlarında 642 bal toplayaraq Bakı Dövlət Universitetinə qəbul olmuşdur.

Habelə rayonda ulu öndərin anadan olması ildönümünə həsr olunmuş şahmat, futbol və digər idman yarışları keçirilmişdir. 8-15 aprel 2013-cü il tarixdə keçirilən məktəblərin VII Spartakiadasında İmişli Uşaq Gənclər İdman Məktəbinin futbol komandası 18 rayon komandası arasında II yeri tutmuşdur. Həmin Spartakiadada İmişli Şahmat Məktəbinin komandası da II yeri tutmuşdur.

Rayonumuzun 15 yaşlı qızlardan ibarət futbol komandası isə (məşqçi Ələmdar Mustafayevdir) respublika çempionatında uğurla çıxış edərək I yeri tutmuş, qızıl medala və kuboka layiq görülmüşdür.

Dərs ili ərzində rayon üzrə müxtəlif ixtisas müəllimlərinin ayrı-ayrılıqda seminarı keçirilmiş, mövcud nöqsan və çatışmazlıqların səbəbləri, müvəffəqiyyətin yolları geniş təhlil və müzakirə edilmişdir. Məqsəd hər bir müəllimin pedaqoji iş məsuliyyətini artırmaq olmuşdur.

2012/2013-cü dərs ilində rayonun Təhsil Şöbəsi rayonun ümumtəhsil məktəblərində ümumi və tam orta təhsil kursu üzrə buraxılış imtahanlarına hazırlığı və imtahanların gedişini ciddi nəzarətdə saxlamışdır. Tələbə Qəbulu üzrə Dövlət Komissiyası tərəfindən keçirilmiş test imtahanları nəticəsində IX və XI sinif şagirdlərinin hamısına şəhadətnamə və attestat verilmişdir. Bu təşəbbüs rayonumuzun ictimaiyyəti və təhsil işçiləri tərəfindən yüksək razılıq hissi ilə qarşılanmışdır.

Sevindirici haldır ki, 2013-cü ildə rayon üzrə respublikanın dövlət və özəl ali təhsil müəssisələrinə 263 nəfər qəbul olmuşdur ki, onların da 205 nəfəri 2012/ 2013-cü dərs ilində rayonun tam orta məktəblərini bitirən məzunlardır. Bu da 2013-cü ildə ali məktəblərə qəbul olmaq üçün sənəd vermiş 477 nəfərin 42,7 %-ni təşkil edir. Müqayisə üçün qeyd edim ki, bu il ali məktəblərə qəbul olanların sayı ötən ildəkindən 53 nəfər, 2011-ci ildəkindən 83 nəfər, 2010-cu ildəkindən isə 91 nəfər çox olmuşdur.

Ali məktəblərə qəbulun ən yüksək göstəricisi şəhər 5 nömrəli məktəb-liseyində - 23 nəfər olmuşdur. Şəhər 1 nömrəli məktəb – liseydən 21 nəfər, şəhər 7 nömrəli - 17 nəfər, şəhər 2 nömrəli – 12 nəfər, Məzrəli kənd tam orta məktəbindən - 11 nəfər, şəhər 4 nömrəli və Buludlu kənd tam orta məktəblərinin hər birindən 8 nəfər, şəhər 6 nömrəli, Qızılkənd, N.Abışov adına Qaralar, Ölcələr və Muradxanlı kənd tam orta məktəblərinin hər birindən isə 6 nəfər, şəhər 8 nömrəli tam orta məktəbindən isə 5 nəfər ali məktəbə qəbul olmuşdur. Ali məktəbə qəbul olanlardan aşağıda 8 nəfər: Əsmər İsgəndərova, Nizam Zahidli, Aslan Aslanlı, Xumar Müslümzadə, Elçin Nərimanlı, Nail Sadıqzadə, Zöhrə Vəlizadə, Zaur Möhsümzadə 600-dən yuxarı bal toplamışdır.

Bildiyimiz kimi, son illərdə şagirdlərin məktəbə məktəbli formasında gəlməsi üçün xeyli iş görülmüşdür. Bu məsələdə valideynlərin və ictimaiyyətin köməyinə ciddi ehtiyacımız vardır. Hamılıqla ona nail olmalıyıq ki, qarşıdakı dərs ilinin ilk günündən bütün uşaqlar məktəbə məktəbli formasında gəlsinlər.

Rayonumuzun bütün təhsil işçiləri təhsil sahəsində qarşıya qoyulmuş vəzifələri yüksək səviyyədə həyata keçirmək üçün bundan sonra da bütün qüvvə və bacarığını sərf edəcəklər.

*Rəyçi: Əməkdar müəllim A.Muradov*

**Р.Эмиров**

**Качественное образование - требование дня**

**Резюме**

В статье отмечается, что в годы независимости материально-техническая и правовая база образования значительно окрепла и происходят в нем важные тематические и структурные изменения.

**R.Amirov**

**Qualitative education is the demand of the day**

**Summary**

In this article it is noted that in the XXI century Independent Azerbaijan has become one of the stable countries, developed economically and a good environment has been created for education. During the recent years legal base of education has been created, appropriate changes have been carried out on the maintenance and structure of education in accordance with the demands of the world education system.

# ÖLKƏMİZƏ LAYİQ VƏTƏNDAŞLAR YETİŞDİRƏK

**Asif Nəbiyev**
***Göyçay Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *müəllim, şagird, dərs, kurikulum, innovasiya, fəal təlim, metodika, qabaqcıl təcrübə.*

***Ключевые слова:*** *учитель, ученик, урок, курикулум, инновация, интерактивная учеба, методика, передовой опыт.*

***Key words:*** *teacher, students, lesson, curriculum, innovation, interactive, methodology, innovative practice.*

Bəşər tarixinin bütün mərhələlərində inkişafa elm və təhsil vasitəsilə nail olunmuşdur. Müasir dövrümüzdə də hər bir ölkənin inkişafının əsasında elm, təhsil durur. İqtisadi qüdrəti də, yüksək mədəni və intellektual səviyyəli cəmiyyəti də yaradan, formalaşdıran, inkişaf etdirən məhz elm və təhsildir.

Əsası müstəqil Azərbaycan dövlətinin qurucusu və memarı, ümummilli liderimiz Heydər Əliyev tərəfindən qoyulan təhsil islahatı proqramı təhsilin keyfiyyətinin yüksəldilməsinə, dünya təhsil sisteminə inteqrasiyaya xidmət edir. Uğurla aparılan təhsil siyasəti ümummilli liderimizin təməlini qoyduğu, möhkəmləndirdiyi etibarlı zəmin üzərində davam və inkişaf etdirilir. Heydər Əliyev siyasi kursunun layiqli davamçısı, ölkə prezidenti cənab İlham Əliyevin böyük səyləri sayəsində ölkəmizdə təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının mühüm istiqamətlərindən birinə çevrilmişdir.

Təhsilin inkişaf etdirilməsi, müasirləşdirilməsi, qabaqcıl ölkələrin təhsil sahəsindəki mütərəqqi təcrübəsinin mənimsənilməsi, dünya təhsil sisteminə inteqrasiyanın təmin edilməsi sahəsində əldə olunan uğurlar respublikamızda siyasi sabitliyin, sosial-iqtisadi inkişafın və Azərbaycan Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı nəticəsində mümkün olmuşdur.

"Təhsil əsri" elan olunan XXI əsrdə məktəbin lazımi potensiala malik müəllim kadrları ilə təmin olunması təlim texnologiyaları ilə işinin təşkili, müəllim-valideyn, müəllim-şagird münasibətlərinin tənzimlənməsi, məktəb psixoloqunun işinin təşkili və s. təhsili idarə edənlərin diqqət mərkəzində duran əsas vəzifələrdəndir. Müəllimlərin innovasiyalara yiyələnməsi, treninqlərdə iştiraklarının təmin edilməsi, eyni bir metodla işləmə prinsiplərindən əl çəkmələrinə nail olunması da bu qəbildəndir. Bir sözlə, təhsil islahatı proqramında deyildiyi kimi, idarəetmənin əsas məqsədi şəxsiyyətin, cəmiyyətin təhsilə olan tələbatını ödəmək üçün həyatımızda aparılan demokratikləşdirmə prosesinə uyğun nəzarət, planlaşdırma, əlaqələndirmə, tənzimləmə funksiyalarının yeni məzmun və formada, yeni idarəetmə modelinə, innovasiyaların tətbiqinə əsaslanmaqdır.

Ölkəmizə layiq vətəndaşlar yetişdirmək məqsədilə uğurla aparılan təhsil siyasətinin nəticəsidir ki, regionların sosial-iqtisadi inkişafı Dövlət Proqramına uyğun olaraq, bu gün respublikamızın bütün bölgələrində yeni-yeni məktəblər tikilir, onların maddi-texniki bazası gücləndirilir, ən müasir tədris avadanlıqları və informasiya-kommunikasiya texnologiyaları ilə təminatı isti-

qamətində geniş miqyaslı işlər görülür. Bütün bunların nəticəsidir ki, ümumi orta təhsilin məzmununun təfəkkür və düşüncə müstəvisi üzərində qurulması və bilavasitə əsl vətəndaş ola biləcək şəxsiyyət formalaşdırılmasına yönəlmiş həyati bacarıqların əsas olduğu nəzərə alınmaqla müəyyən edilməsi, əsas mahiyyəti təhsilin keyfiyyətinin yüksəldilməsi və idarəolunmasını təşkil edən yeni qiymətləndirilmə sisteminin yaradılması, müasir dərslik komponentləri ilə şagirdlərin təmini, tədrisdə müəllim yaradıcılığına, bilik və bacarığına geniş imkanlar açılması təhsilimizin ən qabaqcıl təhsil sistemlərinə inteqrasiyasını mümkün etmişdir.

Ümumbəşəri pedaqoji ənənələr, müasir dünyanın əsasını təşkil edən inkişafyönümlü ideyalar, XXI əsr təhsilinin inkişaf istiqamətlərini özündə cəmləşdirən maarifçilik konsepsiyası bu gün təhsil sistemini durmadan inkişaf etdirən əsas amillər olmuşdur. Ölkəmizdə təhsil sisteminə və fədakar peşə adamları olan müəllimlərə böyük diqqət və qayğı vardır. Elə bu günlərdə təhsil işçilərinin əmək haqqlarının artırılması bu qayğının göstəricisidir.

2012/2013-cü dərs ilində Göyçay rayonunda 57 məktəb (o cümlədən 40 tam orta, 13 ümumi orta, 4 ibtidai), 34 məktəbəqədər, 5 məktəbdənkənar tərbiyə müəssisəsini (o cümlədən UGİM, Texniki Yaradıcılıq və Ekoloji Tərbiyə mərkəzləri, Şahmat məktəbi və UYM) fəaliyyət göstərmişdir. Ümumtəhsil məktəblərində 15332 nəfər şagird təhsil almış, məktəbəqədər tərbiyə müəssisələrində 1420 nəfər uşaq tərbiyə ilə əhatə olunmuş, məktəbdənkənar müəssisələrdə isə 1968 nəfər şagird müxtəlifyönümlü dərnəklərdə bilik və bacarıqlarını artırmışlar. Ümumtəhsil məktəblərində şagirdlərin təlim-tərbiyəsi ilə 2304 nəfər müəllim, məktəbəqədər tərbiyə müəssisələrində isə uşaqların tərbiyəsi ilə 209 nəfər tərbiyəçi məşğul olmuşdur.

Fənn kurikulumlarının tətbiqi ilə tədrisdə baş verən dəyişikliklər nəticəsində respublikamızda xeyli uğurlu təcrübələr qazanılmışdır. Fənn kurikulumlarının tətbiqə başlanmasından keçən dövr ərzində 1568 nəfər, o cümlədən hesabat ilində 525 nəfər müəllim treninqlərdən keçərək müvafiq sertifikat almışlar. Fənn kurikulumlarının tətbiqi sahəsində rayon təhsilində əldə edilmiş təcrübə tədris prosesində uğurla tətbiq edilir. Məktəblərin maddi-texniki bazasının möhkəmləndirilməsi, kadr siyasətinin düzgün aparılması, təlimdə ən müasir təlim metodlarının tətbiqi kimi aktual məsələlərin həlli üçün daha geniş imkanlar açılır.

Təhsil müəssisələrinin maddi-texniki bazasının möhkəmləndirilməsinə xüsusi diqqət yetirilir. Ötən il Dövlət Proqramı hesabına Ulaşlı-Şıxlı kənd tam orta məktəbi üçün 280 yerlik, Şəkili kənd ümumi orta məktəbi üçün 80 yerlik yeni məktəb binaları tikilərək istifadəyə verilmişdir. Yeni məktəb binaları ən müasir avadanlıqlarla tam təchiz edilmişdir. Hazırda Müskürlü kənd ümumi orta məktəbi üçün 120 yerlik, Qəbələ Müskürlü və Alıkənd kənd ibtidai məktəbləri üçün 80 yerlik yeni məktəb binalarının tikintisi davam etdirilir. Həmçinin Şahmat məktəbinin yenidən qurulmasında işlər sürətlə aparılır.

Son illər məktəblərin yeni avadanlıqlarla təmini xüsusi diqqətdə saxlanılır. Hesabat ilində məktəb invertarına olan tələbatı ödəmək üçün 847 ədəd məktəbli partası, 134 ədəd kitab şkafı, 149 ədəd paltar şkafı, 201 ədəd yazı lövhəsi, 300 ədəd müəllim stolu, 1131 ədəd müəllim stulu alınaraq bölgü əsasında məktəblərə paylanmışdır.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin müvafiq əmrinə əsasən 2013-2015-ci illər üzrə rayon təhsil sisteminin strateji fəaliyyət proqramı hazırlanmış və icraya yönəldilmişdir.

Bütün təlim-tərbiyə müəssisələrində

tədrisin keyfiyyətini yaxşılaşdırmaq üçün tədbirlər keçirilir. Bu baxımdan məktəbdənkənar və sinifdənxaric tədbirlərin gücündən maksimum istifadə edilməsi və bu sahədə ciddi nəzarətin təmini həyata keçirilmişdir. Əvvəlki illərdən fərqli olaraq məktəblilərin fənn olimpiadalarının rayon turunun I mərhələsi daha kütləvi təşkil edilmiş, I turda 931 nəfər şagird 11 fənn üzrə qüvvələrini sınamışlar. I turda qalib gəlmiş 135 nəfər iştirakçı yanvarda keçirilən II rayon turunda iştirak etmiş, qalib gəlmiş 12 nəfər respublika turunda iştirak etmişlər. Şəhər 3 nömrəli tam orta məktəbin X sinif şagirdi Hacıyeva Əminə tarix fənni üzrə Respublika fənn Olimpiadasının qalibi olmuşdur. Şəhər 1 nömrəli tam orta məktəbin IX sinif şagirdi İsmayılova Aytən biologiya fənni üzrə IV yeri tutmuşdur.

Şəhər 1 nömrəli tam orta məktəbin X sinif şagirdi Hümbətova Zərifə ümummilli lider Heydər Əliyevin anadan olmasının 90-cı ildönümü münasibəti ilə keçirilən inşa yazı işləri müsabiqəsində müvəffəqiyyətlə iştirak etmiş və II yeri tutmuşdur. Yevlax şəhərində Fövqəladə Hallar Nazirliyinin xətti ilə keçirilən gənc yanğınsöndürənlər müsabiqəsində şəhər 1 nömrəli tam orta məktəbin komandası III yerə çıxmışdır.

“Cəsurlar”, “Şahin” hərbi idman və turizm oyunlarının rayon turu daha keyfiyyətli təşkil olunmuş, hər iki oyunda Göyçay şəhər 3 nömrəli tam orta məktəbin komandaları qalib gəlmişdir. Həmin məktəbin “Şahin” komandası Bərdə şəhərində keçirilən zona turunda qalib gəlmiş və oyunların final turunda müvəffəqiyyətlə iştirak etmişdir.

Şahmat UGİM-in yetirməsi Səbinə Quliyeva qadınlar arasında keçirilən respublika birinciliyinin yarım final yarışlarında I-III yerləri bölüşmüş və finala vəsiqə qazanmışdır. Ağcabədi şəhərində ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi münasibəti ilə keçirilən turnirdə məktəbin yetirmələri Quliyev Qarakişi I yeri, Əhmədov Abdulla II yeri, Həşimov Mirçıraq III yeri tutmuşdur. Məktəbin yığma komandası Balakən şəhərində keçirilən Şahmat üzrə Respublika Olimpiadasında uğurla iştirak etmişdir.

UGİM-in futbol komandası VI Respublika Spatakiyadasında III yeri tutmuşdur. Həmin məktəbin 1999-2000-ci il təvəllüdlü qızlardan ibarət yığma komandası voleybol üzrə respublika birinciliyinin zona turunda I yeri tutaraq Balakən şəhərində keçirilən final mərhələsində V yerə layiq görülmüşdür. 1996-1998-ci il təvəllüdlü qızlardan ibarət voleybol komandası Şamaxı şəhərində keçirilən VI Respublika Spatakiyadasında III yeri tutmuşdur.

Aydındır ki, yuxarıda göstərdiyimiz tədbirlərin məqsədi təlimdə keyfiyyət dəyişikliyi yaratmaq kimi bir vəzifənin həyata keçirilməsinə xidmət etmişdir. İl ərzində 2 dəfə həm I yarımilin sonunda, həm də ilin yekununda keyfiyyət reytinqləri təşkil edilmiş, nəticələr təhlil edilmiş, problemlərin həlli üçün iş planları hazırlanıb həyata keçirilmişdir. Şagird hərəkəti uçotunun düzgün aparılması haqqında bütün təlimati tələblərin həyata keçirilməsinə ciddi nəzarətin nəticəsidir ki, tədrisdən yayınma hallarına əsasən son qoyulmuş, icbari ümumi orta təhsilin həyata keçirilməsi təmin edilmişdir.

Diqqətdə saxlanılan məsələlərdən biri də IX və XI sinif şagirdlərinin buraxılış imtahanlarına hazırlığı olmuşdur. Bu məqsədlə təlimati tələblərə uyğun 3 imtahan mərkəzi yaradılmış, məzunların imtahanlara hazırlaşması üçün bir neçə dəfə sınaq imtahanları keçirilmişdir. İmtahanlar haqqında məlumatlar vaxtında şagird, müəllim və valideynlərə çatdırılmış, imtahanlara hazırlıq məqsədi ilə məşğələ və dərnəklər təşkil edilmişdir. Hesabat ilində XI siniflər üzrə 1096 nəfər şagird, həmçinin əvvəlki illərdə tam orta təhsil məktəblərini bitirmiş 124 nə-

fər şagird, eksternant qaydası ilə imtahan verən 2 nəfər şagird cəmi 1232 nəfər tam orta təhsil haqqında sənəd almışdır. IX siniflər üzrə isə 1522 nəfər şagird ümumi orta təhsil haqqında sənəd almışdır.

Tam orta təhsil bazası əsasında 878 nəfər, o cümlədən 2013-cü il məzunlarından 588 nəfər ali məktəbdə oxumaq üçün sənəd vermiş, onlardan 342 nəfər, o cümlədən 2013-cü il məzunlarından 287 nəfər ali məktəb tələbəsi adını qazanmışlar. Ərizə vermiş məzunların ali məktəblərə qəbul olunma faizi 48,8% olmuş, bu da əvvəlki illə müqayisədə 5,1% artım deməkdir. Abituriyentlərdən 8 nəfər xüsusi təyinatlı ali məktəblərə qəbul olunmuşdur. 19 nəfər (əvvəlki ildə 13 nəfər) 600 baldan yuxarı, 64 nəfər (əvvəlki ildə 41 nəfər) 500 baldan yuxarı nəticə göstərmişdir. Tam orta təhsil bazasından 101 nəfər orta ixtisas məktəblərinə daxil olmuşlar.

Məktəblər arasında şəhər 1, 3, 4, 6 nömrəli, Ləkçıplaq kənd 1 və 2 nömrəli, Mallı-Şıxlı, Məlikkənd, Qızılağac, Qarabağlar kənd tam orta məktəbləri daha müvəffəqiyyətli nəticələr göstərmişdir.

Qeyd etmək lazımdır ki, yeni tədris ili ərəfəsində təlim-tərbiyə ocaqlarının yeni tədris ilinə hazırlığı əsasən başa çatmış, cari təmir işləri aparılmış, səliqə–səhman yaradılmışdır. Son illər şagirdlərin dərslik problemi ilə qarşılaşmaması Respublika Təhsil Nazirliyinin həyata keçirdiyi səmərəli fəaliyyətin nəticəsi olmuşdur. Artıq bütün şagirdlər 100 %-li dərsliklərlə tam təmin olunur. Bu il bölgü əsasında 115 adda 46272 ədəd dərslik rayona gətirilmiş, nömrələmə aparılmış və məktəblərə paylanılmışdır.

Xüsusi istedadlı uşaqların vaxtından əvvəl I sinfə qəbul edilməsi haqqında Təhsil Nazirinin 17.07.2013-cü il tarixli 739 nömrəli əmrindən irəli gələn vəzifələri həyata keçirmək üçün RTŞ nəzdində 19.07.2013-cü il tarixli 87 nömrəli əmrlə xüsusi komissiya yaradılmış və həmin komissiyaya 197 nəfər müraciət etmişdir. 21.08.2013-cü il tarixdən komissiyada uşaqların bilik səviyyələri yoxlanılmağa başlanılmış, prosesi aparmaq üçün bütün şərait təmin edilmiş və 73 nəfər xüsusi istedadlı uşaq I sinfə qəbul edilmişdir. Mən burada bütün məktəb rəhbərlərinin nəzərinə bir daha çatdırıram ki, uşaqların I sinfə qəbulu qaydalarına ciddi əməl etməklə yeni qaydaların valideynlər arasında təbliğatına nail olsunlar.

Azərbaycan Respublikası Standartlaşma, Metrologiya və Patent üzrə Dövlət Komitəsinin 06.05.2013-cü il tarixli 38 nömrəli əmri ilə "Təhsil müəssisələrində təhsil və tərbiyəalanların qidalanması üzrə dövlət standartı"nı təsdiq etmişdir. Standartın əsas məqsədi təhsil müəssisələrində qidalanmanın optimallaşdırılması yolu ilə təhsil və tərbiyəalanların sağlamlığının qorunması və möhkəmləndirilməsidir. Dövlət standartları təsdiq edildikdən sonra Azərbaycan Respublikası Təhsil Nazirliyi 20.08.2013-cü il tarixli məktubla təhsil müəssisələrində qidalanma zamanı istifadəsinə icazə verilməyən məhsulların siyahısını yerlərə göndərmişdir. Bildirirəm ki, sahə tərəfimizdən ciddi nəzarətə götürüləcəkdir. Odur ki, dövlət standartlarına uyğun ərzaqla təminatın həyata keçirilməsini bütün təhsil müəssisəsi rəhbərlərindən tələb edirəm.

Artıq bir neçə ildir ki, məktəblərin inkişafını və müəllimlərin həvəsləndirilməsini təmin etmək üçün "İlin məktəbi", "İlin müəllimi" müsabiqələri keçirilir. Sevindirici haldır ki, bu müsabiqələrdə rayonumuzun təmsilçiləri uğurla iştirak edirlər. Akad. Z.Bünyadov adına Göyçay şəhər 3 nömrəli tam orta məktəbi "İlin məktəbi", həmin məktəbin müəllimi Fazilova İlahə Rəfail qızı isə "İlin müəllimi" adını qazanmışdır. Mən bu yüksək tribunadan yüksək ad qazanmış şəhər 3 nömrəli tam orta məktəbin pedaqoji kollektivi və İlahə müəlliməni rayon ziyalı-

ları adından ürəkdən təbrik etməklə rayon təhsil işçilərini bu tip müsabiqələrdə daha yaxından iştirak etməyə çağırıram.

Artıq rayonda fəaliyyət göstərən 57 ümumtəhsil məktəbi yeni tədris ilinə tam hazırdır və müəllimlər öz sevimli şagirdlərinin yeni tədris ilinə başlayacağı anı, daha böyük vəzifələrin həyata keçiriləcəyi yeni tədris ilinin başlanılmasını həsrətlə gözləyirlər və bildirirlər ki, bu tədris ilində qarşıya qoyulan vəzifələrin həlli üçün daha maksimum səy göstərəcəklər.

Təhsilin problemlərinin həlli düzgün idarəetmə mexanizmindən, rəhbər kadrların işgüzarlığından sıx asılı olduğu danılmaz faktdır. Bu gün sıralarımızda T.Qurbanova, İ.Rüstəmov, E.Əliyev, Z.Mürsəlov, T.İsmayılov, Z.Babayev, Ə.Quliyev, S.Abdullayeva, Y.Mehdiyeva, E.Allahverdiyev kimi rəhbər işçilərin olması işimizi düzgün qurmağa, problemləri vaxtında aşkar edib həll etməyə imkan yaradır.

Təhsildəki uğurlar aydındır ki, müəllim işgüzarlığının, zəhmətinin bəhrəsidir. Qazanılan uğurlara görə biz Südabə Nəbiyeva, Məzahir Abdullayev, Ramiz Mikayılov, Səhriyar Xəlilov, Sevda Nuhova, Qurban Qurbanov, Almaz Tağıyeva, Pərviz Yəhyalı, Yasin Cəfərov, Natəvan Qasımova, İlahə Fazilova və adlarını çəkə bilmədiyim, lakin təhsilin inkişafında xüsusi rolu olan müəllimlərə borcluyuq.

Aydındır ki, müəllim əməyinə verilən obyektiv qiymət onu daha da ruhlandırır, işləmək üçün səfərbər edir. Təsadüfi deyildir ki, rayonun adlı-sanlı müəllimlərindən 6 nəfər müəllimin “Əməkdar müəllim” adına layiq görülməsi, 6 nəfər müəllimin “Tərəqqi” medalı ilə təltifi, 3 nəfər müəllimin “Təhsil əlaçısı” döş nişanı ilə təltifi Respublika Prezidentinin, Təhsil Nazirliyinin Göyçay rayon təhsil işçilərinin əməyinə verdiyi böyük qiymət kimi qarşılanmış və bu qiymət bizi daha yaxşı işləməyə səfərbər etmişdir.

Təhsil keyfiyyətinin yaxşılaşdırılması məktəbəqədər yaşlı uşaqların tərbiyəsinin düzgün istiqamətləndirilməsindən sıx asılıdır. Hesabat ilində rayonda fəaliyyət göstərən 34 məktəbəqədər tərbiyə müəssisələrində 1420 nəfər uşaq tərbiyə almış, onların təlimi ilə 209 nəfər tərbiyəçi müəllim məşğul olmuşdur. Bildiyimiz kimi, Azərbaycan Respublikası Prezidenti möhtərəm İlham Əliyev cənablarının müvafiq sərəncamı ilə məktəbəqədər tərbiyə müəssisələri yerli icra hakimiyyəti strukturuna verilmişdir. Lakin həmin müəssisələrdə metodiki iş, təlim-tərbiyə prosesinə nəzarət təhsil idarələri tərəfindən həyata keçirilir. Aydındır ki, ümumi təhsilin əsasının məktəbəqədər tərbiyə müəssisələrindən başlanılması danılmaz faktdır. Bu müəssisədə tərbiyə alan uşaqlar ümumtəhsilə daha sıx alışqanlı olur, onların fikir və düşüncələri daha çevik xarakter daşıyır. Bax, bu baxımdan orta təhsilə qəbul olacaq bütün uşaqların məktəbəqədər tərbiyə müəssisələrində tərbiyə alması çox vacib bir şərtdir və bu müddəanın təhsil qanununda öz əksini tapması təhsil işçilərinin ürəyindən xəbər verir. Bu vacib vəzifənin həyata keçirilməsi isə məktəbəqədər tərbiyə müəssisələrindən işlərini müasir əsaslar baxımından yenidən qurmağı və əvvəlki qaydalarla işləməyə birdəfəlik son qoymağı tələb edir. Həyata keçirdiyimiz tədbirlərə baxmayaraq hələ də bir çox məktəbəqədər müəssisədə məşğələlərin keyfiyyəti günün tələblərinə cavab vermir, uşaq kontingent planının yerinə yetirilməsində nöqsanlar mövcuddur, bəzi tərbiyəçilər məşğələlərə hazırlıqsız gəlirlər. İnanmaq istərdim ki, bütün məktəbəqədər tərbiyə müəssisələri işlərini günün tələbləri səviyyəsində quracaqdır.

Rayonda fəaliyyət göstərən 5 məktəbdənkənar tərbiyə müəssisəsi idmanın kütləviliyinin, şagirdlərin bədii və estetik yaradıcılıqlarının inkişaf etdirilməsi, texniki yaradıcılığın tətbiqi ilə məşğuldur. Həmin

müəssisələrdə 1968 nəfər şagird məşğul olur. Qeyd edilməlidir ki, son illərdə bu müəssisələrin fəaliyyətində müəyyən dönüş əldə edilmişdir. Xüsusi ilə Şahmat məktəbi, UYM-nin, Texniki Yaradıcılıq Mərkəzinin fəaliyyətində xüsusi canlanma müşahidə edilmişdir. İnanırıq ki, yeni tədris ilində bu müəssisələr işlərini daha effektli qurmaqla tədrisin keyfiyyətinin yüksəldilməsi üçün öz töhfələrini verəcəklər.

Qeyd etməliyəm ki, işimizdə nöqsanlarımız da az deyildir. Xüsusi ilə hələ də aramızda peşə hazırlığı aşağı olan kadrlar vardır. Növbəti tədris ilində bu sahə ciddi nəzarətdə saxlanılacaqdır. Həmçinin istedadlı şagirdlərlə işin təşkilində, məktəblərə verilmiş informasiya-kommunikasiya texnologiyaların tətbiqində nöqsanlar qalmaqdadır. Seçmə yönümlü siniflərdə şagird biliyinin tələblərə tam cavab verməməsi, məktəbdənkənar və məktəbəqədər müəssisələrdə məşğələlərin keyfiyyətinin aşağı olması, əyanilikdən və təlimin texniki vasitələrindən daha səmərəli istifadə edilməməsi bizdən daha ciddi fəaliyyət tələb edir. Bu isə ilk növbədə RTŞ-nin müdiri kimi məndən, məsləhətçilərin işinə nəzarət edən RTŞ-nin müdir müavini X.İsrəfilovdan, metodiki işə rəhbərlik edən metodmərkəzin direktoru Y.Abdurahmanovdan işə daha ciddi münasibət, nöqsan və problemlərin həlli üçün tələbkarlıq tələb edir.

Bilirik ki, qarşıda bizi təhsilin keyfiyyətinin müasir əsaslarla qurulması kimi məsul vəzifələr gözləyir. Bunun üçün bu tədris ilində də dəyirmi masalar, konfrans və seminarların gücündən maksimum istifadə etməklə yeni yanaşma tərzinin əsasları istər müəllimlər, istərsə də valideynlərə geniş izah edilməli, xüsusi ilə qabaqcıl təcrübənin öyrənilməsi və işə tətbiqi, interaktiv təlim metodlarından istifadə etməklə təlimin təşkili, təhsil sistemində müasir yanaşmaların tətbiqini təmin etmək üçün məlumat bankının genişləndirilməsi, icbari təhsilin yerinə yetirilməsi, məktəbə şagird qəbulunun mövcud təlimatlar əsasında aparılması, şagirdlərin hərəkətinin düzgün uçotunun aparılması, təhsildən yayınma hallarının müəyyənləşdirilib tədbirlər görülməsi, təlim keyfiyyətini yüksəltmək üçün məktəb, sinif, sahə, müəllimlər və fənlər arasında keyfiyyət reytinqinin təşkili ilə təhlillər aparılması, fənn olimpiadalarının və digər müsabiqə və yarışların keyfiyyətli təşkili, ana dili, Azərbaycan tarixi və Azərbaycan coğrafiyası fənlərinin tədrisinin ciddi nəzarətdə saxlanılması və bütün sahələr üzərində təhsilin məzmununda əsaslı dəyişikliklər aparılması ciddi nəzarətdə saxlanılmalıdır.

Rayonun çoxsaylı pedaqoji kollektivləri yeni 2013/2014-cü tədris ilində təhsilin keyfiyyətinin yaxşılaşdırılması üçün daha səylə işləyəcək, rayon təhsilinin problemlərini həll etmək üçün daha məqsədyönlü işlər görəcəkdir. Dövlətimizin pedaqoji işçilərə olan inamını doğrultmaq üçün onlar öz səy və bacarıqlarını əsirgəməyəcəklər.

*Rəyçi: prof. İ.Cəbrayılov*

**А.Набиев**

**Вырастим достойных стране граждан**

**Резюме**

В статье говорится об изменениях в районах в связи применением предметного курикулума. Автор к тому же представляет цифры, связанные с материально-технической базой районных школ за последние годы.

**A.Nabiyev**

**Let's make honourable citizens**

**Summary**

In this article it is spoken about the changes applying subject curriculum in the regions. The author also gives some information about material-technical base of schools in the recent years.

# MÜƏLLİM ŞƏXSİYYƏTİ VƏ MÜƏLLİM NÜFUZU BARƏDƏ

**Buludxan Xəlilov**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru, filologiya elmləri doktoru***

***Açar sözlər:*** *müəllim, elm, mədəniyyət, şəxsiyyət, pedaqogika, tələbə, təhsil, tərbiyə.*
***Ключевые слова:*** *учитель, наука, культура, личность, педагогика, студент, образование, воспитание.*
***Key words:*** *teacher, science, culture, personality, pedagogy, student, education, upbringing.*

Azərbaycan xalq yazıçısı İsmayıl Şıxlı nəsrimizin görkəmli nümayəndəsi olmaqla yanaşı, həm də böyük pedaqoq, müdrik müəllim kimi tanınmışdır. Onun pedaqoji fəaliyyətindən, şəxsiyyətindən bəhs edərkən böyük pedaqoqun bu sahədəki işinə bir nəzər salmaq lazım gəlir. İ.Şıxlının pedaqoji görüşlərində müəllim nüfuzuna dair fikirlər geniş yer tutur. Hər şeydən əvvəl o düşünürdü ki, məsuliyyət hissi və ümumiyyətlə, məsuliyyətli olmaq bütün uğurların açarıdır. Bütün uğurlar məsuliyyətdən keçir, məsuliyyətdən qol–qanad açır, məsuliyyətdən qidalanır. Məsuliyyət olmayanda uğurdan, nailiyyətdən danışmaq əbəsdir. Çətinliklər o vaxt dəf edilir ki, məsuliyyət zəhmətlə birləşsin. Məsuliyyətlə zəhmət uğurun qoşa qanadıdır. Belə bir məsuliyyətlə zəhmətin birliyi elə İsmayıl Şıxlının özünün də həyatına aiddir. Hələ Böyük Vətən müharibəsi təhlükəsinin hiss edildiyi bir vaxtda, gərginlik zamanında ona tapşırılmış bir məruzə barədə yazırdı: “Mən belə həyəcanlı günlərin birində, axşam “Maqbet” haqqında məruzə edəsi oldum. Yaman qorxurdum. Əli Sultanlının önündə məruzə etmək mənə çox çətin gəlirdi. Əslində təkcə mən yox, bütün kursumuz, hətta deyərdim ki, bütün fakültəmiz həyəcan keçirirdi. Çünki belə mühazirələrə bütün fakültə toplaşırdı, başqa şöbələrdən də gələnlər olurdu. Mən hiss etdim ki, Əli müəllim də həyəcan keçirir...”. Tələbənin məruzə söyləməsi və bütün fakültənin bu məruzəni dinləməyə toplaşması adi hal deyildi. Yaxşı bir işin, fəaliyyətin ənənəyə çevrilməsi, yaxud da ənənənin qorunub saxlanılması baxımından bu hadisə ibrətamizdir. Nə edək ki, yaratmaq vacibdir, çalışmalıyıq ki, bu ənənələr unudulmasın.

İsmayıl müəllim pedaqoji fəaliyyətini Azərbaycan Dövlət Pedaqoji Universitetində davam etdirmişdir. O da öz müəllimləri Ə.Sultanlı, M.Rəfili, C.Xəndan, F.Qasımzadə kimi gözəl mühazirələri ilə yadda qalmışdır. Onun simasında deyə bilərik ki, müəllim mühazirəsinin keyfiyyətli olması ilə fərqlənməlidir, tələbələri tərəfindən sevilməsi üçün müəllim mühazirəni sinədən oxumalıdır, faktları, hadisələri əzbərdən bilməlidir. Düzdür, mühazirə mətninin olması da vacib şərtdir. Bu, müəllimin məsuliyyətini artırır, ildən–ilə mühazirə mətni təkmilləşir, yeni-

ləşir. Ancaq mühazirə mətnindən asılı qalmaq olmaz. Bu asılılıq məsuliyyəti azaldır, müəllimin danışığını canlı etmir. Mühazirə mühazirəçi tərəfindən sinədən söylənəndə canlı və cəlbedici olur. İsmayıl müəllim məhz belə ustad pedaqoq idi.

Bir də müəllimin bir xoşbəxtliyi də ondadır ki, onun layiqli yetirmələri olsun. Layiqli yetirmələr, tələbələr müəllimin ömrünü uzadır, onun əhvali – ruhiyyəsini artırır, sağlam və gümrahlıq durumuna da kömək edir. Müəllimin layiqli yetirmələri olanda bilir ki, onu əvəzləyən, onun işini davam etdirən var. Əslində müəllimlik elə bir müqəddəs ocaqdır ki, bu ocağı həmişə yandırmaq, onun istisinə qızınmaq lazımdır. Bu mənada müəllimin ocağını yandıranlar onun tələbələridir. Ocağı yandıranlar yerində olanda rahatlıq, məmnunluq və razılıq xeyir – duaya çevrilir, inam və etiqad hər bir şeyi üstələyir.

Bunun üçün əsas şərt odur ki, müəllim mühazirəni təsirli, emosional, dolğun və məzmunlu söyləməlidir. Müəllim mühazirəsinin məzmununa elə girməlidir ki, hər bir hadisə və faktın iştirakçısı kimi danışa bilsin. Belə olanda, təbii ki, mühazirə dinləyicini, tələbəni sehirləyir, öz təsiri altına salır, tələbə bütün qayğı və problemlərini unudaraq mühazirə zamanı yalnız müəllimin mühazirəsinə diqqət yönəldir. İ.Şıxlının mühazirələrini tələbələri məhz belə xatırlayır.

Yaxşı mühazirə, yaxşı dərs bir gözəllikdir. İnsan gözəlliyə baxanda hər şeyi unudur, diqqəti yalnız o gözəlliyin aludəçisi olmağa yönəlir. Belə məqamlarda insan yan – yörəsində baş verənləri də unudur. Hətta ona dəyib toxunanlara da əhəmiyyət vermir. Çünki o, gözəllik qarşısındadır, gözəlliklə üz – üzədir. Gözəlliyin yaxşı mənada quludur. Məhz bu mənada yaxşı mühazirə, yaxşı dərs gözəllikdir. Belə gözəl dərs nümunələri ilə yaddaşlara əbədi həkk olumuş müəllimi Əli Sultanlı barədə İsmayıl Şıxlı yazır: "Əli müəllimi dinlədikdə ayırd edə bilmirdik ki, mühazirədəyik, yoxsa tamaşada. Əli müəllim müəllimlik məharətinə aktyorluq istedadını da əlavə edirdi. Onun təsiri ilə biz Bayron kimi dalğınlaşır, Hamlet kimi kədərlənir, "məhvərindən çıxmış dünyanı öz məhvərinə qaytarmaq istəyir"dik. Bir sözlə, gah şair olur, gah Jan Valjana dönür, gah da dünyanın sirrini dərk etmək istəyən Fausta çevrilirdik. Əli müəllim bizi yaman əfsunlamışdı. Yüz əllimiz də Əli Sultanlı olmaq istəyirdik". İndi görəsən, öz müəllimi kimi olmaq istəyənlər çoxdurmu?! Öz müəlliminin getdiyi yolu getmək istəyənlər necə?! Bəli, var, ancaq bunların sayı da çox deyil. Bunları əldə etmək üçün nümunəvi bir yol keçmək,  nümunəvi bir məktəb keçmək, müqtədir bir həyat, ömür yolunun sahibi olmaq lazımdır. Belələri daha mətin, dözümlü, xeyirxah və cəmiyyətə fayda verən olurlar. Asan yol keçənlər, hər şeyi zəhmətsiz və haqqı çatmadan əldə edənlər üçün əqidə, məslək, amal olmur, özləri və yalnız özləri üçün çalışır, yaşayır və fəaliyyət göstərirlər.

İsmayıl Şıxlı müəllimlik sənətinin gerçəkliyini və hər bir kəsin müəllimə borclu olduğunu xüsusi qeyd edir. Bu, təkcə ondan irəli gəlmir ki, İsmayıl Şıxlı özü müəllim olmuş, müəllimliyin nə demək olduğunu çox yaxşı bilmiş, müəllimlərin çəkdiyi zəhmətin nədən ibarət olduğunu, onların keçirdiyi hissləri, psixoloji gərginlikləri yaşamışdır, həm də ondan irəli gəlir ki, o, müəllim ailəsində böyümüşdür. İsmayıl Şıxlı yazır: "Mən müəllim ailəsində böyümüşəm. Atamın dostları və qohumlarımın çoxu müəllim olmuşdur. Özüm də bu sahədə çalışıram. Oxuculara təqdim etdiyim "Dəli Kür" romanında da Azərbaycanda yeni tipli müəllimlərin necə yaranmağa başladığını göstərmək istəmişəm. Mən "Dəli Kür" romanında Qori Müəllimlər Seminariyasına həsr edilmiş səhnələri təsadüfən yazmamışam. Bu seminariya bizim Azərbaycana çox istedadlı müəllimlər

və mədəniyyət xadimləri vermişdir. Bundan başqa, həmin seminariyanın Azərbaycan şöbəsi 1918-ci ildə Firudin bəy Köçərli tərəfindən Qazağa köçürülmüş və demək olar ki, respublikamızda başqa seminariyalara nümunə olmuşdur. Həmin məktəb sonra pedaqoji texnikuma çevrildi. Mən də orta təhsilimi orada almışam".

Müəllimlik sənəti İsmayıl Şıxlı tərəfindən bütün mahiyyəti ilə aydın, müqəddəs, ülvi bir sənət kimi qiymətləndirilir. O yazır: "Müəllimliyə sadəcə savad öyrədən bir sənət kimi baxmaq ən azı bu sənətin mahiyyətini anlamamaqdan başqa bir şey deyil. Müəllimlik çox müqəddəs, ülvi və çətin bir sənətdir. Bu elə bir sənətdir ki, cəmiyyət ona hələ dünyagörüşü, həyat anlayışı formalaşmayan, pak, təmiz bir nəslin, öz gələcəyinin tərbiyəsini tapşırır. Bu gənc nəslin gələcəkdə necə insan, necə vətəndaş olmaları, heç şübhəsiz, müəllimlərdən asılıdır. Bu isə çox ciddi və mühüm bir məsələdir. Daim dəyişməkdə, təzələnməkdə olan insan nəslinin əvəzedicilərinin tərbiyəsindən çox şey asılıdır".

Müəllimlik elə bir sənətdir ki, bütün peşə, sənət sahibləri ona borcludur. Müəllim olmasa, insanlar həyatda öz yerlərini tuta bilməz və heç vaxt peşə, sənət sahibi də ola bilməzlər. Hər bir insanın orta məktəbdə, ali məktəbdə, həm də həyatda müəllimləri olur. Onlar heç də az olmurlar. Ancaq onların yadda qalanları, unudulmaz və sevimli müəllimləri az olur. Belə müəllimlər sırasında ibtidai sinif müəllimləri xüsusi yer tutur. Eyni zamanda orta, ali məktəbdə dərs deyən müəllimlər içərisində də hər birimizin əbədi sevdiyimiz müəllimlər olub. Bu mənada İsmayıl Şıxlının hələ Qazax Pedaqoji Texnikumunda oxuduğu zaman ən sevimli müəllimlərindən biri Abdulla Babanlı olmuşdur. İsmayıl Şıxlı Abdulla Babanlı barədə çoxlu müsbət keyfiyyətlər qeyd edir və onlardan birini xüsusi olaraq qeyd etmək yerinə düşər. O yazır: "Babanlı müəllim heç vaxt əsəbiləşməz, tələbənin üstünə qışqırmaz, ona ağır söz deməzdi. O çalışardı ki, tələbə təqsirini özü başa düşsün".

Təhsil ocaqlarının auditoriyalarında fənnə və müəllimə münasibət müəllimin öz fənnini bilməsindən çox asılıdır. Müəllim öz fənninin bütün dərinliklərini və incəliklərini bilirsə, tələbələr həmin müəllimi də, onun tədris etdiyi fənni də sevir. Düzdür, belə müəllimlərə bəzən subyektiv münasibətlər də ola bilir. Ancaq belə subyektiv münasibətlər keçici və ötəri olur, tez–gec nizam–intizamsız tələbə də bilikli müəllimlə hesablaşmalı olur, onun alicənablığı və biliyi qarşısında tabe olur. Bu mənada İsmayıl Şıxlının tarix müəllimi Əli Əliyevlə bağlı yazdıqlarına istinad etməli oluruq: "Mən tarix müəllimimiz Əli Əliyevi də unuda bilmirəm. Əli müəllimlə bizim tanışlığımız çox qəribə oldu. Onu məktəbə yenicə təyin etmişdilər. Hələ bizə dərs deməmişdi, necə müəllim olduğunu bilmirdik. O da bizi tanımırdı. Belə vəziyyətdə bizi pambıq toplamağa yolladılar. Əli müəllim də bizimlə gedəsi oldu. O, özünü çox sakit aparırdı. Biz isə onun təmkinliyindən sui–istifadə edərək, alicənablığını başa düşməyərək, intizamsızlığa yol verir, bəzən sözünə də baxmırdıq. Əli müəllim isə hirslənmirdi".

İsmayıl Şıxlı bir müəllim kimi əldə etdiyi uğurlara görə ona dərs deyən müəllimlərinə–Abdulla Babanlıya, Yunis Əyyubova, Əli Əliyevə, Əli Sultanlıya, Mikayıl Rəfiliyə və digərlərinə özünü borclu sayır. Onları heç vaxt unuda bilmədiyini qeyd edir. O yazır: "Biz nə üçün keçmiş müəllimlərimizdən mərhum professor Əli Sultanlını unuda bilmirik? Çünki o bizim üçün yalnız müəllim deyildi, öz fənnini sevən, onun fədaisi olan bir şəxs idi. O, ehtiraslı bir vətəndaş idi. Əli Sultanlı auditoriyada bizə Axillesdən danışarkən Koroğlunun mərdliyini, Penelopadan danışarkən azərbaycanlı qadınların sədaqətini təbliğ edirdi. O özü ilə bəra-

bər auditoriyaya, qəlblərə gözəllik, sədaqət, vətən eşqi, xalq məhəbbəti kimi ülvi duyğular gətirirdi. Yaxud professor M.Rəfilinin ehtiras və həyəcanla dolu mühazirələrini necə unutmaq olar?! Hərtərəfli zəka sahibi olan bu adam elə maraq və ehtirasla dərs deyirdi ki, biz onunla birlikdə XII əsrə gedib Nizaminin poetik səltənətini dolaşırdıq. Yaxud bizdən yaşlı nəslin nümayəndələri bu gün də öz müəllimləri Firidun bəy Köçərlini, Süleyman Sani Axundovu, Abdulla Şaiqi hörmət və ehtiramla yad edirlər. Çünki bu insanlar öz canlarını yeni nəslin tərbiyəsi yolunda fəda etmişlər. Xalq üçün yanan bu müqəddəs insanlar neçə min insan qəlbində mayaka dönmüşlər. Lakin biz bəzən bu müqəddəsliyi unuduruq".

Ümumiyyətlə, hörmət və ehtiramla yad edilmək, gənc nəslin tərbiyəsi yolunda özünü fəda etmək, şam kimi yanmaq, insanların qəlbində məşələ dönmək, tələbələrində inam hissini yaratmaq, bütün şəxsi məhrumiyyətlərə dözərək fədakar insan olmaq heç də asan bir iş deyil. Deməli, müəllim vətən, xalq, millət yolunda qəlbini məşəl kimi yandırmalıdır. Öz tələbələrinin yetişməsi yolunda fədakar olmalıdır. Nə üçün məhz müəllim bu cür olmalıdır? Buna İsmayıl Şıxlı çox obyektiv bir izah verir: "Əgər mən desəm ki, bir həkimin səhvi, müalicəni düzgün aparmaması bir və ya bir neçə insanın həyatının təhlükəyə düşməsi ilə nəticələnirsə və ya bir mühəndisin səhvi, yaxud qabiliyyətsizliyi bu və ya digər qurğunun başa çatmaması ilə nəticələnirsə buna qismən dözmək olar, yəqin ki, məni qınamazlar. Ancaq müəllimin səhvi, onun savadsızlığı və amansızlığı bütöv bir nəslin şikəstliyinə səbəb olur. Başqa naqisliklərlə mübarizə aparmaq, onu aradan qaldırmaq üçün yollar tapmaq mümkündür. Lakin zehni naqisliyi, mənəvi şikəstliyi mübarizə aparmaqla aradan götürmək, cəmiyyətin beyninin düz işlənməsinə son qoymaq çox çətindir. Məhz buna görə də zehni aləmin tərbiyəsi ilə məşğul olanlar, müəllimlər cəmiyyət qarşısında çox böyük məsuliyyət daşıyırlar".

İsmayıl Şıxlı müəllim üçün zəruri hesab olunan şərtləri də diqqət mərkəzində saxlayır və bu barədə dəqiq, prinsipial, qətiyyətli mövqeyini bildirir. Məsələn, o, müəllim üçün zəruri hesab olunan şərtlərdən birini obyektivlikdə görürdü. Müəllimlər arasında təsadüfi adamların çoxalmasına, obyektivlikdən uzaqlaşanların artmasına millətin gələcəyinə vurulan zərbə kimi baxırdı.

İsmayıl Şıxlı istedadlı gənclərə biganəlikdən, laqeydlikdən də yan keçmirdi. Çünki bu, təbii ki, gənclərdə, o cümlədən də istedadlı gənclərdə inamsızlıq yaradır. İstedadlı gəncləri seçmək, onları düzgün istiqamətləndirmək, onlarda inam hissini gücləndirmək elmimizin də, təhsilimizin də, gələcəyimizin də inkişafına, uğuruna xidmətdən başqa bir şey deyil. Təbii ki, bunu unutmamalıyıq. Məhz İsmayıl Şıxlı da bunu unutmur və yazır: "Çox zaman gəncliyimizin istedadsızlığından şikayətlər eşidirik. Onların elmə laqeyd olmalarından, zəhməti sevməmələrindən, yüngül həyat keçirməyə çalışmalarından gileylənirik. Mən isə qətiyyətlə deyirəm: bizim gənclər açıqfikirli, fövqəladə zəka və bacarığa sahib gənclərdir. Lakin onlara çox zaman biz müəllimlər, valideynlər düzgün istiqamət vermirik. Biz onlarda olan ədalət və doğruluğa inam hissini tapdalayırıq. Biz unuduruq ki, tələbə öz müəlliminə ən doğrucul, nümunəvi və ədalətli insan kimi baxır. Tələbə özünü müəlliminə bənzətmək, onun yolu ilə getmək istəyir. Tələbə ürəyinin sirrini inandığı müəllimi ilə bölüşməyə çalışır. Bunun əvəzinə laqeydlik və subyektivlik, tərəfgirlik görəndə onların inam hissi itir. İnamsızlıq isə böyük bəladır.

Hər bir peşə, sənət sahibi sosial məsuliyyətini hiss etmədən irəli gedə bilməz,

uğur qazana bilməz, onun uğuru cəmiyyətə də fayda verməz. Ona görə də müəllimlərimiz də, tələbələrimiz də sosial məsuliyyətini hiss etməlidir və gələcəyimiz naminə əllərindən gələni əsirgəməməlidirlər.

Həmişə Azərbaycan cəmiyyətində xidməti olan, nüfuzu olan, camaat arasında hörməti olan adamlara müəllim deyə müraciət ediblər. Müəllim sözü ehtiram əlaməti olaraq işlənmiş, insanlara dərs verən (həyat dərsi verən, həyatı öyrədən, dünyanın gəliş–gedişini başa salan, yol göstərən), elm öyrədən adamlara müraciət forması kimi işlənmişdir. Öz sənətinin, peşəsinin, ixtisasının nüfuzlu, hörmətli adamlarının hər birinə ehtiram əlaməti kimi müəllim deyilibdir. Bu söz kimin adının yanında işlənibsə, təkcə onu hörmət və izzətə mindirməyib, həm də onu məsuliyyətli, ədəb-ərkanlı olmağa məcbur edibdir. Müəllim sözü hansı ada qoşularaq işlənibsə, bu, hörmət əlamətindən başqa, həmin adam barədə nümunəvi adam, nüfuz sahibi olan adam, başqalarına təsir edən, yol göstərən adam təsəvvürü yaradıbdır. Bu barədə çoxlu misallar gətirmək olar. Belə misallardan biri də İsmayıl Şıxlının Mirzə İbrahimov haqqında dedikləridir. İsmayıl Şıxlı yazır: "Biz hamımız ona sadəcə olaraq Mirzə müəllim" deyirik. Bu, təsadüfi deyil. Çünki Mirzə İbrahimov sözün həqiqi mənasında bütöv bir ədəbi nəslin tərbiyəçisi və müəllimi olmuşdur. Ona görə də bu sevimli yazıçının adının sonuna ehtiram əlaməti olaraq "müəllim" sözünü əlavə edirik. Bunu iki cür başa düşmək olar. Birincisi, Mirzə müəllim öz əsərləri, odlu-alovlu çıxışları, elmi və publisist məqalələri ilə, ictimai həyatdakı davranışı və şəxsi fəaliyyəti ilə bizə örnək olmuşdur. Biz onun əsərlərindən vətənə məhəbbəti, yüksək amal uğrunda vuruşmağı, böyük ideallara sahiblənməyin yollarını öyrənmişik".

Yaradıcı adamlar həmişə axtarışda olur. Onlar həmişə öyrənməyə can atır, bu yolda kimdən nəyi öyrəniblərsə, onu özlərinə müəllim hesab ediblər. Adətən şairlər, yazıçılar sevdikləri şair və yazıçıların əsərlərini diqqətlə oxuyur, onların qələm təcrübəsindən faydalanırlar. Bu mənada İsmayıl Şıxlı yazır: "Mirzə İbrahimova bir də ona görə müəllim deyirik ki, o, sözün həqiqi mənasında bizə necə yazıb-yaratmağı, nəyi necə təsvir etməyi öyrətmişdir. O, bizim əlyazmalarımızı əlində qələm diqqətlə oxumuş, nəyi artırmağı, nəyi ixtisar etməyi göstərmiş, təsvir etdiyimiz qəhrəmanların canlanması və bir xarakter səviyyəsinə yüksəlməsi üçün hansı bədii vasitələrdən istifadə etməyi göstərmişdir".

Həyatda öz yerini axtaranlara, xüsusilə də gənclərə düzgün istiqamət göstərənlərə, öz həmkarları arasında ağlı, zəkası ilə seçilənlərə, missiyası xeyirxahlıqdan ibarət olanlara, kimin kim olduğunu sübut edənlərə və neçə-neçə müsbət keyfiyyətləri özündə birləşdirənlərə, onu fəaliyyətində nümayiş etdirənlərə, əməlində təsdiq edənlərə müəllim deyiblər. Belələri keçmişdə də olub, indi də var və gələcəkdə də olacaqdır. Onlar yüzlərin, minlərin və milyonların içərisində seçilirlər, fərqlənirlər. Onlar çoxları kimi hər bir şeyə nə olsun demirlər. Ətraflarında və cəmiyyətdə baş verən hadisələrə biganə qalmırlar. Bütün məsələlərə həssas və diqqətli olurlar. Gördükləri işin müqabilində kimlərdənsə nəyisə ummurlar. Necə deyərlər, gözə kül üfürmürlər. Özlərini gözə soxmurlar və kimlərəsə xoş gəlsin deyə fəaliyyət göstərmirlər. Harda olsalar, nəyi görsələr, nədən danışsalar yüz dəfə ölçüb, bir dəfə biçirlər. Başqaları kimi tez-tez səhvlərə yol vermir, etdiklərinin müqabilində qazanc axtarmırlar. Onların dəyərini cəmiyyətin özü, ictimai rəy, qram-qram qazandıqları üzə çıxarır, yaşadır, qoruyub saxlayır və başqalarına təqdim edir. Belələrinin fəaliyyətindən başqaları örnək kimi, nümunə kimi danışır və onların barəsində yazırlar. Necə ki, Mirzə İbrahimov

barədə İsmayıl Şıxlı yazır: "Müharibədən azacıq sonra Mirzə müəllimin Yazıçılar İttifaqında təşkil etdiyi "Gənclər günü"nün fəaliyyətini bütöv bir ədəbi məktəbə bənzətmək olar. Hər həftənin Cümə günü ədəbiyyat həvəskarları onun başına toplaşardı. Burada cəbhədən qayıdanlar da vardı, orta məktəbi yenicə qurtaranlar da". İsmayıl Şıxlı davam edərək yazır: "...Mirzə müəllimin mahir bir sükançı kimi gəncliyi yeni yaradıcılıq yollarında düzgün istiqamətləndirildi. O, bizim şeir, hekayə, oçerk, povest, poema və romanlarımızın oxunuşunu təşkil etməklə yanaşı, o zaman rus ədəbiyyatında yaranan "Ağcaqayın", "Moskvadan uzaqlarda" kimi romanların müzakirəsini də keçirirdi ki, lazım olan cəhətləri əxz edək".

Əsl müəllim kimi yaşayanlar həm də bir məktəb yaradırlar. O məktəbin öz üslubu və yolu olur. Bunu həmin məktəbi yaradan müəllimin orijinal kimliyi, orijinal fəaliyyəti, hər bir kəsdən və çoxlarından fərqli obyektivliyi, prinsipiallığı, özünü insanlara, cəmiyyətə xərcləmək keyfiyyəti və eləcə də digər keyfiyyətləri müəyyənləşdirir. Belə olduqda nəinki belə müəllimlərin tələbələri, hətta belə müəllimlərin dərs demədiyi gənclər, tələbələr də özlərini onların tələbələri sayırlar. Ona görə ki, belə müəllimlərin fəaliyyəti bütün gənclərin və tələbələrin ürəyincə olur. Həmin müəllimlər barədə danışılanlar, deyilənlər, yazılanlar gəncləri, tələbələri o qədər razı salır ki, onlar əsl müəllimləri öz müəllimləri kimi qəbul edir, onunla fəxr edirlər.

Bizim hər birimiz oxuya-oxuya, öyrənə-öyrənə yaşayırıq və fəaliyyət göstəririk. Ancaq oxuduqlarımızdan, öyrəndiklərimizdən, eşitdiklərimizdən ən yaxşı nümunələri əxz etməyə çalışırıq. Bu mənada cəmiyyətdəki hər bir gənc, tələbə də əsl müəllimlər barədə oxuduqlarını, eşitdikləri və gördüklərini yaxşı nümunə kimi əxz etməyə çalışırlar. Belə müəllimləri onlara dərs deyib–deməməsindən asılı olmayaraq özlərinə müəllim sayırlar. Özlərini belə müəllimlərin, əsl müəllimlərin tələbələri kimi hiss edirlər. Özlərini hər hansı orta məktəbin yox, hər hansı ali məktəbin yox, hər hansı fakültənin yox, belə müəllimlərin məzunu hesab edirlər. Bu mənada İsmayıl Şıxlı Mirzə İbrahimov barədə yazır: "Mirzə müəllim müzakirələrdə amansız və həssas idi. Bədii əsərlərin qiymətində tələbkarlıqdan bir addım da olsa geri çəkilməzdi. Onun qayğısı məhz tələbkarlıqla şərtlənirdi. Bu sınaqlardan çıxanları isə o özü seçir və Yazıçılar İttifaqına qəbul edirdi. İndi hərdən o günləri yada salıb zarafatla "Biz hamımız "Gənclər günün"dən çıxmışıq" deyəndə, heç şübhəsiz, ilk növbədə Mirzə müəllimi xatırlayırıq".

Heç şübhəsiz, indi cəmiyyətimizin müxtəlif sahələrində fəaliyyət göstərən nüfuzlu insanlar, eləcə də elmin müxtəlif sahələrindəki nüfuz sahibləri öz müəllimlərini və onların tələbəlik illərində nüfuz sahibi olan müəllimləri xatırlayır, özlərini həmin müəllimlərin yaratdığı məktəblərin məzunu hesab edirlər. Bütün sahələrdə olduğu kimi, filologiya sahəsində də belə müəllimlər az olmamışdır. Məsələn, Bəkir Çobanzadə, Əli Sultanlı, Mikayıl Rəfili, Cəfər Xəndan, Əbdüləzəl Dəmirçizadə, Feyzulla Qasımzadə, Ağaməmməd Abdullayev, Muxtar Hüseynzadə, Məmmədağa Şirəliyev, Şıxəli Qurbanov, Əhəd Hüseynov, İsmayıl Şıxlı və s.

Azərbaycan elm, təhsil tarixində Qori Müəllimlər Seminariyasının oynadığı rol əvəzsizdir. Bu seminariyanın məzunları Azərbaycan elm və təhsil tarixinə elə korifeylər bəxş edibdir ki, onların adı bütövlükdə xalqımızın tarixinə qızıl hərflərlə yazılmışdır. Həm burada dərs deyən müəllimlər, həm buranın məzunları Azərbaycan pedaqoji fikir tarixində xüsusi bir mərhələdir. Qori Müəllimlər Seminariyası Azərbaycana istedadlı müəllimlər, görkəmli mədəniyyət xadimləri vermişdir. Hər şeydən əvvəl, burada

çoxlu müsbət cəhətlər, daxili nizam-intizam qaydaları, tələbkarlıq və başqa məsələlər olmasaydı, yəqin ki, Qori Müəllimlər Seminariyası Azərbaycana istedadlı müəllimlər, görkəmli mədəniyyət xadimləri verə bilməzdi. Yeri gəlmişkən onu da qeyd edək ki, bu seminariyanın ənənəsi o qədər güclü olmuşdur ki, hətta 1918-ci ildə bu seminariya Firudin bəy Köçərli tərəfindən Qazağa köçürüldükdən sonra da Azərbaycanda başqa seminariyalara nümunə olmuşdur. Sonra bu, Qazax Pedaqoji Texnikumuna çevrilmişdir. İsmayıl Şıxlı da burada təhsil almışdır. Odur ki, o, buranın bir sıra müsbət cəhətləri barədə yazır: "...Qazax Pedaqoji Texnikumu Qori Müəllimlər Seminariyasının bir sıra müsbət cəhətlərini, o cümlədən daxili intizam qaydalarını eynilə saxlamışdı. Tələbələr dövlət hesabına yeməklə və paltarla təmin edilirdi. Məktəb bir növ qapalı idi. Dərslərdən və nahardan sonra azacıq istirahət edər və axşam məşğələlərinə başlayırdıq. Heç kəs məşğələ zamanı vaxtını boş keçirə bilməzdi. Bu intizam, şübhəsiz, dərs keyfiyyətinə yaxşı təsir edirdi". İsmayıl Şıxlının Qori Müəllimlər Seminariyasının Qazağa köçürüldükdən sonra bəzi nizam-intizam qaydaları barədə yazdıqlarını qeyd etmək yerinə düşər: "...Qoridən köçürülüb gətirilmiş bu məktəbin tələbələrinə şəhərə çıxmağa icazə verilmirdi. Onlar günorta yeməyindən sonra axşam məşğələsinə qədər ancaq məktəbin geri yanındakı Poylu arxını keçib, "erməni qəbiristanlığı"na, oradan da Ağstafa çayının sahilinə enə bilərdilər".

Qori Müəllimlər Seminariyasında, hətta onun Azərbaycan şöbəsinin Qazağa köçürülməsindən sonra Qazax seminariyasında da həm müəllimlərdə, həm də tələbələrdə məsuliyyət hissi çox güclü olmuşdur. Məsələn, müəllimlər sabah deyəcəyi dərsin məsuliyyətini bu gündən hiss etmiş və bu məsuliyyətlə bağlı olaraq böyük narahatlıq hissi keçirmişlər. Bunu təsdiq edən örnəklərdən biri kimi İsmayıl Şıxlının yazdıqlarına istinad edək: "Nazik, ucaboy, dalğalı saçını səliqə ilə daramış bir oğlan isə kənara çəkilib (söhbət Mehdixandan gedir – B.X.) heç kəsə qarışmırdı. O, ayaq üstə gəzinir, özözünə nə isə danışır, gah dayanıb fikrə gedir, gah da əl-qol atıb səsini ucaldırdı. Elə bil ki, onu heç nə maraqlandırmırdı. Əgər enlikürəkli, tökməbədənli, ortaboy bir oğlan ona yanaşmasaydı, bəlkə də o, axşama qədər beləcə öz-özünə danışacaqdı. Ancaq yoldaşı onu fikirdən ayırdı.

- Ay Mehdixan, Səmədi görmədinmi?

Dostunun gəlişindən o qədər də razı olmayan oğlan qaşqabağını tökdü.

- Ə, bu saat öz başımın hayındayam.

- Nə olub ki?

- Sabah dərs deyəcəyəm. Hesabdan nümunə dərsim var.

Oğlan gülümsündü.

- Mən də deyirəm nə olub, dərs deyəcəksən de, daha qaşqabağını niyə tökübsən?

- Sən də qəribə adamsan, ay Mirqasım, - deyə Mehdixan daha da ciddiləşdi.

-Ə, belə Firudin bəy özü mənim dərsimə gələcək. Onun qabağında sinfə girib dərs demək sənə asan gəlir? Hələ Əli əfəndini demirəm. Xəritədə şəhərləri gözüyumulu göstərməsən, üzümə də baxmaz". Görün, Mehdixan müəllim müəllimlik peşəsinə nə qədər məsuliyyətlə yanaşır. İndi belə müəllimlərə ehtiyac böyükdür.

İsmayıl Şıxlının Qazax müəllimlər seminariyasından gətirdiyi bəzi nümunələri yada salmadan əvvəl, bir məsələ barədə də qeyd etmək yerinə düşər. Bu da tələbələrin nizam-intizamı, zəng vurulan zaman vaxtında auditoriyalarda olmaları və auditoriyaya yığışıb hərənin öz yerində əyləşməsi, müəllimi səbirsizliklə gözləməsi məsələsidir. Bəzən müəllim nə qədər tələbkar olsa da, görürsən ki, tələbələrin bəziləri dərsə yubanır, zəng vurulandan sonra heç tələsmədən, narahat olmadan auditoriyaya daxil olur,

bununla da dərsi pozur, müəllimin və öz tələbə yoldaşlarının diqqətini dərsdən yayındırırlar. Halbuki bu istiqamətdə də vaxtilə yaxşı ənənə olmuşdur.

Forma və məzmun bir-birini tamamlamalıdır. Formasız məzmun, məzmunsuz forma yoxdur. Bəzən forma insanı çağırır, məzmun isə heç nədir. Bəzən isə forma adamı cəlb etmir, ancaq məzmun könüloxşayan, qəlbi fəth edən olur. Forma və məzmun məsələsi bütün sahələrdə var, o cümlədən elmdə, təhsildə, tədrisdə, məktəbdə, müəllimdə, tələbədə də. Bu mənada bəzən forması insanı özünə cəlb etməyən, maddi-texniki bazası olduqca zəif olan məktəblərimiz olub. Müqayisə üçün qeyd edək ki, indi məktəblərimizin maddi-texniki imkanları müasir tələblərə uyğundur. Ən ucqar bölgələrdə və kəndlərdə müasir məktəblər tikilibdir. Həmin məktəblərin maddi-texniki bazası olduqca müasirdir. Məktəblərə olan diqqət və qayğı artırılıb, bu da dövrün, zamanın tələblərinə uyğundur. Halbuki keçmişdə belə müasir məktəblər azlıq təşkil etmişdir. Məktəblərimizin maddi-texniki imkanları indiki kimi olmamışdır. Ancaq onda müəllimlərin cəfakeşliyi, fədakarlığı, doğrudan da, elm, təhsil, savad öyrətmək yolunda əzmkarlığı danılmaz fakt olmuşdur. Onlar elm, savad, bilik öyrətmək yolunda inqilab etmişlər, şüurda böyük dəyişiklik yaratmış, uşaqlarda elmə, təhsilə böyük həvəs oyatmışlar. Qori Müəllimlər Seminariyasının və Qazax müəllimlər seminariyasının məzunlarının cəfakeşliyi Azərbaycanın hər yerinə işıq saçmışdır. Bu mənada Mehdixan Vəkilovun simasında bəzi məqamları xatırlamaq yerinə düşər. İsmayıl Şıxlı yazır: “Qazax seminariyasının ilk məzunlarından olan Mehdixan Vəkilov bu sözləri (Firudin bəy Köçərlinin tələbələrinə müraciətini – B.X.) unutmadı. O, məktəbi qurtardıqdan sonra Quba, sonra da Vartaşen (Oğuz - B.X.) rayonlarında müəllimliyə başladı. İlk günlər çox çətinliklə keçdi. Məktəb binası yox idi. Uşaqların çoxu oxumağa gəlmək istəmirdi. Əsrlər boyu dəftər-kitabın nə olduğunu bilməyən adamlara savad öyrətmək üçün, hər şeydən əvvəl, onların şüurunda inqilab etmək lazımdı. Elm-mədəniyyətin əhəmiyyətini dərk etmədən onun uğrunda fədakarlıq göstərmək olmaz. Mehdixan Vəkilov başa düşürdü ki, müəllimlik o qədər də asan iş deyildir. O, çox çalışmalı, çoxları ilə üz-üzə gəlməli idi. İş nə qədər çətin olsa, bəhrəsi də bir o qədər şirin olar, demişlər. Doğrudan da belə oldu”.

İndi məktəb üçün lazım olan bütün ləvazimatlar var: kitab, dəftər, qələm və s. Məktəblər kompyuterlərlə təmin olunmuşdur. Valideynlər övladlarının yaxşı oxuması üçün valideynlik borcunu yerinə yetirir. Valideynlərin böyük əksəriyyəti, demək olar ki, hamısı istəyir ki, onların övladları bilikli, savadlı olsun, gələcəkdə hər hansı bir sahədə yaxşı mütəxəssis olsunlar. Ancaq uşaqların həvəsi, marağı, fədakarlığı azalıbdır. İndi uşaqların məlumat, bilgi almaq imkanları da genişdir. Dünyanın ən nüfuzlu universitetlərində təhsil almaq imkanları da az deyil. Ancaq yenə də həvəs, maraq, cəfakeşlik əvvəlki dövrlərdə olduğundan azdır. Elə bil ki, bir az asan, rahat yolla orta məktəbi başa vurmaq, yenə də həmin yolla ali məktəblərdə təhsil almaq, özünə əziyyət, zəhmət verməmək bir dəb halını alıbdır. Müəllimlərin bir qismi isə asan və rahat yolla fəaliyyət göstərmək, özünü əziyyətə salmamaq, elm, bilik öyrətməkdə cəfakeşliyi unutmaq yolu ilə gedirlər. Bəziləri lap dilinə də gətirir ki, cəfakeşlik, təəssübkeşlik ona qalmayıbdır. Yenə də İsmayıl Şıxlının Mehdixan Vəkilov barədə yazdıqlarını qeyd etməli oluruq: “Mehdixan Vəkilov indi də xatırlayır ki, ilk dəfə müəllimliyə başladığı kənddə uşaqların oturması üçün parta, yazı yazmağa dəftər, qələm də yox idi. Tez-tez onun yanına gəlib: “Ay müəllim, mənim oğlumun adını siyahıdan poz. Dədə-babamız oxuyub ki, o da

oxusun? – deyənlər də var idi. Qızları məktəbə cəlb etmək isə daha çətin idi. Bütün bu işlərə mane olub məktəbin bağlanmasına çalışan mollalarla da toqquşmaq lazım gəlirdi. Lakin bunların heç biri onu qorxutmadı”.

Həyat və fəaliyyətində qəti, qərarlı olanları, eləcə də prinsipial, zəhmətkeş, əzab-əziyyətdən qorxmayanları həmişə zəfər gözləyir. Sənətindən, peşəsindən asılı olmayaraq belələri həmişə yüksək zirvəni fəth edirlər, yüksək zirvədə əyləşirlər.

İnsanın tərcümeyi-halında və gələcək fəaliyyətində ilk müəllimi, oxuduğu orta məktəb və orada dərs deyən müəllimlər, eləcə də ali məktəb, oradakı müəllimlər və mühit böyük rol oynayır. Bu mənada Qori və Qazax müəllimlər seminariyası çoxlarının tərcümeyi-halında böyük məktəb olmuşdur. Bu məktəbi öyrənmək, onun ənənələrindən faydalanmaq təhsilə yalnız və yalnız fayda gətirə bilər. Qori və Qazax müəllimlər seminariyalarının məzunlarının isti nəfəsi Azərbaycanda həmişə hiss etdiyimiz belə məzunlardan biri də Üzeyir Hacıbəyov olmuşdur. Mənə elə gəlir ki, Üzeyir Hacıbəyovun xalqımızın iftixarına çevrilməsində, onun dahi bəstəkar olmasında, neçə-neçə yüzilliklər boyu xalqımızla addımlayacağının bir səbəbi onun istedadıdırsa, digər bir səbəbi də onun Qori Müəllimlər Seminariyasını bitirməsidir. Bu seminariyanın onun istedadının açılmasında və çiçəklənməsində yaratdığı şəraitdir, imkandır. Adətən istedadın imkanlarını mühit, şərait üzə çıxarmaqda heç də az rol oynamır. Bu mənada, heç şübhəsiz ki, Qori Müəllimlər Seminariyası Üzeyir Hacıbəyovun imkanlarının üzə çıxmasında ona qüvvət, böyük ruh və tükənməz enerji vermişdir. Bizim hər birimiz qürurla deyirik ki, Üzeyir Hacıbəyov da Qori Müəllimlər Seminariyasının məzunu olmuşdur. O, şöhrəti ilə bu seminariyaya böyük şərəf gətirmiş, bu seminariyanın adını daha da ucalara qaldırmış, bu seminariyanı bütün dünyaya tanıtmışdır. Adətən istənilən bir orta məktəbin, ali məktəbin elə məzunları olur ki, onlar məzunu olduqları məktəblərə başucalığı gətirir, məşhurlaşdıqda oxuyub təhsil aldıqları məktəbləri də tanıdırlar. Ancaq bununla belə, məzunu olduqları məktəbə ömrü boyu borclu olurlar. İsmayıl Şıxlı Üzeyir Hacıbəyovun nüfuz qazanması, əsərlərinin xalq arasında geniş yayılması, ilk andan dillər əzbəri olması sirrini aydınlaşdırmağa çalışır. O yazır: “... Üzeyir Hacıbəyovun musiqisi sadə xalq musiqisidir, sözün əsl mənasında milli musiqidir. Elə buna görə də izahsız və şərhsiz dünyanı ayaqlayıb gəzir, yer kürəsində yaşayan xalqların dillərində, Çindən tutmuş Amerikaya qədər Azərbaycan ruhunu, Azərbaycan musiqisini yaşadır”. İsmayıl Şıxlı ikinci bir cəhət barədə yazır: “İkinci cəhət də odur ki, Üzeyir Hacıbəyov xarakterlər, dramaturji ziddiyyət və gərginliklər yaratmaqda heyrətamiz dərəcədə məharətlidir. Böyük sənətkar opera və musiqili komediyalarında həm də zamanın ictimai-siyasi toqquşmalarını, sinfi tənasüblərin ziddiyyətlərini çox gerçəkliklə qələmə almışdır”. Mən deyərdim ki, ziddiyyətləri çox gerçəkliklə qələmə almaqla, surətlərin xarakterlərini, psixologiyasını, düşüncə tərzini musiqi və dramaturji zənginliklərin vəhdətində ona görə uğurla verə bilmişdir ki, o, yazıçı və bəstəkar olmaqdan əvvəl müəllimdir. Xalqın ruhuna, təbiətinə, dünyagörüşünə, tarixinə dərindən bələd olan müəllimdir. O, xalqın tarixinin bütün incəliklərini dərindən bilən müəllimdir. Məhz bu müəllimlik imkan vermişdir ki, Üzeyir Hacıbəyov müəllim-yazıçı, müəllim-bəstəkar kimi başqalarından fərqlənsin. Məhz bu müəllimlik imkan vermişdir ki, Üzeyir Hacıbəyov yardıcılığında uğurlar qazansın. Bir sözlə, Üzeyir Hacıbəyovun yaradıcılığındakı uğurun kökü müəllimlikdən yazıçılığa və bəstəkarlığa doğru ayrılan yoldadır. Həmin yol müəllimlikdən başlayır.

Müəllimlik Üzeyir Hacıbəyovun humanistliyini, qayğıkeşliyini, insanpərvərliyini, xeyirxahlığını yüzə-min qat artırmışdır. Üzeyir Hacıbəyov müəllimlərə çox diqqətlə, qayğıyla yanaşmışdır. İsmayıl Şıxlı yazır ki, onun keçmiş müəllimi Osman Əfəndiyevi haqsız olaraq müəllimlikdən çıxarıblarmış. Osman Əfəndiyev vaxtilə Qori Müəllimlər Seminariyasında Üzeyir Hacıbəyovla birlikdə oxumuşdur. O, uzun müddət Qazax rayon maarif şöbəsinin müdiri olmuşdur. Osman Əfəndiyev Bakıya – Maarif Komissarlığına gəlməli olur. İsmayıl Şıxlını da özü ilə birgə Maarif Komissarlığına aparır. Onlar pilləkənləri qalxıb ikinci mərtəbənin geniş dəhlizinə çıxanda ortaboylu, saçları ortadan səliqə ilə ayrılıb yana daranmış eynəkli bir adamla qarşılaşırlar. Bu, Ü.Hacıbəyov imiş. O, Osman müəllimi tanıyır və ayaq saxlayıb xeyli dayanır. Görünür ki, keçmişi-Qori Müəllimlər Seminariyasındakı tələbəlik illərini xatırlayır. Hər ikisi qucaqlaşırlar.

Osman müəllim xatırlayır ki, "səhər oyananda öz paltarımın izi-tozu da qalmamışdı. Yevdokiya İvanovna (müəllimənin adını sonra öyrəndim) mənə nimdaş, amma tərtəmiz sırıqlı pencək-şalvar verdi, ayağıma dolamağa isti parça, dolaq verdi, hətta şinelimi də təzələdi".

Müəllimi razı salmaq, Allahın yanında bütün günahları yumaq kimi bir şeydir. Ona görə ki, Allah dünyanın əşrəfi olan insanı yaratdı və onun təlim-tərbiyəsi ilə məşğul olmağı müəllimə həvalə etdi, müəllimə tapşırdı, bir sözlə, müəllimə inandı. Müəllim bu inamı qorumalı, cəmiyyət isə müəllimə ehtiram və hörmətini əsirgəməməlidir. Belə olarsa, cəmiyyət inkişaf edər, irəliyə doğru gedər, təhsil tərəqqi edər, hər bir insan bu tərəqqidən faydalanar.

İ.Şıxlının yalnız pedaqoji fikirləri deyil, eyni zamanda onun həyat yolu da bugünkü gənclər üçün əsl məktəbdir.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**


1. Elçin. Ədəbiyyatımızın yaradıcılıq problemləri. Bakı, 1999.
2. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. I cild, Bakı, 2011.
3. Hüseynov Ə. Tənqid və ədəbi proses. Bakı, 2009.
4. Şıxlı İ. Dəli Kür. Bakı, 1982.
5. Nəzirli Ş. Vurğun keçib bu yerlərdən. Bakı, 1986.
6. Salamoğlu T. Ən yeni Azərbaycan ədəbiyyatı. Bakı, 2008.
7. Seyidov F. Azərbaycan müəllimlərinin hazırlanmasında Zaqafqaziya (Qori) seminariyasının rolu. Bakı, 1966.


**Б.Халилов**

**О личности и авторитете учителя**

**Резюме**

В статье повествуется о мыслях Исмаила Шихли, личности и авторитете учителя. Он вспоминает свих учителей с добрыми словами.

**B.Khalilov**

**Teacher personality and teacher influence**

**Summary**

The article is dedicated to the great poet Ismail Shikhli's personality and his ideas about teachers. It is noted that he remembers his teachers with great love and pleasure.

***İlk dərsliklərimiz***

# "BALALARA HƏDİYYƏ"

**Mehriban Şirzadova**
***pedaqogika üzrə fəlsəfə doktoru***

***Açıq sözlər:*** *balalara hədiyyə, milli-mənəvi dəyərlərimiz, nağıl, məsəl, tapmaca və şeirlər.*
***Ключевые слова:*** *подарок детей, национально-духовные ценности, рассказ, пословицы, загадки и стихотворение.*
***Key words:*** *gift to children, national moral values, tale, sayings, riddle and poems.*

Azərbaycan uşaq ədəbiyyatının inkişafına nəzər saldıqda bir sıra kitabçalar və dərsliklərin yeri daha aydın görünür. Yüz il bundan əvvəl nəşr olunan "Balalara hədiyyə" adlı əsər bu cəhətdən daha xarakterikdir. Ədəbiyyata qüdrətli bir tərbiyə vasitəsi kimi baxan hər bir ədib və şairin başlıca arzusu məhz oxucusunun qəlbinə girməkdən, ona təsir göstərməkdən ibarətdir. Ancaq yüksək hislər, nəcib duyğular əsasında ürək qanı ilə yazılan əsərlər belə böyük bir təsir gücünə malik ola bilərlər.

"Balalara hədiyyə" kitabçası göstərir ki, körpə uşaqların tərbiyəsi ilə bağlı fikirlər öz dövründə böyük əhəmiyyət kəsb etməklə qalmamış, həm də körpə uşaqlarda xalqımızın milli-mənəvi dəyərlərinin formalaşmasında müəllim tərbiyəçi və valideynlərə yaxından kömək etmişdir.

"Balalara hədiyyə" kitabçasının mündəricəsini heyvanat aləmi, nağıllar, hekayələr, nəğmələr, əkinçilik məhsulları, doğruçuluq və düzlük, məsəllər, nəsihətlər, tapmacalar, təbiət hadisələri, ilin fəsilləri və s. təşkil edir. Uşaq psixologiyasının mahir bilicisi olan F.Köçərli mütərəqqi pedaqoji ideyalara istinad edərək körpə uşaqları onları əhatə edən əşyalar, hadisələr əsasında tərbiyə etməyə üstünlük verirdi. O, çox gözəl bilirdi ki, körpə uşaqlar ətraf aləmi əşyalarla dərk edir. Onların dünyagörüşü ətraf mühitin təsiri altında formalaşır.

Məhz bunun nəticəsi idi ki, bu dərslik çapdan çıxarkən tərəqqipərvər oxucular, müəllimlər tərəfindən rəğbətlə qarşılanmışdır. Görkəmli yazarlar bu kitab haqqında öz ürək sözlərini söyləmişlər. Dövrünün tanınmış ziyalısı, görkəmli Azərbaycan ədibi və publisisti Eynəli bəy Sultanov (1862-1935) yazırdı ki, "Balalara hədiyyə" kitabından vətən qoxusu, dağların ətri, köçərlilərin tüstüsü gəlir (2, səh. 28). 1912-1915-ci illərdə Bakıda nəşr olunan gündəlik ədəbi, elmi, siyasi və iqtisadi qəzet olan "İqbal" qəzetinin 23 may 1913-cü ildəki 366-cı sayında bu kitabça ilə bağlı çıxış edən Kazımoğlunun "Balalara hədiyyə" adlı məqaləsi bu baxımdan çox xarakterikdir. Məqalə müəllifi əvvəlcə son zamanlar Bakıda nəşr edilən kitab və məcmuələri təhlil edərək belə nəticəyə gəlir ki, bu nəşrlərin içərisində dəyərlisi varsa da çoxu dəyərsizdir. Müəllifin fikrincə, əcnəbi dillərdən tərcümə edilmiş roman və hekayələr, həmçinin onları təqlidən yazılmış kitabçalar xalqın həyat tərzinə, təbiətinə yad və biganədir.

Müəllif ana dilimizdə çap edilmiş kitabçaları nəzərdən keçirərək belə qənaətə

gəlir ki, Nəcəf bəy Vəzirov ilə Y.Çəmənzəminlinin hekayələri bu mənada özümüzün həyat və yaşayışımızı təsvir edən əsərlər kimi daha çox qiymətlidir. Həmçinin M.Ə.Sabirin "Hop-hopnamə"si mətbuat aləmində dəyərli əsərlərdəndir. Bütün bunlarla bərabər müəllif yazır ki, "ən dəyərli və qiymətli, dinləməyə layiq olan bədii nümunələri özündə cəmləşdirmişdir. Hərçənd bu kitab, zahirdə uşaqlar üçün yazılmışdırsa, lakin bütün məzmunu və mahiyyəti ilə türklüyə mənsub nağıl və hekayələri, Qafqaz türklərinin ata-babalardan qalma düzgü və tapmacaları, milli misal və nəğmələri, uşaqlara məxsus oyuncaqları toplayaraq bizi keçmişimiz ilə tanış edir, bizi kəndimizə tanıtdırır və keçmişimizə qarşı bizdə milli bir duyğu oyadır".

Məqalə müəllifi bu kitaba birinci kitab deməkdə haqlıdır. Belə ki, bu kitab uşaqların ruhuna qida verdiyi kimi, böyüklərin də uşaqlıq illərini bir növ xatırladır, keçmişinə və millətinə qarşı bir istək və məhəbbət duyğusu oyadır. Məqalədə oxuyuruq: "Bu gün bütün türk qövmü  sakin olan yerlərdə bu kimi hədiyyələr nəşr edilsəydi, millətimizə və dilimizə böyük bir xidmət edilmiş olardı. Belə ki, babalarımız arasında söylənən və işlənən misal və tapmacalardan, nəğmə və düzgülərdən xatirimizdən unudulmuş bir çox türk sözləri öyrənərdik və əvəzində danışdığımız əcnəbi sözlərini dilimizdən və yazımızdan kənar edərdik".

Tanınmış ədib, Azərbaycan ədəbi, pedaqoji və elmi fikrinin görkəmli simalarından olan Abdulla Şaiqin (1881-1952) isə "İqbal" qəzetinin 18 və 21 oktyabr 1913-cü il, 482 və 485-ci saylarında dərc edilmiş və əsərlərinin beş cildliyinin dördüncü cildinə daxil olmuş "Dilimiz və ədəbiyyatımız" adlı məşhur məqaləsi bu sahədə ən etibarlı, ən dəyərli və maraqlı mənbədir. Müəllif həmin məqaləsində yazırdı ki, "bizim el ədəbiyyatımız o qədər vüsətlidir ki, onu yazmaqla qurtaracaq şeylərdən deyil. Millətimizin istedad və məharəti-fitrilərinə və əhvali-ruhiyyəsinə aşina olmaq istəyənlər "Balalara hədiyyə" nam kitabçasından istifadə edə bilərlər. Burada camaatımızın arasındakı nağıl, məsəl, tapmaca və şeirləri bir yerə toplanmışdır. Qafqaz müsəlmanlarının boynuna böyük bir haqq qoymuşdur. Söz yox ki, itmiş-batmış o qiymətli gövhərləri cəm etmək ağır zəhmət hesabına başa gəlmişdir".

A.Şaiq, ümumiyyətlə, xalq dilinin, ədəbi dilimizin keşiyində duran ziyalılarımızdan olduğundan onun təmizliyi uğrunda mübarizənin ön cərgəsində getmişdir. O, yuxarıda adını çəkdiyimiz məqaləsində yazırdı: "hər bir dil iki qismə ayrılır: birincisi, təbii allah vergisi olan el dilidir; ikincisi, hər qövmün ədib və şairlərinin əsrlərcə hüsula gətirdikləri mükəmməl ədəbi bir lisandır. Birincisi lisan, ikincisi ədəbiyyatdır".

Təbii Allah vergisi olan el dilimiz asan və olduqca gözəl bir lisandır. Bunu yalnız biz iddia etmirik. Baxınız, Avropa üləmasından Maks Müller türk lisanı xüsusunda nə deyir: "Türk lisanı fövqəladə, müəyyən və məntiqə müvafiq surətdə mükəmməl olmaqla bu dil bütün Asiya üçün bir lisani-ümumi yerinə keçə bilər. İnsaf edək: qonşularımız ermənilərin, gürcülərin əksəri azərbaycanca söyləməyə bu anadək həvəs etmələri, toylarında, bayramlarında öz erməni sazəndələrinə Azərbaycan şərqisi, Azərbaycan nəğmələri oxutmaları lisanımızın ahəngdar və gözəl olduğuna dəlil olmazmı? Əlavə, hansı bir lisanda Azərbaycan lisanında olan kimi el ədəbiyyatı vücuda gəlmişdir?" (4, səh. 118-119).

A.Şaiqin haqqında bəhs etdiyimiz məqaləsini nəzərdən keçirərkən oxucuda belə bir fikir hasil olur ki, "Balalara hədiyyə" kitabçası böyük ədibə elə güclü təsir edib ki, o da bir növ ruhlanıb, xalq deyimlərinə, xalq ədəbiyyatına dair fikir və bilgilərini qələmə almış, bu mövzunu bir qədər də dərinləşdirmiş, ona yeni məzmun vermiş-

dir. A.Şaiq göstərilən məqaləsində yazırdı: “Məişətimizin birər aynası olan hədsiz-hesabsız bayatı və şikəstələrimiz, məsəllərimiz, tapmacalarımız, ürəkləri ən dərindən çırpındıran, ruhları səmadakı şəfəqlərə qədər yüksəldən mahnılarımız, nəğmələrimiz qibtə ediləcək səadətlərdir, deyilmi?” (4, səh. 119).

Bütün bunları nəzərə alaraq F.Köçərlinin “Balalara hədiyyə” kitabının məziyyətlərindən bəhs etməzdən əvvəl böyük ədibimizin xalqımızın ağız ədəbiyyatına, xalq pedaqogikamızın incilərinə aid fikirlərindən bir qədər bəhs etmək fikrimizcə yerinə düşər. A.Şaiq yazırdı: “Hələ əsrlərdən bəri ağızdan-ağıza keçmiş aşıqlarımızın oxuduğu yanıqlı şeirlər, mahnılar, hekayələr, nağıllar heç bir millətdə görünməmiş qiymətli bir xəzinə olduğunu iddia edərsək, xəta deyil zənn edirəm. Bu isə haqq-taala həzrətlərinin bizə bəxş etdiyi qiymətsiz, ən böyük nemətdir”.

A.Şaiq nümunə üçün bir neçə bayatını göstərir.

A.Şaiq yazır ki, məşuqəsi uğrunda nə qədər fədakar bir aşiq olursa-olsun, qəlbindəki hissiyyatının tərcümanı olan bu sözlərdən artıq nə söyləyə bilər? Bu sözlər oxunduqda biixtiyar qəlbimizin ən dərin guşələrində gizli-gizli düşüncələr və incə hislər oyanmağa başlar.

Və yaxud: zatən ən fədakar və həqiqi aşiqlərin gecə yarı, ay batdığı və təbiəti həzin bir qaranlıq, bir sükut qapladığı zaman sövdaları artmağa başlar. O qaranlıq, o sükutdan istifadə edərək gizli-gizli gözyaşları tökərlər:

Bostanda tağım ağlar,
Basma, yarpağım ağlar,
Nə qədər sağam, ağlaram,
Ölsəm, torpağım ağlar.

A.Şaiq yazır ki, “bu sözlərin zahiri və batini lətafətinə diqqət buyurulsun! Az söz ilə təsvir olunmuş bu fikirdəki məziyyatı təhlil etmək, son baharın qürub zamanında matəmzədə bülbülün fəryadındakı həzin sərairi aramağa bənzər. Hətta müxatəbi olan qara torpaqlar altında yatan dilbər, qara saçlarını dağınıq bir halda dağıdaraq, uçuq və soluq rəngi ilə önümüzdə mücəssəm olur və bizimlə bərabər acı-acı gözyaşları tökən kimi görünür”.

A.Şaiq xüsusi olaraq vurğulayır ki, millətimizin fikrinin ülviyyətindən naşidir ki, hər bir dəlili və təşbihi təbiidir. Təbiət ağuşunda pərvərişyab olduqları üçün heç bir zaman təbiətdən ayrılmır. Növhələrində, mərsiyələrində belə təbiəti özü ilə bərabər ağladır:

Əzizinəm, baş əyər,
Barlı budaq baş əyər,
Qiyamət o gün qopar
Mərd namərdə baş əyər.

A.Şaiq öz fikrini aşağıdakı atalar sözləri ilə tamamlayır: “Keçmə namərd körpüsündən, qoy aparsın sel səni. Yatma tülkü kölgəsində qoy yesin aslan səni”.

A.Şaiq bu bayatılardan sonra qışda aranda, yayda yaylaqlarda olan köçərilərin həyat tərzini, onların əhvali - ruhiyyəsini əks etdirən əhvalatlardan ürək dolusu bəhs edir. Həmin məqalədə deyilir: “İndi bir az da dağlarda, yamaclarda, təbiətin ağuşi-nazəninində böyümüş köçəri camaatımızın əhvaliruhiyyəsini tədqiq edək: köçəri camaatın hər bir dolanacağı qoyun ilədir, başdan-ayağacan qoyuna möhtacdır”. Odur ki, onların xalq ədəbiyyatında qoyunçuluqla bağlı deyimlər aparıcı yer tutur.

Unudulmaz maarifçi, böyük pedaqoq, Azərbaycan xalq yaradıcılığının mahir bilicisi olan A.Şaiq daha sonra ürək ağrısı ilə deyir: “Yeganə sərmayəsi və sərvəti olan qoyunu el, baxınız, nə qədər dadlı, şirin bir dil ilə oxşayır, gözümüzün önündə hər bir-iki fərd ilə öz məişətimizdən şairanə lövhə tərsim edir. Daxili aləmindən çıxan məişətə və təbiətə dair bu qisim şeirlər, camaatımızın

* 6

sağlam bir fikir və ülvi hissə malik olduğunu göstərdiyi kimi, dilimizin dəxi nə qədər gözəl və lətif bir dil olduğunu sübut edir".

A.Şaiqin adını yuxarıda böyük iftixarla çəkdiyimiz məqaləsində iki cəhət: bir tərəfdən ana dilimizin zənginliyi, digər tərəfdən isə xalq yaradıcılığının məziyyətləri bir daha göz önündə canlanır.

A.Şaiqin gəldiyi nəticə belədir: "Bizim el ədəbiyyatımız o qədər vüsətlidir ki, onu yazmaqla qurtaracaq şeylərdən deyil. Millətimizin istedad və məharəti-fitrilərinə və əhvali-ruhiyyəsinə aşina olmaq istəyənlər möhtərəm bəradərim Firidun bəy Köçərli cənablarının təlif etdiyi "Balalara hədiyyə" nam kitabçasından istifadə edə bilərlər. Həqiqətdə bəradərim Firidun bəy camaatımızın arasındakı nağıl, məsəl, tapmaca və şeirləri bir yerə toplamaqla Qafqaz müsəlmanlarının boynuna böyük bir haqq qoymuşdur. Söz yox ki, itmiş-batmış o qiymətli gövhərləri cəm etmək Firidun bəy cənablarına ağır zəhmət ilə müyəssər olmuşdur" (4, səh. 122-123).

Yuxarıda deyilənlərə rəğmən "Balalara hədiyyə" kitabına nəzər salaq. Cəmi 87 səhifədən ibarət olan bu kitaba daxil edilmiş xırda hekayələri, nağılları, nəğmələri, oyun qaydalarını, düzlüklər, sayaçı sözlər, məsəllər, tapmacalar, yanıltmaclar və s. mövzuları aşağıdakı kimi qruplaşdırmaq olar:

1. Ev heyvanlarına aid olanlar: it və pişik, toyuq, qoyun, keçi, dəvə və s.
2. İnsan və heyvanlara aid olanlar: xoruz və padişah, qarı və pişik.
3. Vəhşi heyvanlara aid olanlar: qurd, tülkü.
4. Kənd təsərrüfatı məhsulları: balıqlar, arpa, darı.
5. Nağıllar: şəngülüm, şüngülüm, məngülüm. Pıspısa xanım və siçan bəy.
6. Təbiət: dağlar, aranla yaylağın bəhsi.
7. Sayaçı sözlər və s. və i.a. (5, səh. 3-87). Kitabın məziyyətlərindən biri də budur ki, buraya daxil olan materiallar körpə uşaqların yaş və bilik səviyyəsinə tam uyğun olmaqla bərabər, onların maraq dairəsinə də müvafiqdir.

Bu gün məktəbəqədər tərbiyə müəssisələrində çalışan tərbiyəçilərin, kiçikyaşlı uşaqları olan valideynlərin bu mövzulardan yararlanaraq övladlarımızın tərbiyə edilməsində müvəffəqiyyətlər qazanmaları şübhəsizdir.

"Balalara hədiyyə" kitabçasına daxil edilmiş materiallar elə seçilmişdir ki, bunların hər birini oxumaq və ya dinləməklə uşaqlar çox şey öyrənə bilirlər, onların fikri daha da aydınlaşır, həyat və məişət haqqında təsəvvürləri bir qədər də genişlənir, danışıqları yaxşılaşır, tələffüzləri dəqiqləşir. Kitabdakı mövzuların bir çoxu, məsələn, şeirlər, tapmacalar, yanıltmaclarla yanaşı, uşaqlar tərəfindən səhnələşdirmək imkanı nöqteyi-nəzərincə çox yararlıdır.

76-77-ci səhifələrdə yer almış Aşıq Əmraha məxsus olan "Aranla yaylağın bəhsi"ndə deyilir:

Aran deyər, yaylaq çox da saxlama,
Göndər gəlsin, ağır ellər mənimdir.
Yerin göbəyiyəm, dizin dirəyi,
Malu-mülkü Süleymanlar mənimdir.
Yaylaq deyər: Çıxma dindən, imandan
Süsəndən, sünbüldən, hər gülüşəndən
Həkimlik, loğmanlıq qalıbdı məndən,
Həzaran dərdlərə dərman mənimdir.

Kitaba daxil edilmiş maraqlı əhvalatlardan "Çoban", "Qurd", "Qoyun" və "Keçi" başlıqlı şeirlər, həmçinin "bişmişlər, çöəklər və içkilər" barəsində verilən məlumat-bilgilər körpə uşaqlar üçün çox xarakterikdir. "Çoban" başlıqlı şeirdə oxuyuruq:

Göydəki göy buludlar
Yorğanıdır çobanın,
Yastı-yastı təpələr
Yastığıdır çobanın.
Yumru-yumru qayalar

Yumruğudur çobanın.

Şeirin sonunda aşağıdakı məsəllər və çöl heyvanları yer almışdır.

"Çobanın könlü olsa, təkədən pendir-tutar",

"Çobanı özündən olanın qoyunu dişi doğar".

"Keçinin əcəli çatanda çobanın dəyənəyinə sürtüşər" və s.

Bişmişlərə nümunə üçün "Səməni" adlı şeir kitaba daxil edilmişdir. Orada deyilir:

Səməniyə saldım badam,
Qoymazlar bir barmaq dadam,
Dörd tərəfin alıb adam,
Səməni bizana gəlmişəm,
Uzana-uzana gəlmişəm.

Yuxarıda qeyd etdiyimiz kimi, kitaba daxil edilən ev heyvanlarından qoyun, keçi, inək, eşşək və dəvə ilə bağlı şeirlər və məsəllər, tapmacalar körpə uşaqların maraqla dinlədikləri və əzbərlədikləri şeirlərdir.

Bu gün məktəbəqədər müəssisələrdə tərbiyə alan körpə uşaqların ən çox sevdiyi, böyük maraqla və həvəslə səsləndirdikləri "qızlar nəğməsi"nin kitaba daxil edilməsi "Balalara hədiyyə" kitabçasının böyük uğurlarından biridir. "Qızlar nəğməsi" şeiri də ilk dəfə oxuculara təqdim edilirdi.

Kitabçada haqqında söhbət etdiyimiz şeirin sonunda üç məsəl və bir tapmaca yerləşmişdir.

"Can versən, qardaşa ver, min il getsə yad olmaz",

"Yaxşı gündə yad qonşu, yaman gündə vay qardaş",

"Qızın oldu, qırmızı donunu çıxar".

"Balalara hədiyyə" kitabına daxil edilən oyunlar: "Güdü- güdü", "Vur nağara, çıx qırağa" adlı oyunlar körpə uşaqların sevimli oyunlarındandır.

Kitabın sonunda kitaba daxil edilmiş tapmacaların cavabları çox maraqlıdır.

"Balalara hədiyyə" kitabı akademik Bəkir Nəbiyev tərəfindən tərtib edilərək onun redaktorluğu ilə kiçikyaşlı uşaqlar üçün ümumi başlıq adı altında 1967-ci ildə "Gənclik" nəşriyyatı tərəfindən rus qrafikasında çap edilmişdir. Çox təəssüf ki, kitabçanın latın qrafikalı əlifba ilə çapı hələlik əlimizdə yoxdur.

Burada gənc nəslin tərbiyəsində müəllimlərin rolunu və xidmətini ayrıca qeyd edən sətrlər də vardır. Öz fəaliyyəti üçün pedaqoji sahəni seçən hər bir müəllim-tərbiyəçi "ağlı, biliyi, zəhmətsevərliyi ilə yanaşı, həm də uşaqlara məhəbbət və qayğı ilə döyünən ürəyə malik olmalıdırlar". Akademik Bəkir Nəbiyevin yazdığı kimi, xalqın gələcəyi, onun ən zəngin və qiymətli mənəvi xəzinəsi olan balaları yalnız onlara məhəbbəti olan adamlar tərbiyə edib yetişdirə bilərlər. Kitabın müəllifləri göstərirdi ki, təbiətən çox həssas olan azyaşlı uşaqlar kimin onlara necə münasibət bəslədiyini yaxşı duyur. Buna görə də onun mənliyini təhqir etmək bu həssas məxluqu dünyada hamıdan yüksək və nəcib saydığı öz müəllimindən uzaqlaşdıra bilər.

Bu fikirlər böyük rus pedaqoqu K.D.Uşinskinin (1824-1870) aşağıdakı fikirləri ilə necə də səsləşirdi. K.D.Uşinski deyirdi: "Tərbiyəçinin şəxsiyyətinin cavan ruha olan təsiri elə bir tərbiyə qüvvəsidir ki, onu nə dərs kitabları ilə, nə əxlaqi nəsihətlərlə, nə də cəza və mükafat sistemi ilə əvəz etmək olar" (8, səh. 39). F.Köçərli bu fikirdə idi ki, "uşaq nə qədər bədxasiyyət və gəçqılıq olmuş olsa belə, onu məhəbbət və mehribanlıqla düzəltmək mümkündür. Əxlaq tərbiyəsi çubuq, zor və qorxu ilə ola bilməz".

Azərbaycan pedaqoqları həmişə bu fikirdə olmuşdur ki, körpə uşaqların mənəvi-əxlaqi tərbiyəsində məktəblə yanaşı, ilk növbədə, ailənin də rolu danılmazdır. F.Köçərli yazırdı ki, "uşaq öz bilik və xasiyyəti-mənəviyyəsinin əsas dünyasını ailədə alır.

Burada onun qəlbinə bəyənilmiş xasiyyətlərin, yaxud qəbahətlərin toxumu saçılır, ailədə hökm-fərman olan mənəvi məfkurələr yavaş-yavaş onun qəlbində yer eyləyir".

"Balalara hədiyyə" kitabında məqsəd xalqı maarifləndirməkdən, mədəniləşdirməkdən ibarət olmuşdur. XX əsrin maarifçiləri ictimai bəlaların kökünü cəhalətdə, nadanlıqda, elmsizlikdə görür, maarifə, elmə xalqı azadlığa çıxaran bir vasitə kimi baxırdılar. Onlar xalqı qəflət yuxusundan ayıltmağa cəhd edirdilər. S.Ə.Şirvaninin "Nadanlıq dərdinin dərmanı elmdir", "hər kimin elmi var, o insandır" müddəasını təbliğ edirdilər.

Böyük maarifçinin arzuları zəmanəmizdə həqiqətə çevrildi. O, gələcəyə inamla baxır, gənc nəsil ilə bərabər ədib və şairlərimizin də qədr və qiymətinin bilinəcəyinə inanırdı. Müstəqil, suveren Azərbaycanda onun bu arzuları da yerinə yetirildi.

*Rəyçi: pedaqogika üzrə fəlsəfə doktoru E.Məmmədova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Abbas Zamanov. "Firidun bəy Köçərli" monoqrafiyası haqqında. Azərbaycan SSR EA-nın xəbərləri. İctimai elmlər seriyası, 1964, № 1, səh. 125- 127.

2. Ruqiyyə Qənbər qızı. "Firidun bəy Köçərli və onun "Azərbaycan ədəbiyyatı əsəri". F.Köçərli Azərbaycan ədəbiyyatı, iki cilddə, birinci cild, Bakı: Elm, 1978, 595 səh. Redaktoru: Əziz Mirəhmədov.

3. "İqbal" qəzeti. 23 may 1913, № 366.

4. Abdulla Şaiq. Əsərləri beş cilddə. dördüncü cild, Bakı: Azərnəşr, 1972, 477 səh.

5. F.Köçərli "Balalara hədiyyə". Bakı: Gənclik, 1967, 87 səh.

6. F.Köçərli. "İrəvan quberniyası xalq məktəbləri müəllimlərinə müraciət". "Kaspi" qəzeti, 5 noyabr, 1905.

7. K.D.Uşinski. Seçilmiş pedaqoji əsərləri. Bakı: Azərnəşr, 1953.

8. Bəkir Nəbiyev. Firidun bəy Köçərli. Mənalı ömürdən səhifələr. Bakı: Gənclik, 1984, 226 səh.

**М.Ширзадова**

**"Подарок детей"**

**Резюме**

В статье анализируются и оцениваются вклад и ценности, которые внесены в национально - духовное богатство азербайджанского народа.

**M.Shirzadova**

**"Gift to children"**

**Summary**

In this article national moral values and national spiritual wealth of Azerbaijan people is analyzed.

***Metodika, qabaqcıl təcrübə***

# ALİ MƏKTƏBLƏRİN RUS QRUPLARINDA AZƏRBAYCAN DİLİNİN TƏDRİSİNİN BƏZİ MƏSƏLƏLƏRİ

**Səfurə Gözəlova, Suqra İmanova**
***Azərbaycan Dövlət Neft Akademiyasının baş müəllimləri***

***Açar sözlər:*** *dövlət dili, qrammatik tələblər, düzgün tələffüz.*
***Ключевые слова:*** *государственный язык, грамматические потребности, правильное произношение.*
***Key words:*** *state language, grammar demands, correct pronunciation.*

Azərbaycan dili dövlət dili kimi bütün ali məktəblərdə tədris olunmaqla Azərbaycan Respublikası Konstitusiyasının hüquqi tələblərindən birinin yerinə yetirilməsini təmin edir. Respublikada yaşayan vətəndaşların dövlət dilini öyrənmələrinə hər cür şərait yaradılmışdır. Ali məktəblərdə təlim rus dilində aparılan qruplarda təhsilalan tələbələrə dövlət dili kimi Azərbaycan dilinin öyrədilməsinə də bu aspektdən baxılmalıdır. Bu qrupun tələbələri Azərbaycan dilində oxu və yazı üzrə müvafiq nitq vərdişlərinə yiyələnərək gənclik illərindən cəmiyyətdə, onun müxtəlif sahələrində informativ-kommunikativ fəaliyyət göstərmək üçün əlaqə və ünsiyyət bacarıqlarına sahib olurlar.

Azərbaycan dilinin mənimsədilməsi tələbələrin bu dildə olan elmi-kütləvi və bədii ədəbiyyatları, radio və televiziya verilişlərini, qəzet və jurnalları izləməsinə, onların vasitəsilə bilik və məlumatlar əldə etməsinə şərait yaradır, onların həyatı öyrənmək imkanlarını genişləndirir. Dil və nitq vahidlərinə həssas yanaşmaq, onlardan ehtiyatla istifadə etmək, ümumilikdə dili qorumaq və inkişaf etdirməklə tələbələrdə ümumi bacarıqlar formalaşır və onlar cəmiyyətin daha fəal üzvləri kimi yetişirlər.

Bununla yanaşı, ali məktəblərin rus qruplarında Azərbaycan dilinin tədrisi prosesində tələbələrin (əgər qeyri-azərbaycanlıdırsa) öz ana dilinə müraciət etmələri, yeri gəldikcə doğma dildəki leksik, fonetik, qrammatik tələblərin xüsusiyyətlərini yada salmaları, bədii nümunələrə münasibət bildirmələri də onların, ümumiyyətlə, ana dili və ədəbiyyatla bağlı bilik və bacarıqlarının möhkəmlənməsinə kömək edir. Onlar həm də Azərbaycan dilini öyrənməklə dünyada geniş yayılmış türk dillərinə bələd olur, türk dilli ölkələrdə və bu ərazilərdə fəaliyyətlərini səmərəli qurmaq imkanları əldə edirlər. Bu da onların həmin dildə nitqini inkişaf etdirməyə kömək edir və onlarda natiqlik məharətinə maraq oyadır.

Beləliklə də, onlar Azərbaycan dilini praktik mənimsəməyə nail olurlar. Bu yolla da onlarda Azərbaycan dilinə hörmət və məhəbbət hissi formalaşdırılır. Ən yaxşı halda həm də gənclik illərindən Azərbaycan dilində düşünmək, ünsiyyət məqamına görə fikri sərrast ifadə etmək, zəruri yazı qaydalarını tətbiq etmək bacarıqlarına da yiyələnə bilirlər.

Bu da təsadüfi deyildir. Çünki qloballaşan dünyada Azərbaycan dinamik və sabit

inkişaf edən dövlətlər sırasındadır. Bu mənada azərbaycanlı tələbələrin də xarici dilləri öyrənmələrinə xüsusi önəm verilir. Deməli, tələbələr rus qruplarında rus dili və xarici dillə yanaşı, dövlət dili olan Azərbaycan dilini də öyrənməli olurlar. Bu, çox vacib məsələlərdəndir, çünki dil mədəniyyətin formalaşması, inkişafı və onun qorunub saxlanması vasitəsidir. Aydındır ki, insanlar dünyanı yalnız düşünməyin, görməyin, eşitməyin və qavramağın vasitəsilə dərk edirlər.

Bu gün müasir dünyada və o cümlədən Azərbaycanda xarici dillərin sürətlə böyüyən nüfuzu müşahidə olunur. Təlim rus dilində olan qruplarda təhsilalanlara Azərbaycan dilini öyrənmək də buraya daxildir. Çünki ana dilindən sonra ikinci, üçüncü dillər universal əlaqə vasitəsi olub, digər beynəlxalq dillərdə əlaqələrin inteqrasiyasına kömək edir. Hətta bəşəriyyət üçün ortaq dil zərurəti məsələsi də bununla sıx bağlıdır. Ona görə də beynəlxalq miqyasda Azərbaycan dilinin təbliği eyni zamanda qarşılıqlı anlaşmada onun əhəmiyyətinə, elm adamlarının bu proseslərə ortaq cəlb olunmasına da günün aktual problemlərindən biri kimi baxılmalıdır.

Uzun illərin təcrübəsi göstərir ki, ali məktəblərin rus qruplarında tələbələr Azərbaycan dili tədrisində praktik nitq vərdişləri qazanır, xalqımızın tarixi, mədəniyyəti, ədəbiyyatı, adət və ənənələrilə yaxından tanış olmağa imkan tapırlar. Bu isə öz növbəsində beynəlxalq əlaqələrin daha da inkişaf edib möhkəmlənməsində az rol oynamır.

Qeyri-azərbaycanlıların Azərbaycan dilindən praktik nitq vərdişlərinə yiyələnməsi iş prosesində onların başqaları ilə ünsiyyət saxlamasını asanlaşdırır və ümumiyyətlə, əmək fəaliyyətlərinin keyfiyyətinə müsbət təsir göstərir.

Rus qruplarında Azərbaycan dilinin və əksinə, azərbaycanlı tələbələrə rus dilinin yüksək keyfiyyətdə öyrədilməsini təmin etmək üçün ali məktəblərdə az iş görülmür. Söz yox ki, bunlar təlim prosesinin, demək olar ki, hər anında hiss olunur. O da həqiqətdir ki, ancaq hər iki dilə yaxından bələd olan müəllim bu sahədəki anlaşılmazlığın aradan qaldırılmasında tələbələrin köməyinə gələ bilir.

Ali məktəblərin rus bölmələrində Azərbaycan dili tədrisinin ən mühüm məsələlərindən biri də tələbələrin şifahi nitqinin inkişaf etdirilməsidir. Əlbəttə, bu məsələ metodik ədəbiyyatda müəyyən dərəcədə işıqlandırılmışdır. Bu isə bir çox illərin təcrübəsinə istinadən tələbələrin şifahi nitqini inkişaf etdirməyin bəzi məsələləri barədə daha optimal fikirlər söyləməyə əsas verir.

Təcrübə göstərir ki, nitq inkişafının əsas sahələrindən biri lüğət ehtiyatının zənginləşdirilməsidir. Burada, ilk növbədə, ixtisas üzrə lüğətlər seçilməlidir. Azərbaycan Dövlət Neft Akademiyasında bu qruplarda Azərbaycan dilinin tədrisi zamanı neft və neft məhsullarına dair terminlərin öyrədilməsi hər an diqqət mərkəzində saxlanır. Buna nail olmaqda Azərbaycan dilində olan neftə aid mətnlərin və qrammatik çalışmaların öyrədilməsi böyük əhəmiyyət kəsb edir. Təkcə bunu demək kifayətdir ki, neftə aid hər bir mətnin tədrisində tələbələr bilmədikləri onlarca yeni söz və söz birləşmələrini öyrənir və bu sahəyə daha çox can atırlar. Bu terminlər bir mütəxəssis kimi sonralar onun köməyinə gəlir.

Bu sözlərin şüurlu mənimsənilməsi və gələcəkdə onların lüğət fondunda birdəfəlik qərarlaşması üçün müxtəlif üsullardan istifadə olunur. Bu üsullardan biri də tələbələrin öyrəndikləri söz və söz birləşmələrindən cümlə qurmaq vərdişinə yiyələnmələrinə nail olmalarıdır.

Tələbələrin şifahi və yazılı nitqinin inkişafında Azərbaycan və rus dillərinin fərqli xüsusiyyətlərini tələbələrə öyrətməyin bö-

yük əhəmiyyəti vardır. Bu fərqlər fonetika, leksikologiya, morfologiya və sintaksis bəhslərində özünü daha bariz göstərir.

Fonetika bəhsində fərqli cəhətlər spesifik səslərdə, apostrofda, vurğuda, ahəng qanununda, qoşa səslərin olmasında, hecada, k səsinin yumşaq tələffüzündə, j səsinin yazılışında və s. özünü daha qabarıq göstərir.

Fonetika bəhsində “Spesifik səslər” mövzusunu tədris edərkən istifadə etdiyimiz üsullardan bəzilərini misal gətirək:

a) hər bir spesifik səsin tələffüz məxrəci yaradılır (artikulyasiya) və səs təqlid olunur (imitasiya); həm də bu üsuldan eyni zamanda istifadə edilir;

b) spesifik səslərin tələffüzü öyrədilərkən rus dilindəki oxşar səslərə istinad olunur. Məsələn, ə səsinin tələffüzündə rus dilindəki a, э səslərindən istifadə edilir. Çünki ə səsi a və э səsləri arasında orta bir vəziyyətlə tələffüz olunur;

v) ө, ү səsləri rus dilindəki е, и səsinin tələffüzündəki vəziyyəti alır. Bundan başqa, dodaqlar irəliyə doğru uzanır.

Bundan sonra lent yazılarından ayrı-ayrı spesifik səslərin tələffüzü və həmin səslərin iştirakı ilə sözlər səsləndirilir. Daha sonra isə həmin proses əyani vəsaitin (plakatların) köməyi ilə onların hafizəsində daha da möhkəmləndirilir.

Nəhayət, bu mövzu sinif çalışmaları və ev tapşırıqları ilə tamamlanır.

Əlbəttə, spesifik səslərə aid aparılacaq işi bir dərs saatında başa çatdırmaq düzgün hesab edilə bilməz. Təcrübə göstərir ki, ümumiyyətlə, dillər arasında fərqli cəhətləri yalnız (ardıcıl bir çox dərslərdə) təkrar etdirmək yolu ilə öyrətmək mümkündür. Həm də dərsdə elə şərait yaratmaq lazımdır ki, tələbələr öyrəndikləri bu fərqli cəhətləri gündəlik nitqlərinə daxil etsinlər.

Tələbələrin şifahi nitqini inkişaf etdirməkdə mətnlərin profillər üzrə seçilməsi də əhəmiyyətli rol oynayır. Bu mətnlərin köməyi ilə dinləyicilər həm öz ixtisaslarına aid ilkin məlumatlar alır, həm də profilləri ilə bağlı söz və söz birləşmələri öyrənmək imkanı əldə edirlər. Həmin söz və birləşmələr onların lüğət ehtiyatının zənginləşməsində mühüm rol oynayır.

Çox illərin təcrübəsi göstərir ki, proqrama daxil edilmiş neft terminlərinin və ədəbi materialların tələbələr tərəfindən hər iki dilə tərcümə edilməsi işinin düzgün təşkili onların şifahi nitqinin inkişafına kömək edən mühüm vasitələrdən biridir. Bu iş tələbələrin mətnlər üzərində müstəqil işləmək vərdişinə yiyələnməsinə də kömək edir.

Tələbələrin keçmiş materialı necə öyrəndikləri və bunları şifahi və yazılı nitqdə necə tətbiq etmələrini öyrənmək məqsədi ilə anket sorğularından istifadə etməyin böyük əhəmiyyəti vardır. Belə ki, anket sorğusuna verilən cavablar göstərir ki, tələbələrin bir qismi Azərbaycan dilində sözlər arasında əlaqə yaratmaqda və cümlədə sözlərin sıralanmasında xeyli çətinlik çəkirlər. Tələbələrin şifahi və yazılı nitqlərində müşahidə olunan həmin nöqsanların aradan qaldırılmasına xidmət edən məsələlərin öyrənilməsinə də diqqəti cəlb etmək lazım gəlir.

Tədrisdə əyanilik həmişə qüdrətli vasitə olmuşdur. Elmi-texniki tərəqqi isə tədrisin əyani şəkildə həyata keçirilməsi imkanlarını daha da genişləndirmişdir. Azərbaycan Dövlət Neft Akademiyasının rus bölmələrində keçirilən Azərbaycan dili dərslərində bir daha yəqin edilmişdir ki, ali məktəblərdə bu məsələlərə xüsusi diqqət yetirilməsi gözəl nəticələr verir.

Şübhəsiz ki, Azərbaycan dilinin tədrisində mövcud olan və yeni axtarışlar vasitəsilə meydana gələn forma və üsulların tətbiqi yalnız o zaman yüksək səmərə verə bilər ki, bunlar müəllimin zəngin təcrübəsi əsasında həyata keçirilsin.

Ali məktəblərin rus bölmələrində Azərbaycan dilində tələbələrin cümlə qur-

maq vərdişlərini formalaşdırmaqla onların nitqini inkişaf etdirmək imkanları çoxalır. Bu məsələlərə tədris ilinin əvvəlində başlamaq lazımdır. Elə ilk dərslərdən sonra tələbələrin nitqlərindəki nöqsanları aşağıdakı kimi təsnif etmək olar:

1. Tələffüzlə bağlı olan nöqsanlar.

2. Cümlə qurmaq vərdişləri ilə əlaqədar nöqsanlar.

Tələffüz üzrə iş apararkən səs tərkibi etibarilə oxşar sözlərin müqayisəli təhlili üzərində, spesifik səslərin tələffüzü, apostroflu sözlər və s. üzrə aparılan işlər tələbələrin nitqindəki qüsurları aradan qaldıra bilər.

Cümlə qurmaq vərdişləri ilə əlaqədar nöqsanlar Azərbaycan dilinə məxsus spesifik cəhətlərlə - tələbələrin ana dilindən fərqli xüsusiyyətləri ilə bağlıdır. Məsələn, isimlərin hallanması, saylara əlavə edilən isimlərin cəm şəkilçisi qəbul etməməsi, cümlədə mübtədanın əvvəl, xəbərin isə sonda işlənməsi və s. Bu xüsusiyyətlər Azərbaycan dilinə xas spesifik cəhətlər olmaqla yanaşı, həm də tələbələrin çətin mənimsədikləri materiallardır. Müəllim bunları nəzərə almalıdır.

İKT-dən istifadə prosesində müasir texniki vasitələri tətbiq etməklə də tələbələrə ədəbi tələffüz normaları aşılamaq mümkündür. Bütün bunlar tələbələrin nitq inkişafını lazımi istiqamətə yönəltməyə müsbət təsir göstərir.

Ali məktəblərin rus qruplarında Azərbaycan dilinin tədrisi zamanı rus və Azərbaycan dillərinin qarşılıqlı nisbətlərindən çıxış etmək lazımdır. Bunların içərisində leksik nisbətlər mühüm yer tutur. Leksik materialın mənimsənilməsi iki dil arasında uyğunluq və uyğunsuzluqların aşkar olunmasını tələb edir.

Rus və Azərbaycan dilləri arasında leksik-semantik uyğunluqların mənbələri müxtəlifdir. Bunlar, ilk növbədə, həmin dillərin birindən o birinə keçmiş sözlərlə təmsil olunur. Burada beynəlxalq leksikanın da öz yeri var. Rus və Azərbaycan dilləri arasında leksik-semantik uyğunluqların mühüm bir qismi bir-bir tərcümə oluna biləcək sözləri əhatə edir.

Rus qruplarında Azərbaycan dilinin tədrisi zamanı leksikanın özünütörətmə imkanlarının tutuşdurulması da işin xeyrinə olar. Məsələn, rəng adlarından rəng bildirən fellərin, miqdar saylarından miqdar və sıra saylarının törədilməsi sahəsində bu dillər arasında fərqli cəhətlərlə yanaşı, oxşar cəhətlər də çoxdur.

Azərbaycan Dövlət Neft Akademiyasında Azərbaycan dili fənninin tədrisində təbii olaraq neftə aid terminlərin öyrədilməsi öncül plandadır. Tələbələrin gələcək bir mütəxəssis kimi yetişməsində bu terminlərin həm elmi, həm də praktik əhəmiyyəti vardır. Gələcək mühəndislərin şifahi nitqinin inkişafı onların lüğət fondunun zənginliyi ilə əlaqədardır.

Termin öyrədilməsinin müxtəlif yolları vardır. Bunlardan biri də bədii əsərlərin təsir dairəsidir. Aydındır ki, termin öyrədilməsində bədii əsərlər əsas vasitələrdən biridir. Bu zaman bədii əsərləri seçə bilmək əsas şərtlərdən sayılır. Azərbaycan ədəbiyyatında M.Hüseynin "Abşeron", "Qara daşlar", M.Süleymanovun "Yerin sirri" və başqa bu kimi əsərlərdə işlənən neftə aid terminlər çoxdur və öyrədilmə prosesində bunlar qeydə alınır.

Bu terminlərin öyrədilməsində bədii əsərlərlə yanaşı, şifahi nitqdə işlənən sözlər və bunların bədii əsərlərdəki sinonimlərinin öyrədilməsinə də diqqət yetirilir. Müqayisəli təhlillər aparılır. Bu hal bir neçə dəfə təkrar olunduqdan sonra dərsdənkənar oxu zamanı tələbələr bədii əsərlərdə rast gəldikləri terminlərin kartoçkasını toplamaqla ixtisaslar üzrə termin lüğəti yaradırlar. O da həqiqətdir ki, neft terminlərinin çoxu beynəlxalq

səciyyəlidir. Bu sözlər bədii ədəbiyyata neftə dair ədəbiyyatdan keçir. Bu terminlərin bəzisinin işlənmə dairəsi geniş, bəzisininki isə dardır. Tədris prosesində bu cəhətlərə də tələbələrin diqqəti cəlb edilməlidir.

Ümumiyyətlə, bədii əsərlərdən istifadə ilə terminlərin öyrədilməsi prinsipcə bütövlükdə elmi üslubu öyrətməyi asanlaşdıran mərhələdir. Bunu humanitar olmayan fakültələrdə nəzərə almaq metodiki cəhətdən çox vacibdir. Bəzən bunlar düzgün anlaşılmır. Aydındır ki, bütün bunlar Azərbaycan dilinin öyrədilməsi prosesində həyata keçirilməlidir.

Bizim respublikamızda Azərbaycan dilinin ikinci dil kimi tədrisi sahəsində xeyli iş görülmüşdür. Son illərdə ölkə üzrə proqramlar və dərsliklər təkmilləşdirilmiş, yeni dərslik və əyani vasitələr çapa hazırlanmışdır. İKT-dən geniş istifadə olunur. Bu sahədəki problemlər, demək olar ki, xeyli azalmışdır.

Ona görə də bizim respublikada təlimi rus dilində olan məktəblərdə Azərbaycan dilinin bir fənn kimi tədrisi şagirdlərin beynəlmiləl tərbiyəsində mühüm rol oynadığı kimi, onların linqvistik təfəkkürlərinin formalaşmasına da güclü təsir göstərir. Müəllimlərin əksəriyyəti bu fənnin tədrisini müasir tələblər səviyyəsində qurmağa səy göstərirlər və bunun da öhdəsindən gəlirlər.

Söz yox ki, düzgün tələffüz də vacib arqumentdir. Hər hansı bir dildə düzgün danışmaq üçün həmin dilə məxsus spesifik səslərin düzgün tələffüzü mühüm əhəmiyyətə malikdir. Bu baxımdan Azərbaycan dilində də düzgün danışmaq üçün bu dilin spesifik səslərinin düzgün tələffüzü bacarığına yiyələnməyin böyük əhəmiyyəti vardır. Bu işdə fonetik biliklərin düzgün tələffüz qaydalarına yiyələnməyin də mühüm rolu vardır. Fonetik biliklər orfoqrafik və orfoepik qaydaları nizama salır və düzgün tələffüz üçün zəmin yaradır.

Bəllidir ki, rus bölməsində Azərbaycan dili dərslərində meydana çıxan çətinliklərdən biri tələbələrə Azərbaycan dilində olan spesifik səslərin düzgün tələffüzünü öyrətməkdir. Bu çətinlik rus və Azərbaycan dillərinin qohum olmamasından irəli gəlir. Məlum olduğu kimi, rus dili hind-Avropa dilləri ailəsinin slavyan dilləri qrupuna, Azərbaycan dili isə türk dilləri ailəsinin oğuz-səlcuq yarım qrupuna aiddir. Buna görə də azərbaycanlı olmayan tələbələr Azərbaycan dilinin ə, ö, ü, c, g, ğ, h kimi spesifik səslərini tələffüz edərkən həmin səslərin artikulyasiyasını öz dillərindəki bu və ya digər səsin artikulyasiyasına bənzətmək istəyirlər. Yəni “Ə” səsini “A” kimi, “Ü” səsini “U” kimi, “Ö” səsini “O” kimi, “C” səsini “Ç”, “G” səsini “K” kimi, “Ğ və H” səslərini “X” kimi tələffüz etməyə çalışırlar.

Tədris prosesində bu çətinliyi aradan qaldırmaq üçün müxtəlif vasitələrdən istifadə olunur. Həmin səsləri düzgün tələffüz etmək üçün tələbələrə bu səslərin tələffüzündə nitq orqanlarının aldığı vəziyyət elmi şəkildə izah edilir və bunlar praktik olaraq nümayiş etdirilir.

Burada müəllim müxtəlif dil qrupları haqqında da məlumat verməlidir. Belə ki, dil öyrənilməsinin çətinliyindəki bəzi səbəbləri fransız, ingilis, alman dillərinin hind – Avropa dilləri ailəsinə mənsub olmasında görürük. Rus, ingilis, fransız, alman dillərinin qohumluğu tələbəyə ingilis, alman, fransız dillərində həmin səsləri müxtəlif sözlərdə düzgün tələffüz etməyə imkan verir.

Tələbələr bu səslərin məxrəclərinin eyni olduğunu praktik şəkildə öyrəndikdən sonra Azərbaycan dilinin spesifik səslərini də düzgün tələffüz etməyə hazırlanırlar.

Tədris prosesində bütün spesifik səslərin düzgün tələffüzü ayrı-ayrılıqda öyrədilir. Azərbaycanda düzgün tələffüzdə vurğu ayrıca yer tutur. Buna görə də Azərbaycan dilində sözlərdə vurğunun yerinin öyrədilmə-

sinə xüsusi diqqət yetirilir. Müəllim elə ilk dərslərdən bunu nəzərdən qaçırmamalıdır.

Qeyd etmək lazımdır ki, ikinci dilin tədrisində ana dili ilə onun (öyrədilən dilin) qarşılıqlı əlaqəsinin nəzərə alınması təlimi asanlaşdıran amillərdən biridir. Azərbaycan dilinin rus, rus dilinin isə Azərbaycan qruplarında tədrisi zamanı bu prinsipdən çıxış etmək çox faydalıdır. Rus və Azərbaycan dillərinin müvafiq bölmənin qruplarında tədris edilərkən təlim situasiyasına uyğun olaraq dillərin bu qarşılıqlı əlaqəsi yaddan çıxarılmamalıdır.

Azərbaycan dilinin rus qruplarında tədrisi zamanı nəzəri məsələlərə də yer verilməlidir. Məsələn, tələbələrə dilimizin leksik tərkibi haqqında məlumat verilir. Həmin məlumatı verərkən dilimizə rus və rus dili vasitəsilə Avropa dillərindən çoxlu söz və ifadə, xüsusilə elmi-siyasi, ictimai-mədəni səciyyəli sözlər keçməsi üzərində ayrıca dayanırıq. Həmçinin Azərbaycan bölməsinin tələbələrinə rus dilinin leksik tərkibindən danışarkən bu dilə türk, o cümlədən Azərbaycan sözlərinin keçdiyini də nəzərə çarpdırırıq. Hər iki halda dillərin bir-birindən söz almasının təbii hal olduğunu, bununla həmin dillərin bir-birini zənginləşdirdiyini də faktlarla izah etmək lazımdır.

Ümumiyyətlə, alınma sözlərin öyrədilməsi zamanı müəllim ən yeni təlim üsullarına əsaslanmalı, hər tipdən olan söz forması kontekst daxilində götürülməlidir.

Bir sözlə, Azərbaycan dilinə rus dilindən keçən sözlər üç prinsip əsasında vətəndaşlıq hüququ qazanır: leksik, leksik-semantik və qrammatik-semantik. Bunlar barədə qısaca məlumatlar tələbələrə də çatdırılmalıdır.

Məqalənin sonunda ana dilindən əlavə digər dillərin öyrənilməsində lüğət ehtiyatının roluna da toxunmağı məqsədəuyğun sayırıq. Ədəbiyyatdan məlumdur ki, xarici dillərin öyrənilməsində lüğət ehtiyatı vacib şərtlərdəndir. Məsələn, hər hansı dildən 600 məlum söz bilməklə, o dildə qəzet oxumaq olar. 3000 sözdən ibarət lüğətə malik olmaq proqmatik məqsədlər üçün dilin mənimsədilməsini asanlaşdırır. Bununla əlaqədar J.Simenonun da bir mülahizəsi maraqlıdır: “Statiskaya əsasən iyirmi il bundan əvvəl fransız kəndlisi başqası ilə ünsiyyətdə altı yüz sözdən istifadə edirdi. Kiçik şəhərin qulluqçuları və sənətkarları isə səkkiz yüz, min iki yüz sözdən istifadə edirdilər. Xırda burjuaziyanın söz ehtiyatı isə min beş yüzə yaxın idi. Yalnız müəyyən mədəni səviyyəyə malik adamların söz ehtiyatı iki min – iki min yüz sözdən ibarət idi.”

O da məlumdur ki, XX əsrin 20-ci illərinə qədər Rusiyada ziyalı adamlar ən azı iki və bəzən daha çox Avropa xalqlarının dillərini mükəmməl bilirdilər. Halbuki ölkələ savadsızlıq hökm sürürdü. Hazırda Hollandiyada bütün əhali, demək olar ki, iki dili – ingilis və alman dillərini mükəmməl bilirlər. Deməli, dilin öyrənilməsi üçün maraq, zəhmət və məsuliyyət çox vacibdir.

Təcrübə göstərir ki, işə ciddi girişməklə gündə beş söz öyrənmək şərtilə bir ildə təxminən 1825 söz öyrənmək olar ki, bu dilin lüğət tərkibi minimumdan xeyli çoxdur. Ancaq bu zaman hər gün öyrənmək vərdiş halına keçməlidir.

Bir məsələni də qeyd etmək lazımdır ki, 2000 sözdən ibarət lüğət hər hansı dildəki ixtiyari mətnin 80 faizini əhatə edir. Aydındır ki, deməli, xarici dili öyrənənlər lap əvvəlcədən bilməlidirlər ki, həmin dildən 2000 söz yadda saxlamaq zəruridir. Dilə bu səviyyədə yiyələndikdə hər hansı bir bədii əsəri oxuyub, tam başa düşmək olar.

Beləliklə, tam məsuliyyətlə demək lazımdır ki, ali məktəblərin rus qruplarında Azərbaycan dilinin öyrənilməsi üçün hər cür şərait yaradılmışdır. Məqsəd və vəzifə onu reallaşdırmaqdan ibarətdir.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. "Azərbaycan Respublikasının Dövlət dili haqqında" Azərbaycan Respublikasının qanunu // "Azərbaycan" qəzeti, 2003, 4 yanvar.
2. Azərbaycan Respublikası Prezidentinin "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" Fərmanı // Təhsil xəbərləri, 2001, № 1.
3. Hacıyev T., Cəfərov N., Xudiyev N. Azərbaycan dili. 10-cu və 11-ci siniflər üçün dərslik. Bakı, 2005.
4. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı, 1990.
5. Nəcəfov N., Əfəndiyev Y. Azərbaycan dili. Təlim rus dilində olan ümumtəhsil məktəblərinin 7-ci sinfi üçün dərslik. Bakı, 2006.
6. Azərbaycan dili. Respublika elmi-metodik konfransın materialları. Bakı, 1984.
7. Azərbaycan dili və ədəbiyyat təliminin daha da yaxşılaşdırılması. "Azərbaycan müəllimi" qəzeti, 1982, 8 yanvar.

**С.Гёзалова,**
**С.Иманова**

**Некоторые задачи преподавания азербайджанского языка в русских группах высших школ**

**Резюме**

Встатье говорится о методах обучения азербайджанского языка в русских группах технической высшей школы. Авторы иногда ссылаются на свои практики. В статье имеются интересные факты.

**S.Gozalova,**
**S.Imanova**

**Some issues on teaching Azerbaijan language in russion groups**

**Summary**

In this article it is spoken about methods teaching Azerbaijan language in Russian groups at technical universities. Sometimes the authors address their own practice too. In this article there are also some interesting facts.

* * *

***Kurikulum***

# YENİ TƏLİM STRATEGİYASINA ƏSASLANAN DƏRSLƏR ARTIQ ƏNƏNƏ ŞƏKLİNİ ALIR

**Mürşüd Fərəcov**
***Təhsil Problemləri İnstitutunun dosenti, pedaqoji elmlər üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *elektroliz, katod, anod, anion, kation, elektrolit,oksigen,hidrogen, oksid, turşu, halogen, flüor, xlor,brom, strategiya, resurs,kiçik qrup, motivasiya, interaktiv, inteqrasiya.*

***Ключевые слова:*** *электролиз, катод, анод, анион, катион, электролит, кислорад, водорода, окись, кислота, галлоген, флюор, хлор, бром, стратегия, ресурс, малая группа, мотивация, интерактивный, интеграция.*

***Key words:*** *electrolyse, cathode, anode, anion, kation, electrolyte, oxygen, hydrogen, oxide, acid, halogen, fluor, chlorine, bromine, strategy, resource, small group, motivation, interactive integration.*

Ümumi təhsil sistemində həyata keçirilməkdə olan məzmun islahatları, o cümlədən yeni fənn kurikulumlarının, qiymətləndirmə sisteminin tətbiqi, müasir təlim metodlarının təlim prosesində iştirakı pedaqoji kadrların ixtisasının artırılması zərurətini yaratmışdır. Bununla əlaqədar respublikanın bütün ümumtəhsil məktəblərində müəllimlərin xüsusi proqramlar əsasında fənn kurikulumlarının tətbiqi üzrə ixtisasartırma təhsilinə cəlbi ardıcıl şəkildə həyata keçirilməyə başlanmışdır. 2010-cu ildən başlayaraq ixtisasartırma təhsili sahəsində yeni modelin tətbiqi və modul-kredit sisteminə keçidlə əlaqədar bir sıra tədbirlər də müəyyənləşdirilmişdir.

Məzmun islahatları ilk növbədə yerli təhsil orqanlarının qarşısında yeni vəzifələr qoyur. Artıq hamı üçün aydındır ki, keyfiyyət dəyişikliyi ön plana keçmişdir. Ona görə də təlim kurslarında çalışan təlimçilərin peşəkarlığı və səriştəlilik səviyyəsi yüksəldilməlidir. Bu kurslardan heç bir müəllim kənarda qalmamalıdır. Ona görə də fənn müəllimləri üçün belə təlim kursları ümumtəhsil müəssisələrinin yerləşdikləri ərazilərdə təşkil olunur. Belə kurslardan biri də Bakı şəhəri Yasamal rayonundakı 18 nömrəli məktəbdə təşkil olunmuşdur. Qeyd etmək lazımdır ki, məktəbin direktoru, əməkdar müəllim Vaqif Hüseynov məktəbi qonaqları qəbul etməyə tam hazır vəziyyətə gətirmişdi. Kurslar üçün hər cür şərait yaradılmışdı. Təcrübəli təhsil işçisi ən yaxşı otaqları müdavimlərin sərəncamına vermişdir.

Bakı Şəhəri Baş Təhsil İdarəsinin və BPKİA və YHİ-nin birlikdə təşkil etdikləri bu ixtisasartırma kursuna kimya müəllimləri də cəlb edilmişdir. 18 nömrəli məktəbdə təşkil olunan kurslara mühazirəçi kimi Təhsil Problemlər İnstitutunun Kurikulum Mərkəzinin əməkdaşları dəvət edilmişdir. Üç qrupda təşkil edilən kursun gedişində kimya fənn kurikulumunun məzmunu və mahiyyəti,

təlim strategiyası, şagirdlərin bilik və bacarıqlarının qiymətləndirilməsi ilə əlaqədar olan məlumatların verilməsi təlimçilərin əsas məqsədi kimi qəbul edilmişdir.

Məşğələlərin aparılmasında mühazirəçilər öz bilik və bacarığına əsaslanaraq dinləyicilərin istək və tələblərini təmin etməyə çalışırlar. Kurs məşğələlərinin ilk həftəsində Təhsil qanunun tələbləri baxımından kimya fənn kurikulumunun əhəmiyyətindən, onun xarakter xüsusiyyətlərindən nümunələr əsasında müəllimlərə geniş izahat və şərhlər verilmişdir. Burada ümumi təlim nəticələri, siniflər üzrə təlim nəticələri, məzmun xətləri və məzmun standartlarının haqqında ətraflı söhbətlər aparılmışdır. Bu məqsədlə hər bir qrupda 4-5 nəfərdən ibarət kiçik qruplar təşkil edilərək işin səmərəliliyinə xüsusi diqqət yetirilmişdir. Mövzuların cari planlaşması tapşırığını alan müəllimlər hər bir dərsin əsas məqsədini, təlimin nəticələrini, təlimin forma və üsullarını, dərsin əyaniləşdirilməsində lazım olan resursları tədqiqat məqsədi kimi götürərək, qabaqcadan hazırlanmış iş vərəqlərində öz rəylərini qeyd edirdilər. Fəal təlimin aparılması ilə bağlı olaraq müəllimlər müəyyən qədər məlumatlandırıldıqdan sonra bir neçə mövzuda açıq dərslərin aparılmasına hazırlıq işləri təşkil olundu. Dərslərin uğurla nəticələnməsini təmin etmək məqsədi ilə hər bir müəllimlə lazımi iş aparıldı, ona metodiki məsləhətlər verildi. Burada təcrübə mübadiləsinə də geniş şərait yaradıldı.

Nərimanov rayonundakı 258 nömrəli məktəbin müəllimi, kimya elmləri üzrə fəlsəfə doktoru, respublikanın əməkdar müəllimi Ənvər Nağıyevin "elektroliz hadisəsi" mövzusunda dərsin gedişi lazımi səviyyədə əyani vəsaitlərlə təşkil edilmişdi. Müəllim yeni mövzunun öyrənilməsinə başlamazdan bir neçə dərs əvvəldə tədris olunmuş "duzların suda məhlulunun dissossiyası"nda elektrodlarda gedən reaksiyaların duzların molekul tərkibindən asılı olduğunu yada salır. Məlumdur ki, hər bir duzun tərkibi qüvvətli və zəif turşu ilə qələvidən ibarət olur. Bu qayda ilə əmələ gələn duzları molekul tərkibinə görə dörd qrupa bölmək lazım gəlir: qüvvətli turşu ilə zəif əsasdan əmələ gələn duzlar, zəif turşu ilə qüvvətli əsasdan əmələ gələn duzlar, zəif əsas ilə zəif turşudan əmələ gələn duzlar, qüvvətli əsasla qüvvətli turşudan əmələ gələn duzlar. Bunların hər birinin üzərində ayrıca dayanmalı olurdu.

Qeyd olunan tərkibə malik olan duzların suda məhlullarının elektrolizində də müxtəlif kimyəvi reaksiyalar getməlidir. Elektroliz prosesində kation və anionların kimyəvi fəallığından asılı olaraq elektrodlarda gedən reaksiyaların mahiyyətini müəllim müvafiq reaksiyaların tənliklərini yazmaqla fikrini aydınlaşdımağa çalışırdı. Elektrodlarda oksidləşmə-reduksiya reaksiyalarının nəticəsində ayrılan maddələrin sərf olunan enerjidən, temperaturdan, məhlulun qatılığından və elektrolitin tərkibindən asılı olmasını nümunələrlə qeyd edə bilən müəllim fəndaxili və fənlərarası əlaqəyə diqqət verirdi.

Digər müdavim Səbail rayonundakı 91 nömrəli məktəbin müəllimi Nəbiyeva Gülnarənin apardığı "açıq" dərsi "halogenlər" tədris vahidinin ümumiləşdirilməsi və təkrarına həsr edilmişdir. Halogenlər element kimi dövri sistemdəki yerlərinə görə atomlarının quruluşlarına əsaslanaraq xarakterizə edildi. Verilən suallardan biri şagirdlərin cavablandırmasında çətinlik yaratdı. Nə üçün flüor elementi birləşmələrində 7 valentli ola bilmir? Sualının cavabını müəllim belə izah etdi. Sıra nömrəsi 9 olan flüor elementi dövri qanun cədvəlinin 2-ci dövründə yerləşir. Siz VIII sinifdə ayrı-ayrı dövr elementlərinin atomun quruluşu baxımından xassələrini öyrənmisiniz. Flüorunda atomunun xarici elektron təbəqəsində 7 elektrondan ancaq biri tək ola bilir. Bu dövrdə de-

yarımsəviyyəsi əmələ gələ bilmədiyindən onun qalan elektronları təkləşə bilmirlər. Halogenlərin xarakter xüsusiyyətlərindən biri də onların molekulyar quruluşlu maddələr olmasına baxmayaraq fiziki xassələrinin müxtəlifliyidir. Gülnarə müəllim brom və yod maddəsini nümunə olaraq nümayiş etdirdi. Halogenlərin, onların hidrogenli birləşmələrini və duzlarının nümunələrinin xarakter xassələrinə aid təcrübələri nümayiş etdirməklə dərsin gedişini daha maraqlı edə bildi. Daha sonra müəllim halogenlərin duzlarından sınaq şüşəsində məhlul hazırlayıb onların üzərinə gümüş-nitrat duzunun məhlulundan əlavə etməklə keyfiyyət reaksiyalarının nümayişini təşkil edə bildi. Dərsin sonunda halogenlərə aid əldə olunmuş biliklərin və bacarıqların tətbiqini təmin edən məsələ və çalışmaların yerinə yetirilməsi müəllimlərin marağına səbəb oldu.

Sabunçu rayonundakı 69 nömrəli məktəbin müəllimi Əbilova Ülviyyənin "Oksigen element və bəsit maddə kimi. Oksigenin təbiətdə yayılması, alınması" mövzusunda dərsin təşkili fəal təlimin metodlarına və mərhələlərinə əsaslanmışdır. BDU-nun doktorantı Ülviyyə müəllim dərsin gedişində fəallığı təmin etmək məqsədi ilə internetdən oksigenin təbiətdə yayılmasını, onun bütün canlıların tənəffüsündə vacib olduğunu nümayiş etdirir. Mövzunu əhatə edən qabaqcadan hazırlanmış iş vərəqləri müəllimlərə paylanır, tədqiqat suallarında nəzərdə tutulan təcrübələri dinləyicilər nümayiş stolunda yerinə yetirirlər. Oksigenin alınmasına aid təcrübələrin nümayiş etdirilməsi, müvafiq reaksiya tənliklərinin tərtibinə əsaslanaraq yeni bir reaksiya tipi (parçalanma reaksiyası) haqqında məlumatda verilir. Dərsin sonu mövzunu əhatə edən test sualları ətrafında işləməklə başa çatdırılır.

Nizami rayonundakı 62 nömrəli məktəbin müəllimi Gülmirə Məmmədovanın "Hidrogen element və bəsit maddə kimi. Təbiətdə yayılması və alınması" mövzusunda dərsi internetdən hidrogenin izotoplarının haqqında məlumatların nümayişindən başladı. Müəllim isə verilən iş vərəqlərində hidrogenin izotoplarının atom quruluşlarında olan fərqli xüsusiyyətlərini izah etməklə fiziki xassələrindəki fərqləri də qeyd edə bilirdi. Fəal təlimin mərhələləri əsasında qurulan dərsin gedişində hidrogenin laboratoriyada alınmasına aid təcrübələri müəllimlər yerinə yetirir, sənayedə alınmasını internetdən əldə edilmiş slaydı nümayiş etdirməklə Gülmirə müəllim izahatını verirdi. Hidrogenin alınmasına aid təcrübələrin və müvafiq reaksiya tənliklərinin əsasında yeni bir reaksiya tipi olan əvəzetmə reaksiyası haqqında da məlumat verilir. Dərsin gedişində müdavimlər şagird və nəticəyönümlü dərsdən razı qaldıqlarını bildirdilər. Deyilən hər bir dərsin müzakirəsi aparıldı. Müzakirələrdə dosent Akif Əliyev, BPKİA və YHİ-nin təbiət fənlərinin tədrisi kafedrasının müdiri, fizika elmləri üzrə fəlsəfə doktoru Yusif Alıyev, kafedranın dosenti Aydın Əhmədzadə və digər təcrübəli kimya müəllimləri çıxışlarında qeyd etdilər ki, belə kurslarda "açıq" dərslərin təşkil olunması ilə mühazirələrdə deyilən yeni təlim strategiyalarına aid məlumatların praktiki olaraq həyata keçirilməsi nümayiş etdirilir. Məsələn, məzmun standartlarına əsasən mövzunun, mövzuya görə təlim strategiyasının, dərsin gedişində şagird və müəllimin vəzifəsinin müəyyən edilməsi nümayiş etdirildi. Çıxış edənlər və müdavimlər belə kurs tədbirlərində "açıq" dərslərin təşkil olunmasını alqışladılar.

Bir daha qeyd etmək lazımdır ki, təlimlərlə əlaqədar təşkilati işlər yüksək səviyyədə həyata keçirilirdi. Burada təlimləri həyata keçirən təşkilatların potensial imkanları, onların təlimçiləri düzgün seçməsi, müəllimlərin işinin obyektiv qiymətləndiril-

məsinə kömək edir. Təhsil müəssisələrinin rəhbər və pedaqoji kadrlarının ayrı-ayrı kateqoriyaları üçün ixtisasartırma təhsili fənn kurikulumlarının uğurla davam etdirilməsinə müsbət təsir göstərir. Bütün bunlar isə müəllimlərin ixtisasartırma təhsilinin müasir tələblər səviyyəsində təşkilinin bariz ifadəsidir. Əmin olmaq olar ki, bu təlim kurslarında müəllimlərin elmi-nəzəri islahatlara və pedaqoji ustalığa yiyələnmələrinə, onların nümunəvi dərslər qurmasına kömək etmələrinə müsbət təsir göstərir.

*Rəyçi: TPİ-nin şöbə müdiri Ə.Gərayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Abbasov V. və b. Kimya. Ümumtəhsil məktəblərinin 8-ci sinif dərslik. Bakı: Aspoliqraf, 2010.
2. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün kimya fənn kurikulumu (layihə). Bakı, 2012.
3. Veysov Z. Fəal / İnteraktiv təlim: müəllimlər üçün vəsait. 2007.
4. Mehrabov A. və b. Pedaqoji texnologiyalar. Bakı: Mütərcim, 2006.
5. Fərəcov M. Kimyanın tədrisində fənlərarası əlaqə. Bakı: Maarifnəşr, 1989.
6. Əliyev A. 8-ci sinifdə kimyanın tədrisi. Bakı, 2004.
7. Fərəcov M. Kimyanın tədrisində müasir təlim texnologiyası - qabaqcıl iş təcrübəsi. Bakı: Nurlan, 2008.

**М. Фараджов**

**Уроки, обоснованные на новой стратегии обучения, уже переходит на традиционный характер**

**Резюме**

В статье говорится о сведениях про новой стратегии обучения, обоснованные на курсах квалификации по Химии и об “открытых” уроках практических учителей. На этапах активного урока даны, образцы примитивных элементов кислорода и водорода, явлении по электролизу, и для обобщения и повторы галлогенной учебной единицы.

**M.Faracov**

**New training strategy based lessons are becomming a tradition**

**Summary**

In the article, information is given about the new training strategy based information hearings and experienced course graduates’ open lessons at chemistry teacher’s qualification courses. Examples are given on oxygen and hydrogen as simple compounds; electrolyse process, halogens, repetition and summary of lesson unit based on interactive training phases and methods.

# YENİ MƏZMUN YENİ YANAŞMA TƏLƏB EDİR

**Elnarə Məmmədova**
***Təhsil Problemləri İnstitutunun aparıcı elmi işçisi, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *məzmun, kurikulum, məqsədlər, rubliklər, inteqrasiya, kompetensiya, resurslar, davranış.*

***Ключевые слова:*** *содержание, курикулум, цели, интеграция, компетенция, ресурсы, личность, поведение.*

***Key words:*** *content, curriculum, goals, rubrics, integration, competency, resources, behavior.*

Azərbaycan Respublikasının "Təhsil haqqında" Qanununda qarşıya qoyduğu vəzifələrdən biri də XXI əsr Azərbaycan vətəndaşının hərtərəfli və ahəngdar inkişafını təmin etməkdən ibarətdir. Qeyd etmək lazımdır ki, şəxsiyyətyönümlü, nəticəyönümlü təhsil bütövlükdə təhsil sistemində üstünlük verilən sahələrdəndir. Bu baxımdan bütün təhsil sənədlərində formalaşdırılmış əsas prinsiplərdən biri şəxsiyyətin sərbəst inkişafı, şagirdlərin elmi-fiziki qabiliyyətlərinin inkişaf xətlərinin müasir tələblərə uyğun müəyyənləşdirilməsidir.

Şəxsiyyətin formalaşdırılmasında başqa fənlər kimi, riyaziyyatın da öz çəkisi vardır. Bu da ilk növbədə onunla bağlıdır ki, riyaziyyat məntiqi təfəkkürü inkişaf etdirir ki, bu da mühakimə yürütmək bacarığının formalaşdırılmasının əsasını təşkil edir. Ümumtəhsil məktəbləri üçün fənn kurikulumunda bu məsələ çox aydın ifadə olunmuşdur. Konseptual sənədlərdə qeyd edildiyi kimi, riyaziyyat məntiqi təfəkkürün formalaşmasında, mühakimə və dərketmə qabiliyyətlərinin yüksəlməsində müstəsna rol oynayır. Riyazi məşğələlərin şagirdlərin məntiqi mühakimə yürüdə bilmək bacarıqlarını, intuisiyasını, fəza təsəvvürlərini inkişaf etdirir. Riyazi fəaliyyət zamanı induksiya və deduksiya, ümumiləşdirmə və konkretləşdirmə, analiz və sintez, təsnifetmə və sistemləşdirmə, mücərrədləşdirmə və analogiya kimi əqli mühakimə üsullarından istifadə olunur ki, bu da şagirdlərin məntiqi təfəkkürünün inkişafını sürətləndirməklə, hafizənin və məntiqin inkişafına da kömək edir.

Deməli, orta məktəbdə riyaziyyat fənninin tədrisi zamanı şagirdlərin riyazi bilik, bacarıq və vərdişləri inkişaf etdirilməklə yanaşı, həm də onların ümumi mədəni səviyyəsi də yüksəlir.

Aydındır ki, riyaziyyat şagirdlərin təbiət haqqında təsəvvürlər sisteminin formalaşdırılmasına xidmət edən fənlər sırasındadır. Bu mənada nəzərə alınmalıdır ki, burada ənənəvi təlim metodlarından fərqli yollardan istifadə olunur. Bu yol həm də şagirdlərə həyatda qazandıqları bilikləri öyrənəcəkləri biliklərlə birləşdirməyə və sintez edərək daha məzmunlu bilik əldə etməyə şərait yaradır. Belə yanaşma interaktiv təlimi fənn kurikulumunun səmərəli tətbiqinə yönəldir. Fəal təlim metodlarında şagirdlərin fikirlərinin əsas götürülməsi ilə yanaşı ən optimal üsullardan istifadə edilməsi də nəzərdən qaçırılmamalıdır. Bu yanaşma nəticəsində

həm şagird, həm də müəllim inkişaf edir. Bu mənada riyaziyyatın üzərinə böyük yük düşür. Bəllidir ki, real həyatda riyazi fəaliyyət insanları həmişə düşündürmüşdür. Qədim mədəniyyət abidələrindən olan “Qabusnamə”də müxtəlif peşə sahiblərinə məsləhət görülür ki, bütün böyük elmlərdən əvvəl hesabı (ibtidai riyaziyyatı) çox yaxşı öyrənsinlər. Orada deyilir: “Amandır, bir saat belə hesabı təkrar etməmiş olma, çünki hesab elmi vəhşi elmdir” (Vəhşi heyvan ilə təlimçi bir saat məşq etməsə, heyvanlar hərəkətləri unudarlar). F.Bekonun təbirincə desək, “Riyaziyyatı bilməyən hər bir şəxs digər heç bir elmi, hətta öz cəhalətini belə anlaya bilməz.” Müasir dövr belə fikirlərin təsdiqi üçün daha çox material verir. Çünki qloballaşan dünyada geniş imkanlara malik olan kompyuterlərin meydana gəlməsi ilə əlaqədar olaraq riyazi metodlardan hərtərəfli istifadə edilməsi nəticəsində cəmiyyətdə yeni perspektivlər açılmışdır. Riyaziyyatın tətbiqi sahələrinin çoxalması ilə yanaşı, bu elmin özü də sürətlə inkişaf etməkdədir. Söz yox ki, bu və ya digər məsələnin öyrənilməsində riyazi biliklərə yiyələnmək başlıca məqsədlərdən birinə çevrilmişdir. Ənənəvi təlimdə şagird öz təcrübəsinin yadda saxlamasına alışdırılırdısa, yəni təlimdə şagirdlər uzun illər inkişaf etməyə zərurət duymadıqları təfəkkürün köməyilə problemlərin müstəqil həllinə “kəşflər” etməyə sövq olunur.

Bu gün texnikanın çox böyük sürətlə inkişaf edən səviyyəsi sanki cəmiyyətdə yaşamağı asanlaşdırmağa çalışır. Bütün bunlar riyaziyyat elminin uğurlu tətbiqinin nəticəsidir desək, səhv etmərik. Hətta böyük bir fəxarət hissi ilə qeyd etmək olar ki, bu inkişafda beynəlxalq elm aləmində böyük nüfuza malik olan azərbaycanlı riyaziyyatçı Lütvi Ələsgərzadənin qeyri-səlis məntiq nəzəriyyəsinin həyata uğurlu tətbiqinin müəyyən rolu vardır. Bu isə o deməkdir ki, bu xalqın övladlarına riyaziyyatı dərindən öyrətməyə səylə çalışılmalıdır.

Qloballaşan dünyada daim inkişafda olan müasir cəmiyyətin bəşər övladının qarşısında qoyduğu məqsədlər təhsillə bağlı əldə olunmuş nəticələrə yenidən baxılmasını, daha effektiv sosial inteqrasiyaya malik fərdlərin yetişməsini, eyni zamanda dünya elminə yararlı töhfələrini verməyə hazırlanmasını tələb edir. Avropa təhsil sisteminə inteqrasiya etmək üçün təlim, tədris və qiymətləndirmə proseslərində köklü dəyişikliklər edilməsi də bu zərurətdən doğur. Belə dəyişikliklər onunla xarakterizə olunur ki, şagirdlər öyrəndikləri biliklərdən bəhrələnməyi bacarsınlar. Bu mənada yeni təhsil proqramı şagirdlərin “nəyi bilməli” və “nəyi bacarmalı” olduğunu müəyyənləşdirmək üçün əsas təlim nəticələrini məzmun və fəaliyyət xətlərinin və nəhayət, elmin praktika ilə qarşılıqlı əlaqəsinə nail olmağı təsbit edir.

Ölkəmizin ümumtəhsil məktəblərində riyaziyyatın məzmunundan danışarkən qeyd etmək lazımdır ki, bu fənnin perspektiv inkişaf istiqamətləri müəyyənləşdirilərkən, görüləcək işlərə mərhələlər üzrə aydınlıq gətirilməlidir. Ona görə də, ilk növbədə tədris planları və proqramları, dərsliklər, tədris-metodik ədəbiyyatın məzmunca yeniləşdirilməsi kimi təhsilin ən zəruri məqsədlərinə diqqət yetirilmişdir. Odur ki, yeni proqram müəllimlərə qabaqcıl ölkələrin beynəlxalq riyaziyyat sahəsində əldə etdiyi nailiyyətlər nəzərə alınmaqla ümumiləşdirilmiş və əsaslı məzmun dəyişiklikləri ilə zənginləşdirilərək təqdim edilmişdir. İlk dəfə olaraq 2006-cı ildə “Azərbaycan Respublikasının ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)” sənədinin tələblərinə uyğun hazırlanmış bu proqram təhsilin məzmunu, təşkili və qiymətləndirilməsi ilə bağlı bütün məsələləri özündə əksetdirməkdədir. Ölkəmizdə bu sənədin yaradılması zamanın tələbindən irəli gəlmişdir. Başqa sözlə bu proqram öz həyat və fəaliyyətini düzgün təşkil etməklə cəmiy-

yət üçün faydalı, həyatı boyu təhsilini davam etdirməyi bacaran, tənqidi düşünən tədqiqatçı, ictimaiyyətçi, idarəçi bir şəxsiyyət, bir qədər geniş mənada demokratik bir cəmiyyətin vətəndaşını yetişdirməyə xidmət edir. Bu məsələlər öz əksini ilk dəfə 1999-cu ildə təsdiq edilmiş "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nda tapsa da sonrakı təhsil sənədlərində dünya təhsilinin mütərəqqi cəhətlərini milli və mənəvi dəyərlərimizi nəzərə almaqla tətbiq etmək, şagirdlərimizin təlim nəticələrini yüksəltməklə ümumi təhsilin keyfiyyətini artırmaq, Azərbaycanda şəxsiyyətyönümlü və nəticəyönümlü təhsilin gerçəkləşməsinə istiqamətləndirməyə yönəldilmişdir.

Yeni təhsil proqramlarındakı (kurikulumlar) dəyişikliklər əsasən kompetensiyaların formalaşmasına yönəldilmişdir. Dünya təhsilində kompetensiyalar belə bir ümumiləşdirmədə nəzərə çarpır:

Kompetensiya → Fəaliyyət, bacarıq, nəticə, davranış
Kompetensiya → Daxili resurslar (koqnitiv, konotativ)
Kompetensiya → Xarici resurslar (insani, fiziki)

Əlbəttə, bunlar şərti ümumiləşdirmə olsa da, düşünmək üçün əsas var.

Milli Təhsil Konsepsiyamızda isə təsnifatlandırılma öz ifadəsini anlama və dərketmə məqsədləri, tətbiqetmə məqsədləri və inteqrasiya məqsədləri kimi tapmışdır.

Əlbəttə ki, kompetensiyaların formalaşmasında inteqrativ məqsədlərin nə qədər zəruri olduğunu sübut etməyə ehtiyac yoxdur. Çünki bu məqsədlər kompetensiyaların formalaşması üçün nə qədər vacibdirsə, məzmunun mənimsənilməsi üçün də bir o qədər zəruridir. Təhsilin məzmununun nəticəyönümlü modeli olan riyaziyyat fənn kurikulumunun məzmun standartları ənənəvi proqramdan bir sıra əlavələr və struktur dəyişikliyi ilə fərqləndirilərək istifadəyə verilmişdir. Bu sahədə təkmilləşdirilmə indi də davam edir.

Bununla əlaqədar bütün əldə olan nəticələr bir daha nəzərdən keçirilərək yeni riyaziyyat fənn kurikulumunda məzmun standartlarının müəyyənləşdirilməsində bir sıra çox vacib, mühüm dəyişikliklər edilmişdir.

Təhsil sistemi standartlarsız mümkün deyildir. Amerikalı pedaqoq D.Raviç demişdir: "Biz içdiyimiz su, aldığımız hava, qəbul etdiyimiz qidanı da qorumaq üçün standartlara riayət edirik. Standartlar həyat fəaliyyətini yüksəltmək üçün yaradılır".

Ölkəmizin təhsil sistemində yeni standartların hazırlanmasında riyaziyyatın bir elm sahəsi olaraq səmərəli tədrisi üçün nəzərdə tutulan istiqamətləri (məzmun xətləri) üzrə ən zəruri bilik, bacarıq və vərdişlərin mənimsədilməsi məsələləri barədə ümumi bir nəticəyə gəlinmişdir. Bu mənada təhsil standartlarının yaradılması dedikdə, şagirdlərin, müəllimlərin, valideynlərin, təhsil idarəçilərinin, fənn üzrə mütəxəssis alimlərin, pedaqoq və psixoloqların, dövlət adamları və işgüzar adamların fikirlərindən istifadə edilərək müasir şəxsiyyətlərin yetişməsi üçün gərəkli olan ideyaların təhlili nəzərdə tutulmuşdur və yenə də öyrənilməkdədir..

Bir qayda olaraq fənn kurikulumunda fənnin məzmunu standartlar şəklində ifadə olunur. Məzmun standartı mahiyyət etibarı ilə nəticə şəklində olub özündə konkret mənimsənilən biliyi və fəaliyyəti ehtiva edir. Fəaliyyət komponentində bir qayda olaraq öyrənilənin necə nümayiş etdiriləcəyi göstərilir.

Məzmun standartlarında fəaliyyət əsasən taksonomiyaların köməyilə sistemləşdirilir. Söhbət təhsil üçün önəmli hesab edilən idraki, emosional və psixomotor taksonomiyalardan gedir. Bu baxımdan idraki taksonomiyaların bütün mərhələləri (bilmə, anlama, tətbiqetmə, təhliletmə, sintezetmə, dəyərləndirmə) hər bir sinif üzrə standartlarda öz əksini tapmışdır. Lakin həmin mərhələlər də öz növbəsində şagirdlərin yaş həddi

nəzərə alınmaqla sinifdən sinfə, sadədən mürəkkəbə doğru inkişaf etdirilməlidir.

Bəs bütün bunları təcrübədə dərs prosesində necə reallaşdırmalı? İndi bu vacib məsələ metodistləri də, müəllimləri də, təlimçiləri də düşündürür.

Riyaziyyatın tədrisində istifadə olunan məzmun xətləri şagirdləri müasir texniki vasitələrdən faydalanmağa, informasiyalaşmış cəmiyyətə hazırlaşmağa istiqamətləndirir. O da nəzərə alınmalıdır ki, sadə tənliklərin həlli, həndəsi fiqurlar haqqında anlayışlar, diaqram, qrafik və cədvəl şəklində verilmiş məlumatları oxumaq şagirdlərdə dünyanın estetik cəhətdən dərk olunmasına kömək edir. Hər şeydən öncə dərsi planlaşdırma zamanı təlim standartlarının hansılarının reallaşdırılması məsələsi müəyyənləşdirilməli, ona uyğun təlim məqsədləri seçilməli, müvafiq metod və vasitələr uyğun olaraq, yaradıcı şəkildə hər müəllimin özü tərəfindən tətbiq olunmalıdır. Hər bir müəllimin özü üçün konkretləşdirməli olduğu məsələlər əsasən aşağıdakılardır:

- Şagirdlər nəyi öyrənəcəklər?
- Və necə öyrənəcəklər?
- Hansı şəraitdə öyrənəcəklər?
- Təlim fəaliyyəti necə qiymətləndiriləcək?

Müəllim tədris edəcəyi mövzu üçün təlim məqsədlərini düzgün müəyyənləşdirməyi bacarmalıdır. Təlim məqsədlərinin isə müəllim tərəfindən məhz taksonomiyalar əsasında sadədən mürəkkəbə doğru tərtib edilməsi dərsin uğurlu alınmasının təməl daşıdır.

Dərs düzgün qurulanda o da məlum olur ki, təhlilin təşkilində səmərəli olan fəal təlim metodundan istifadə zamanı dərsin necə rəngarəng, maraqlı fikirlərlə zəngin olduğu, şagirdlərin necə erudisiyaya, dərketmə qabiliyyətlərinə malik olmaları da aşkar olunur.

Dərsin təşkilində zəruri sayılan digər prinsiplərin vacibliyindən danışmaq da yerinə düşərdi. Pedaqoji prosesdə təlim məqsədləri kompleks həyata keçirilir: təlimin inkişafetdirici, öyrədici, tərbiyəedici fəaliyyətləri əhatə etməsi artıq günün tələblərinə çevrilmişdir.

Fikrimizi əsaslandırmaq üçün V sinfin məzmun standartlarında qoyulan bir məsələyə müraciət edək:

V sinfin məzmun standartları arasında mövqeli və mövqesiz say sistemləri ilə tanışlığı nəzərdə tutan alt standartını reallaşdırmaq üçün dərsliyə salınmış “Say sistemləri” mövzusunun tədrisini misal gətirək.

Bu mövzuda diqqəti çəkən cəhət əvvəlkindən fərqli olaraq mövqeli və mövqesiz say sistemləri haqqında daha geniş məlumatlara yiyələnməyin mümkünlüyüdür. Təcrübə göstərir ki, natural ədədlərdən Rum rəqəmlərinə və tərsinə keçidlərin reallaşması şagirdlər tərəfindən maraqla qarşılanır.

Bu mövzu üçün məqsədlər aşağıdakı şəkildə qoyulanda bu prosesdə şagirdlər:

- Mövqeli və mövqesiz say sistemlərini tanıyır.
- Mövqesiz və mövqeli say sistemlərini fərqləndirir.
- Mövqesiz və mövqeli say sistemlərinin birindən digərinə keçməyi bacarır.

Dərsin gedişatında isə bu məqsədləri meyar kimi qəbul edib onun rubriklərini (səviyyələrini) müəyyən edib formativ qiymətləndirməni asanlıqla icra etmək olur.

Mövzunun inteqrasiyası zamanı informatika və tarix fənləri ilə əlaqəli nəzərdə tutmaq da effektli olur.

Əşyaların sayılması məsələsinə şagirdlərin diqqətini cəlb etdikdən sonra bu işin tarix boyu ən müxtəlif yollarla həyata keçməsi barədə məlumatlar da verilir. Şagirdlər əşyaların sayılması prosesinin tədricən inkişaf etməsini maraqlı faktlar üzərində müşahidə edərək nəticədə say sistemlərinin yaranmasının labüdlüyü faktını qəbul edir-

lər. Onlar özləri də maraqlı fikirlər söyləyirlər.

Rum rəqəmləri ilə verilmiş ədədləri 10-luq say sisteminə və əksinə çevrilməsinin necə yerinə yetirilməsi barədə qoyulan tədqiqat sualının cavabı da onları düşündürür, şagirdlər müəllimin mövqeli və mövqesiz say sistemləri, onluq say sisteminin mövqeli və Roma say sisteminin mövqesiz say sistemi olduğu mənimsənildikdən sonra onların birindən digərinə keçid məqsədilə qoyulan tapşırıqları şagirdlər qrup halında yerinə yetirməyə başlayırlar. Belə tapşırıqlar çox maraqlı tərtib edilmiş iş vərəqlərində qruplara təqdim edilir.

Sonra qrupların təqdimatı dinlənilərək informasiyaların toplanılması müzakirə suallarının cavablandırılması yolu ilə davam etdirilir. Suallar ətrafında şagirdlərin fikirləri dinlənilir və şagirdlərin diqqəti yenidən tədqiqat sualına cəlb edilərək onların cavabları ümumiləşdirilərək nəticələr çıxarılır. Bununla da şagirdlər artıq mövqeli say sistemininonluq say sistemi, mövqesiz say sisteminin isə Roma say sistemlərinin olduğu qənaətinə gəlirlər.

Beləliklə, artıq şagirdlər yaradıcı tətbiqetmə mərhələsində tənqidi və yaxud yaradıcı təfəkkürün formalaşdırılması məqsədi üçün nəzərdə tutulan maraqlı bir məsələni həll etməyə hazırlanmış olurlar. Dərs prosesində əvvəlcədən qoyulmuş məqsədlər əsasında formalaşan meyarların hansı səviyyələrdə icra edilməsi müəllim tərəfindən müəyyənləşdirilir və şagirdlərin biliyi də bu yolla qiymətləndirilir. Dərs prosesində şagirdin təkcə biliyi deyil, həm də bacarıq və vərdişləri hansı qavranış çərçivəsində icra etdiyi müşahidə edilir. Beləliklə, şəxsiyyətin formalaşmasında dərsin rolu özünü aydın göstərir. Bu mövzudakı inteqrasiya məsələləri isə sadəcə şagirdin bu problem barədə dünyagörüşünü genişləndirməklə qalmır, həm də bu mövzunun mənimsədilməsi işini də xeyli asanlaşdırır.

O da nəzərə alınmalıdır ki, orta məktəbdə riyazi bilikləri sadə praktik məsələlərin həllində tətbiq edə bilmək, şagirdlərdə riyazi cihaz və onlardan istifadə etmək vərdişləri, elmi və tədris xarakterlərinin informasiyasını sərbəst əldə etmək bacarıqlarının formalaşdırılması riyaziyyat fənninin tədrisinə yeni yanaşılmanın məğzini təşkil edən üsul və formalardandır. Aydındır ki, istər zehni, istərsə də fiziki fəaliyyətin formalaşmasında birinci və ən vacib şərt, onun praktiki reallaşdırılmasıdır. Bu yolla şagirdlərin bəzi tərifləri qavraması əvəzinə onu əzbərləməsinin qabağı da alına bilər. Riyazi tərifləri əzbər öyrənməyin qarşısınn alınması üçün onların bu anlayışları müstəqil surətdə ifadə etmələrinə imkan verilməlidir. Şagirdlərin bu qaydalara alışdırılmasında öyrədici söhbətlər də az rol oynamır. Lakin bunun üçün şagird mövzunu hərtərəfli və dərindən mənimsəməli, məsələnin mahiyyətini aydın dərk etməlidir.

Dərs elə qurulmalıdır ki, şagirdlərdə riyaziyyata maraq oyansın. Burada rol oynayan əsas amillərdən ən mühümü müəllim şəxsiyyəti, onun dünya görüşünün genişliyi, peşəsini ürəkdən sevməsi, bir sözlə, hər cəhətdən riyaziyyatı təlim etməyə hazır olmasıdır. Təlimdə bərabər imkanların yaradılması, şagirdlərin pedaqoji prosesin mərkəzində dayanması, onların idrak fəallığının izlənilməsi artıq fəaliyyət proqramına çevrilmişdir. Bunların nailiyyətlərin inkişafı naminə təhlil edilməsi, fəaliyyətlərin daha uğurlu təlim nəticələrinə istiqamətləndirilməsi naminə stimullaşdırılması, pedaqoji prosesin münasib maddi-texniki bazalar əsasında və sağlam mənəvi-psixoloji mühitdə təşkil edilməsi keyfiyyətin və səmərəliliyin yüksəldilməsi üçün əlverişli və təhlükəsiz təlim şəraitinin yaradılmasına gətirib çıxarır və bu prinsiplər müasir kurikulumda təlimin təşkilinə verilən əsas tələblər kimi çıxış edir.

Hər bir tədqiqat problemi onun mahiyyətini müəyyənləşdirməklə başlayır. Sonda formalaşan tədqiqat sualı isə yeni biliklərin kəşf edilməsində bələdçi rolunu oynayır.

Müasir dərsin bu mərhələsi şagirdləri düşündürməyə, idraki fəallığa sövq etdiyindən həm də motivasiya kimi çıxış edir. Burada müasir dərsin paradiqmaları (təhsilalanlara subyekt kimi yanaşma, dialoji yanaşma, ekzistensiallıq, interaktivlik, inkişafetdirici xarakterlərin təmin edilməsi, pedaqoji kadrların müasir tələblərə cavab verən fasilitator səviyyəsində formalaşdırılması, tədris-təlim prosesinin fundamentallığı və b.) nəzərə alınması və onlardan məzmunun tələblərinə görə istifadə edilməsi öncül planda durmalıdır. Həmçinin burada tədris-təlim prosesində müasir dərsin paradiqmalarının həyata keçirilməsindəki prinsiplər (humanistləşmə, humanitarlaşma, informatlaşma) əsas yanaşma metodu kimi götürülməlidir.

Yaxşı olar ki, bu prosesdə dərsin məqsədinə və tədqiqat sualına uyğun iş üsulları seçilsin, tədqiqat sualına cavab verməyə kömək edəcək faktları tapmaq üçün məqsədyönlü iş aparılsın, şagirdlərə müxtəlif çalışmalar verilsin. Ümumiyyətlə, tapşırıqların hazırlanması işi nəfis tərtib edilmiş iş vərəqlərində Blum taksonomiyasının pillələrinə uyğun şəkildə təqdim ediləndə daha səmərəli nəticə verir. Burada müəllim şagirddə təfəkkürü (məntiqi, tənqidi və ya yaradıcı) inkişaf etdirəcəyini nəzərdə tutur. Aydındır ki, hər bir mövzunu və yaxud üzərində işlənilən standartı sinifdəki şagirdlər hamısı eyni səviyyədə mənimsəyə bilmir. Ona görə də çalışmaq lazımdır ki, nəticə etibarilə bu pillələrin hər birinə və əlalxüsus ən yüksəyinə yaradıcı təfəkkürün formalaşmasına nail olunsun, həm də müəllimlər təfəkkürün növlərinə aid açar sözlərlə yaxşıca tanış olmalı və onların iştirakı ilə adekvat səviyyəli tapşırıqların hazırlanması texnikasına nail olsunlar. Ona görə də müəllim şagirdlərin kompetensiyalara yiyələnə bilməsi üçün onlara lazımi, uyğun şəraitlərin yaradılmasına nail olmalıdır. Bunun üçün müəllim özü

- Peşəkarlığa, müxtəlif səviyyəli tapşırıqların hazırlanma mexanizminə;
- Məzmunun alternativ ifadələrlə verə bilməsini bacarmağa;
- Fənlərarası daxili qarşılıqlı əlaqənin müntəzəm tələbinə cavab verməyə nail olmağa;
- Şagirdin qarşısında onun gücünə müvafiq məsələlər qoymaq iqtidarına malik olmağa;
- Müxtəlif həlləri və mülahizələri yerinə yetirməyə qadir olmağa;
- Şagird-dərslik əlaqəsinin mövzunun təhlili səviyyəsində bərpasına səy etməyə;
- Məsələlərin həllinə qrup fəaliyyəti çərçivəsində nail olmağa;
- Məsələlərin ardıcıllığına alışdırılaraq, öyrənmənin alqoritmini təklif etməyə hazırlanmalıdır.

O da faktdır ki, riyaziyyatın tədrisində problemin açılaraq öyrənilməsi, şagirdlərin tədqiqat aparması üçün uyğun şəraitin yaradılması çox zəruri tələblərdəndir. Bundan başqa şagirdin tədqiqat nəticəsində yiyələndiyi riyazi biliklərin digər məktəb fənlərinin öyrənilməsində tətbiqinə də nail olmaq lazımdır. Axı, necə deyərlər, riyaziyyat bütün elmlərin açarıdır.

Bunun üçün isə riyaziyyat müəllimləri riyaziyyatın fizika, kimya, biologiya, informatika və həyatın müxtəlif sahələrində tətbiqini aşılamaq üçün hər cür imkandan ustalıqla istifadə etməyə alışmalıdırlar. Beləliklə,bu prosesdə müəllim öz diqqətini aşağıdakı cəhətlərə:

- Dərsliklərin təqdim etdiyi fənlərarası əlaqəyə;
- Fənlərarası məzmuna aid problemlərdən bəhs edən məsələ və çalışmaların seçilməsinə;
- Dərslikdən əlavə maraqlı vəsaitlər-

dən müxtəlif riyazi situasiyalarda (sinifdənxaric tədbirlərdə, müsabiqələrdə) istifadəsinin təbliğinə;

- Fizika, kimya, biologiya, informatika və digər fənlərlə inteqrasiya edilmiş dərslərin hazırlanmasının reallaşmasına;

- Fənlərarası əlaqələrə söykənən biliklərin tətbiqinə əsaslanan tədbirlərin keçirilməsinə yönəltməlidir.

VI sinifdən "Koordinat müstəvisi" mövzusunun tədrisi zamanı kompyuterin imkanlarından istifadə olduqca yaxşı səmərə verir. Bu mövzunun reallaşması zamanı nəzərdə tutulan məqsədlər uyğun alt standartlardan çıxarılaraq şagirdin koordinatları verilən nöqtələri koordinat müstəvisində qeyd edə bilməsi və koordinat müstəvisində verilən nöqtələrin koordinatlarını müəyyən edə bilməsilə müəyyənləşdirilir. Bu bacarıqları, vərdişləri şagird VI sinfin coğrafiya və informatika fənnində də tətbiq edə bilər. Mövzu barədə şagirddə aydın təsəvvür yaratmaq üçün onun öz şəxsi koordinatları ilə maraqlanmaq və eyni zamanda onun diqqətini hər gün koordinat sözü ilə haralarda rastlaşmasına yönəltmək lazım gəlir. Onlardan bu barədə soruşanda şagirdlər coğrafiyadakı paralellərin və meridianlarınköməyilə coğrafi koordinatların təyini, şahmat taxtasında fiqurların yerinin müəyyən edilməsi, biletin nömrəsinə görə kinozalda yerin tapılması kimi məsələləri də qeyd edirlər. Bu zaman ortaya belə bir sual çıxır:

– Bəs nöqtələri koordinat müstəvisində necə qurmalı? Bundan sonra şagirdlərin tədqiqat işi başlanır. Onlara uyğun məzmunda iş vərəqləri təklif edilir və şagirdlər qrup halında işlədikdən sonra müzakirələr aparılır və nəticələr çıxarılır. Sonrakı tapşırıqlar zamanı şagirdlərə artıq kompyuterdə təqdim edilən slaydlarda rəngli, nəfis tərtib edilmiş koordinat müstəvilərində verilmiş nöqtələrin koordinatlarını təyin etmək təklif olunur. Çox cəlbedici təəssürat bağışlayan slaydlarla işləməyi bəyənən şagirdlər daha sonra koordinat oxlarının, rüblərin adları ilə (yenə də kompyuterdə slaydların üzərində) və ordinat və absis oxu üzərindəki nöqtələrin koordinatları ilə tanış olurlar. Onlar köməkləşərək slaydlarda təqdim edilən koordinat müstəvisində və yaxud koordinat oxlarının üzərində yerləşmiş nöqtələrin koordinatlarını müəyyənləşdirməyi, sonra müxtəlif rənglərdə təsvir edilmiş koordinatlara görə onların hansı rübdə yerləşdiyini müəyyənləşdirməyi öyrənirlər. Sonucda dərsin produktiv tətbiqetmə mərhələsində koordinatlarına görə fiqurların qurulması, "böyük" və "kiçik" ulduz bürcləri ilə tanış olmaq kimi maraqlı işlərlə məşğul olaraq növbəti tapşırığa keçid başlanır: Uşaqlara nöqtələrin koordinatlarını düz təyin etməklə nəzərdə tutulmuş aforizminin açılışını tapırlar və bunlar şagirdlərin məqsədlər əsasında formalaşmış meyarların səviyyələrinə görə formativ qiymətləndirilməsilə nəticələnir. Artıq sual hamı tərəfindən qəbul olunur ki, yeni təlim strategiyalarında təlim formaları fərdi, cütlə, qruplarla və kollektiv iş olaraq tətbiq edilir. Unutmaq olmaz ki, hər bir təlim formasından istifadə etmək zərurəti vardır. Lakin elə mövzular var ki, onun sərbəst şəkildə mənimsənilməsi üçün hökmən şagirdlər qruplara bölünməlidirlər.

Eyni zamanda qrup işi zamanı biliklərin tətbiqi, təqdimatların səviyyələri, müzakirədə iştirakları və dinləmə qabiliyyətləri də ballarla qiymələndirilir.

Beləliklə, koordinat müstəvisi mövzusunun öyrənilməsində kompyuterin rolunun nə qədər rəngarəng olması ilə tanış olmaq imkanı yaranır.

Çünki məktəbdə tədrisin əsas məqsədi şagirdlərə hazır bilik və ehkamlar vermək, təhlil etmək müstəqil nəticələr çıxarmaq bacarığını inkişaf etdirməkdir. Burada yalnız mənimsənilmiş biliklərin aşkarlanması deyil şagirdlərin sərbəst işləmək bacarığı və

vərdişləri əsas qiymətləndirmə meyarı kimi götürülür. Əlbəttə, bütün bunların tətbiqində qiymətləndirmə diqqət mərkəzində saxlanmalıdır. Çünki öz növbəsində qiymətləndirmədə fənlərarası əlaqələr çərçivəsində tərtib edilmiş sualların iştirakı da vacib məsələlərdəndir. İmkan daxilində riyaziyyat dərslərində kompyuterin istifadəsindən daha çox yararlanılmalıdır. Tədricən vəziyyətə uyğun olaraq bu məsələlərə adaptasiya olunmağa fikir verilməlidir.

Beləliklə, kurikulumda kompleks biliklərin və effektiv öyrənmə naminə praktik tədris materiallarına istinad bacarıqlarının, yəni kompetensiyaların formalaşması nəzərdən qaçırılmamalıdır.

Unutmaq lazım deyil ki, tədris prosesində fəaliyyətin mərkəzində riyazi terminlər və anlayışların mənimsədilməsi deyil, canlı şagird dayanır. Artıq diqqət "nəyi öyrətməyə", "hansı məqsədlə və hansı nəticələrlə" öyrətməyə yönəlir. Qiymətləndirmə isə keyfiyyət nöqteyi-nəzərindən aparılır. Nəzərəçarpan nəticə isə qazanılmış biliklərin yeni aspektləri–onların həcmi, dərinliyi, funksionallığı, möhkəmliyi, dayanıqlığı, mobilliyi və tədricən yüksəlişi baxımından qiymətləndirilir.

Göründüyü kimi, riyaziyyatın tədrisində qarşıya yeni problemlər, yeni vəzifələr çıxır. Bunların hamısı dərindən təhlil və tədqiq olunan məsələlərdir. Ona görə də, yuxarıda qoyulanları ümumiləşdirərək, belə qənaətə gəlirik ki, yeni məzmun ənənəvi metodlarla mənimsədilə bilməz, ona yaradıcılıqla, həm də yeni qaydada yanaşmaq lazım gəlir, daha konkret desək, yeni məzmun yeni yanaşma tələb edir.

*Rəyçi: prof. İ.İsmayılov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan Respublikasında ümumi təhsil konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.
2. Ümumtəhsil fənn standartları (I-XI siniflər). Bakı, 2012.
3. Ağayev Ə. Azərbaycanın elmi-pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi. Bakı, 2005.
4. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya (dərslik). Bakı, 2010.
5. Mehrabov A. Müasir dərs: onun təşkilinə və gedişinə qoyulan tələblər. Kurikulum. 2013, № 3.
6. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Bakı, 2011.


**Э.Мамедова**

**Новое содержание требует новый подход**

**Резюме**

В статье говорится о последних новостях в области преподавания математики в Азербайджане, об анализе содержания математического предметного курикулума, одновременно говорится обоптимальных путях усвоения учащимися.

**E.Mammadova**

**New content demands new approach**

**Summary**

In the article it is spoken about the latest innovations on teaching mathematics, and the analysis of mathematics subject curriculum. At the same time, the optimal ways of comprehension of these are talked about by students.

***Firidun bəy Köçərli – 150***

# Məşhur maarifçi, böyük ziyalı və “ürəyi atəşli” müəllim

**Hüseyn Əhmədov**
***pedaqoji elmlər doktoru, professor***

**“F.Köçərli böyük müəllimlər nəslini tərbiyələndirib yetişdirən “ürəyi atəşli” bir müəllim... ədəbiyyat tənqidçisi,... görkəmli bir mühərrir... yorulmaz bir ədəbiyyat tarixçisi idi”**
**Abbas Zamanov**

***Açar sözlər:*** *Azərbaycan ədəbiyyatı, ədəbi tənqid, tərcümə, pedaqoji fikir.*
***Ключевые слова:*** *азербайджанская литература, литературная критика, перевод, педагогигеская мысль.*
***Key words:*** *Azerbaijan literature, literary criticism, translation, pedagogical thought.*

2013-cü ildə Azərbaycanın görkəmli ədəbiyyatşünas alimi, tanınmış maarifpərvər, ictimai xadim, publisist-yazıçı, tənqidçi və tərcüməçi Firidun bəy Əhməd ağa oğlu Köçərlinin anadan olmasının 150 illiyi tamam olur.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 14 fevral 2013-cü ildə imzaladığı “Firidun bəy Köçərlinin 150 illik yubileyi haqqında” sərəncamda deyilir: “Firidun bəy Köçərli Azərbaycan ədəbiyyatının tarixi inkişaf yoluna dair qiymətli mənbə təşkil edən əsərlər yaratmış və çoxcəhətli zəngin fəaliyyəti ilə ictimai-mədəni fikrin təşəkkülünə mühüm töhfələr vermişdir. Ölkəmizdə təhsil sisteminin milli əsaslar üzərində qurulması prosesində onun maarifçi ziyalı kimi apardığı işlər böyük əhəmiyyətə malikdir”.

F.Köçərli 1863-cü il yanvarın 26-da Azərbaycanın füsunkar diyarlarından bir olan, bu gün nankor qonşularımızdan olan erməni millətçilərinin işğalı altında qalan Şuşa şəhərində anadan olmuşdur. F.Köçərlinin həyatı və elmi-pedaqoji fəaliyyətinin əsas dövrü, həm də ən məhsuldar illəri, demək olar ki, 1876-cı ildə Gürcüstanın Qori şəhərində əsası qoyulmuş, tarixə Qori Müəllimlər Seminariyası kimi daxil olmuş, Zaqafqaziya Müəllimlər Seminariyası ilə (ZMS) bağlı olmuşdur.

Firidun bəy Köçərli zəngin elmi-pedaqoji və ədəbi-tənqidi yaradıcılığı ilə XIX əsrin sonları və XX əsrin əvvəllərində Azərbaycan mədəniyyətinin, o cümlədən ədəbiyyatımızın, xüsusilə də pedaqoji fikrimizin inkişafında mühüm xidmətləri olan görkəmli şəxsiyyətlərdən biridir.

F.Köçərli mədəniyyət tariximizə Azərbaycan ədəbiyyatı tarixinə dair ilk əsərlərin müəllifi kimi daxil olmuşdur. Onun 1903-cü ildə rus dilində nəşr etdirdiyi

"Azərbaycan tatarlarının ədəbiyyatı", həmçinin 1908-ci ildə yazdığı, lakin yalnız 1925-1926-cı illərdə çap edilmiş 2 cild 4 hissədən ibarət olan məşhur "Azərbaycan ədəbiyyatı tarixi materialları" adlı dəyərli tədqiqat əsərləri qiymətli mənbə kimi bu gün də öz dəyərini saxlayır.

Tanınmış ədəbiyyatşünas alim Abbas Zamanovun sözləri ilə desək, "böyük müəllimlər nəslini tərbiyələndirib yetişdirən "ürəyi atəşli" bir müəllim, müasiri olan yazıçıların inkişafına ciddi təsir göstərən ədəbiyyat tənqidçisi, zamanın mühüm ictimai-siyasi hadisələrinə səs verən görkəmli bir mühərrir, nəhayət, Azərbaycan xalqının ədəbi irsini coşqun ilhamla tədqiq edən yorulmaz bir ədəbiyyat tarixçisi idi" (1. səh. 125). F.Köçərli eyni zamanda tərcüməçilik fəaliyyəti ilə də məşğul olmuşdur. O, "Təlimati-Sokrat" kitabını (1881), A.S.Puşkin, M.Y.Lermontov, A.B.Koltsov və A.Seretelinin bəzi əsərlərini Azərbaycan dilinə, M.F.Axundzadənin "Aldanmış kəvakib" əsərini isə rus dilinə tərcümə etmişdir.

F.Köçərli ədəbiyyata qüdrətli bir tərbiyə vasitəsi kimi baxırdı. Onun fikrincə, hər bir ədib və şairin başlıca arzusu məhz oxucusunun qəlbinə girməkdən, ona təsir göstərməkdən ibarət olmalıdır. Ancaq yüksək hislər, nəcib duyğular əsasında ürək qanı ilə yazılan əsərlər belə böyük bir təsir gücünə malik ola bilər.

F.Köçərlinin adı Azərbaycan məktəb və pedaqoji fikir tarixinə görkəmli ziyalı, müəllim, metodist, maarifçi-demokrat kimi daxil olmuşdur.

F.Köçərlinin çox mühüm xidmətlərindən biri özünün müasirləri ilə yanaşı, Azərbaycanın XIX əsr görkəmli nümayəndələri barəsində xeyli və əsaslı məlumat verməsidir. O, hələ 1885-1895-ci illərdə İrəvanda müəllimlik edərkən yerli ziyalıları axtarıb tapır və onlarla dostluq əlaqələri yaradırdı. F.Köçərlinin İrəvandakı dostları sırasında Məşədi İsmayıl Hacı Kazımzadə "Bəzmi", Mirzə Kazım Qazi Əsgərzadə, Axund Əhmədov "Müttəle", Axund Mirzə Əli, Mirzə Abbas Məhəmmədov, Hacı Seyid Rza Əmirzadə "Sabir", Mirzə Həsən Rüşdiyyə Təbrizli və başqaları var idi. F.Köçərli irəvanlı ziyalıların ədəbi və maarifçilik fəaliyyətlərinə xüsusi diqqət verir və onları yüksək qiymətləndirirdi.

F.Köçərli İrəvan ziyalılarından söhbət açarkən deyir ki, Şəhri-İrəvan keçmişdə mərkəzi-üləma, füzəla və şüəra olub, Axund Molla Məhəmməd İrəvani kimi böyük alim və müctəhidlər yetiribsə də, axır vaxtlarda belə fazil və alim şəxslərdən və dəqiq ədiblərdən və xoştəb şairlərdən məhrum qalıbdır. Elm və mərifət əshabı varsa da, onların ədədi asvama nisbət çox azdır, yoxluq mənzələsindədir. İrəvan şairlərindən məşhuru Məşhədi İsmayıl Hacı Kazımzadə "Bəzmi" təxəllüsdür" (2, səh. 202).

F.Köçərli Məşədi İsmayıl "Bəzmi" (1846-1888) haqqında yazır ki, "bizim məktəblərdə ata-babadan bəri işlənən köhnə qayda üzrə dərs verməyin qüsurunu anlayıb, üsuli-sövti ilə təlim vermək üçün özü təzə bir əlifba tərtib etmişdi...O, öz işində sabitqədəm və möhkəm dururdu... Şeirlərinin çoxu qəzəl, rübai və müxəmməs formasında olub (2, səh. 203).

F.Köçərli Mirzə Kazım "Müttəle" (1832-1892) haqqında isə aşağıdakı məlumatı verir: "Mirzə Kazım cənabları ilə biz yaxın aşina idik və tez-tez onunla görüşüb, təlim və tədris məsələlərindən bəhs və söhbət edərdik. Mərhumun təlim-tərbiyə məsələlərindən səva fikri-zikri yox idi" (2, səh. 207).

Məşədi Molla İsmayıl Hacı Kazımovun (1845- 1888) 1882-ci il martın 28-də açılan ana dili məktəbinin bütün İrəvan quberniyasında böyük şöhrət qazanmasından xəbər verir.

F.Köçərli Axund Mirzə Əlini oxucu-

larına "artıq qeyrətmənd və çalışqan cavan bir müəllim" kimi təqdim edir (3, səh. 128).

F.Köçərlinin fəaliyyətində XIX əsr Azərbaycan klassik şair və yazıçılarının yaradıcılığına həsr etdiyi məqalələr ayrıca əhəmiyyət kəsb edir və bu gün ən mötəbər mənbə kimi çox qiymətlidir.

F.Köçərli XIX əsrdə Rusiyada və Qərbi Avropada böyük şöhrət qazanan, Azərbaycanda ilk maarifçilik ənənələrinin formalaşmasında xüsusi rolu olan M.Ş.Vazehi (1792-1852) filosof adlandırır və M.F.Axundovu ruhani olmaq fikrindən bilmərrə daşındırmağını xüsusi vurğulayır. O yazırdı: "Bəli, Mizə Şəfi cavan Fətəlinin ağlını, fitri zəkavət və fərasətini müşahidə edib və gözlərindən yağan anlaq və mərifət nurunu dərk edib, gələcəkdə ondan böyük xidmətlər vüqua gəlməsini Mirzəyə bəşarət verir və onunla bir neçə müddət görüşüb danışandan sonra filosof Mirzə Şəfi cavan Fətəlinin fikir və xəyalatını başqa bir sənətə çevirir" (4, səh. 427).

F.Köçərlinin böyük hörmətlə yad etdiyi müasirləri arasında M.F.Axundov ayrıca yer tutur. Onun 1911-ci ildə Tiflisdə "Kultura" mətbəəsində kitabça şəklində çap etdirdiyi "Mirzə Fətəli Axundov həzrətlərinin təvəllüdündən yüz il mirur etmək münasibəti ilə yazılmış risaləyi yadigarənidir" adlanan bu kitabça xüsusi əhəmiyyət kəsb edir.

F.Köçərlinin tanınmış tədqiqatçılarının, o cümlədən "Seçilmiş əsərləri"nin tərtibçilərindən olan K.Talıbzadə ilə N.Məmmədovun fikrincə bu kitab "inqilaba qədər M.F.Axundov haqqında yazılmış ilk qiymətli tədqiqat əsəridir" (5, səh. 318). 1911-ci ilin dekabrında Tiflisdə M.F.Axundovun anadan olmasının yüzillik yubileyinə həsr edilmiş təntənəli yığıncaqda Köçərli bu kitabın əsasında məruzə etmişdir. (o vaxtlarki bəzi mənbələrdə M.F.Axundovun anadan olması 1911-ci il kimi göstərilirdi. Bu səbəbdən də onun 100 illik yubileyi 1912-ci ildə deyil, 1911-ci ildə qeyd edilmişdir. Lakin M.F.Axundov özü tərəfindən yazılmış və "Kəşkül" qəzetinin 1887-ci ildəki 43, 44 və 45-ci saylarında dərc edilmiş "tərcümeyi-hal"da təvəllüd ili 1812-ci il qeyd olunmuşdur).

F.Köçərli M.F.Axundovun yaradıcılığına böyük qiymət vermişdir. O, M.F.Axundova bizim böyük və möhtərəm ədibimiz, milli ədiblərimizin atası, dram əsərləri yazanlarımızın kamil ustadı, ədəbiyyatımızın fəxri, əvvəlinci dram yazanlarımız və müqtədir mütəfəkkirimiz hesab edirdi. O yazırdı: "Mirzə Fətəlinin təbində elə bir zəriflik, yaratmaqlıq qüdrəti, yoxdan vicuda gətirməklik qüvvəsi var imiş ki, bunun misli az mühərrirlərdə müşahidə olunur. Bu bir Allah vergisidir ki, hər qələm əhlinə nəsib olmaz, ədiblik iddiasına düşən məsud qılmaz" (5, səh. 243).

F.Köçərli həmin əsərində M.F.Axundovun həyat yoluna işıq saçır, onun yaradıcılıq yolunu ardıcıllıqla şərh edir, oxucuya çatdırır və yüksək qiymətləndirir.

F.Köçərli həmin əsərinin sonunda bu vaxta qədər onun qədrinin bilinmədiyindən xəcalət hissi keçirməyi də unutmur. Əsər bu sözlər ilə bitir: "bu anacan biz qəflətdə olduq, sənin qədrini bilmədik, kərəm et, bizi əfv qıl. Bundan sonra bacardığımız xidməti haqqında müzayiqə etmərik, ....... əsərlərini çap etdirib əbnayi-vətən arasında yayarıq ki, onları mütaliə edib, amal və əfkarını bilsinlər, nicat və səadət yoluna düzəlsinlər......." (5, səh. 275).

Böyük maarifçi və ziyalı F.Köçərlinin arzuları zəmanəmizdə artıqlaması ilə həyata keçirildi. Qədirbilən xalqımız böyük ədib və maarifçi M.F.Axundovun xidmətlərini yüksək qiymətləndirmişdir. Bu gün Azərbaycanın kənd və şəhərlərində bir çox mədəni-maarif müəssisələri onun adını daşıyır. Respublikanın Mərkəzi Dövlət kitabxanası-

na onun adı verilmiş, Paytaxt Bakıda heykəli ucaldılmış, vətəni Şəki şəhərində mənzil muzeyi fəaliyyət göstərir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 12 yanvar 2004-cü il tarixli sərəncamı ilə M.F.Axundovun əsərləri latın qrafikası ilə kütləvi şəkildə üç cilddə yenidən nəşr olunaraq ölkə kitabxanalarına hədiyyə edilmişdir.

F.Köçərlinin ədəbi və pedaqoji irsində diqqətəlayiq cəhətlərdən biri də "Müsəlmanlar arasında məşhur ictimai xadimlərdən biri" adlandırdığı Həsənbəy Zərdabi haqqında söylədiyi dərin məzmunlu fikirləri idi. Tiflisdə rus dilində nəşr edilən "Zaqafqazye" qəzetinin 6 dekabr 1907-ci il tarixli 256-cı sayında "Müsəlmanlar arasında" ümumi başlığı altında çap etdirdiyi məqaləsində yazırdı: "Böyük həyati təcrübəyə və fitri zəkaya malik olan Həsənbəy hər şeydən daha çox bizim məktəblərin təbii ehtiyaclarına və tələblərinə diqqət yetirirdi; o, boş və gurultulu ibarələri sevmirdi və həyatla az tanış olan bəzi gənc pedaqoqların söylədiyi nitqlər, görünür, onu dilxor edib əhvalını pozurdu, bütün bunlarla birlikdə, onda böyük səbr var idi və başqalarının mülahizəsinə lazımi bir hörmətlə yanaşırdı" (5, səh. 151).

F.Köçərli Həsənbəyin xidmətlərini yüksək qiymətləndirir, onun öz həmməzhəblərinin oyanmasına ilk təkan verən hesab edir, Həsənbəyin "Əkinçi" qəzetinin məqsədini müsəlmanların mədəniyyətsiz kütlələri arasında faydalı kənd təsərrüfatı biliklərini yaymaqda, bilik və elm ziyasını müsəlmanların cahil kütlələri arasında təbliğ etməkdə, elmi-əbdanla peyğəmbərimizin dünyəvi elmlərin həyat üçün əhəmiyyəti və zəruriyyəti haqqındakı sözlərinin əhəmiyyət və mənasını bərpa etmək məqsədini qeyd edirdi. F.Köçərli deyirdi ki, bu qəzet öz qüvvəsi daxilində cəhalət zülmətindən Allahın işıqlı dünyasına çıxmaqda öz həmməzhəblərinə kömək etməyə borcludur.

F.Köçərlinin Həsənbəylə ilk tanışlığı Qafqaz müsəlman müəllimlərinin 15 avqust 1906-cı ildə Bakıda keçirilmiş birinci qurultayında baş vermişdir. Həsənbəy həmin qurultaya sədr seçilmişdir. F.Köçərli yazır ki, onun yaşının çox olmasına baxmayaraq pedaqoji xarakter daşıyan hər hansı bir məsələnin həllində o, canlı zəkaya, xeyli təcrübə və biliyə malik olduğunu büruzə verirdi.

F.Köçərlinin haqqında ürək yanğısı ilə bəhs etdiyi şəxsiyyətlərdən biri də Azərbaycan ədəbi və pedaqoji fikrin görkəmli simalarından olan Seyid Əzim Şirvanidir. F.Köçərlinin fikrincə Hacı Seyid Əzim Şirvani nəinki yalnız Şirvan vilayətinin, bəlkə tamam Azərbaycan türklərinin böyük və əzəmətli şüarasından biri olub. Onun şan-şöhrəti və yüksək rütbəsi hal-hazırda vətən oğlanlarının arasında (2, səh. 29) kamalınca məşhur olmayıbsa da gələcəkdə olmasına şübhə yoxdur.

F.Köçərlinin S.Ə.Şirvani ilə bağlı belə narahatlığına səbəb onun əsərlərinin vaxtında çap edilməməsi, çap edilənlərin isə səliqəsiz, "həddən ziyadə səhv və qələtlər" olması idi. Bu hala acıyan F.Köçərli vurğulayırdı "Əgər Hacı Seyid Əzim kimi şair, Avropa əhlini hələ kənarda qoyaq, bizim qonşularımız erməni və gürcü tayfalarının içində vücuda gəlmiş olsaydı, onların əsərləri dəfələrlə çapdan çıxıb, oxucular arasında bir dərəcədə intişar tapardı ki, uşaqdan böyüyə kimi hamısı onları oxuyub əksəriyyətini əzbərdən bilərdilər". Bununla belə F.Köçərli gələcəkdə bizim ədiblərimizin də qədri-qiyməti bilinəcək, qəflət yuxusundan ayılmış millətimizin zirək və qədrşünas balaları onların məşhur adlarını şöhrətlərini uca məqama qaldıracaqlar.

F.Köçərli S.Əzimi farsların Sədisi və Hafizi ilə müqayisə edir, onu rusların Puşkininə, ingilislərin Bayronuna və polyakların Miskevicinə bərabər tutur, pedaqoji və ədəbi fəaliyyətinin uğurlarından ətraflı bəhs

edir.

Nəhayət, şairlərimizin məşhurlarından biri olan M.Ə.Sabir haqqında da F.Köçərlinin fikirləri maraqlıdır. O, Sabiri əsrimizin ən müqtədir, ən qüdrətli, güclü, qüvvətli, bacarıqlı və yaxşı təbi olan, istedadlı şairlərindən biri kimi qiymətləndirmişdir. F.Köçərli "Molla Nəsrəddin" jurnalında (22 may 1911-ci il, № 19) çap etdirdiyi "Sabir haqqında" adlı məqaləsində oxuyuruq: onun "Molla Nəsrəddin" səhifələrində dərc olunmuş şeirləri oxucuları bir yandan güldürür, bir yandan da ağladırdı. "Onun yazdığı şeirlərin çoxu açıq və sadə ana dilində olub, məişətimizin eynini göstərdiyinə görə əzbər öyrənilirdi" (5, səh. 276). F.Köçərli Sabiri S.Əzimin dəstpərvərdəsi, yəni yetişdirməsi hesab edirdi.

F.Köçərlinin çox mühüm xidmətlərindən biri də Azərbaycanın görkəmli şair və yazıçıları ilə bərabər məşhur müəllim və məktəbdarlar haqqında da müfəssəl məlumat verməsidir.

F.Köçərlinin 1887-ci ildə Bakı şəhərində əsası dövrün məşhur pedaqoqlarından olan S.M.Qənizadə ilə H.Mahmudbəyov tərəfindən qoyulmuş və tariximizə "Rus-azərbaycan məktəbi" adı ilə daxil olan məşhur təhsil ocağının 25 illiyi ilə əlaqədar yazdığı məqalə bu cəhətdən çox xarakterikdir. F.Köçərli S.M.Qənizadənin dörddə bir əsr xalq maarifi yolunda ləyaqətlə çalışdığını yüksək qiymətləndirir, böyük hünər hesab edirdi. O yazırdı ki, 25 il xalq maarifi yolunda çalışmaq böyük hünərdir. "Bizim maarif qədri bilməyən avam camaat arasında bu əmri əmələ gətirmək daha böyük hünərdir" (5, səh. 288).

F.Köçərli müəllimliyi özünə peşə seçib ömrünün sonunadək bu peşəyə sadiq qalanları yüksək qiymətləndirir, bu sənətin ağırlığına dözməyib, başqa yüngül işlə, yaxud avam camaatın nəzərində daha hörmətli sayılan vəzifələrə, o cümlədən polisdə xidmətə gedənləri tənqid atəşinə tuturdu.

F.Köçərlinin 1912-ci ildə qələmə aldığı "Soltan Məcid Qənizadə" adlı məşhur məqaləsində deyilir: "Çox müəllimlərimizin müəllimlik sənətindən qaçmasına, bir tərəfdən, bu sənətin ağırlığı və qiymətsizliyi, o biri tərəfdən də camaatımızın bu müqəddəs sənətə alçaq bir nəzərlə baxması səbəb olur".

F.Köçərli S.M.Qənizadənin müəllimlik peşəsinə daim sadiq qalmasını və bu sahədə böyük hünər göstərməsini xüsusi vurğulayırdı. O, ürək ağrısı ilə olsa da böyük iftixarla deyirdi ki, müəllimliyin ağır işlərini, müqəddəs vəzifə və təkliflərini əmələ gətirməkdə sabitqədəm durub, hünər göstərən müəllimlərimizdən biri də möhtərəm bəradərimiz Soltan Məcid Qənizadə cənablarıdır ki, iyirmi beş il sərasər maarif yolunda dili, fikri və qələmi ilə səy etməkdədir.

F.Köçərli S.M.Qənizadənin həyatı və fəaliyyətindən böyük iftixarla bəhs edir, onun yazdığı bədii əsərləri yüksək qiymətləndirir, tədris vəsaitləri hazırlamasını xüsusi qeyd edirdi. Həmin məqalədə deyilir: Təlim və tədrisə lazım olan kitablarla bərabər türk dilində bir çox hekayə və romanlar yazmışdır ki, bunların hər birinin başqa vəsf və tərifə ehtiyacı vardır. Uşaqlar üçün nəzm ilə yazdığı "Tülkü və çaqçaq bəy" nağılı Qənizadənin təbi-səlim sahibi olduğuna şəhadət verir. "Məktubati-Şeydabəy" sərlövhəsi ilə yazdığı "Müəllimlər iftixarı" və "Gəlinlər həmayili" adlı kitabçalar Qənizadənin iqtidarlı bir ədib olduğunu bildirir. Bu əsərlərin hər birində təzə fikirlər, vüsətli xəyallar, dərin mənalar, nazik işarələr, gözəl əqidələr var ki, hər kəsə onları oxumağı tövsiyə edirik (5, səh. 291).

F.Köçərli millətin naxoşluğunu müalicə edənlərə, xalqı cəhalət qaranlığından işıqlığa çıxaranlara-müəllimlərə ümid edirdi. O yazırdı ki, "müəllimlərin səyi və qeyrəti sayəsində çox qövm və təyfalar xoşbəxt olub ağ günə çıxıblar, şan və hörmət qa-

zanıblar, dövlət və qüvvət kəsb ediblər".

O haqlı olaraq qeyd edirdi ki, müəllim məktəbin canı və içində olduğu camaatın çırağı məqamındadır. Müəllim öz peşəsini sevsə, öz şagirdlərini övladı kimi istəsə, onların təlim və tərbiyəsinə can yandırsa, əhalinin gözünü açmağa və xeyirverici biliklər ilə onları həyata hazırlasa böyük kəramətlər göstərər, xalqın rəğbət və hörmətini qazanar. Köçərli bələlərinə misal olaraq İsa bəy Abakarov ilə Əhməd ağa Mustafayevi göstərirdi.

İsabəy Abakarov Azərbaycanın dilbər guşələrindən olan Zaqatalada anadan olub. O, 1884-cü ildə Qori Müəllimlər Seminariyasını bitirib, onun həyatı və müəllimlik fəaliyyəti əsasən Qazax qəzasının Birinci Şıxlı kənd məktəbi ilə bağlı olub. Sənədlərdən birində deyilir: "Burada məktəb açılana qədər əhali oğurluq və adam öldürmək kimi kütləvi cinayət törədirdi. Məktəb açılandan sonra bunlar azalıb, məişətdə də yaxşılığa doğru çox dəyişiklik olub. Əhali öz uşağını böyük həvəslə məktəbə qoyur, hətta qızlar üçün xüsusi şöbə açmağı xahiş edirlər" (6, səh. 245- 246).

Məhz bütün bunların nəticəsidir ki, F.Köçərli Azərbaycan xalqının həyat tərzinə, adət-ənənələrinə, təlim-tərbiyə, elm və maarif məsələlərinə həsr etdiyi və "Tərəqqi" qəzetinin 1908-ci ilin dekabr və 1909-cu ilin fevral aylarındakı saylarında nəşr etdirdiyi "Məişətimizə dair" adlı silsilə məqalələrindən birində, "müəllimlərimiz və onların halı" başlıqlı üçüncü məqaləsində yazırdı: müəllimin məktəbin canı olduğunu və məhəbbət ilə çox işlər açdığını əcnəbi qövm və tayfaların içində görürük. Bizim müsəlmanlar dəxi belə həqiqi millət xadimlərindən məhrum deyillər. Kənd müəllimlərinin içində İsabəy Abakarov, Əhməd ağa Mustafayev kimi bir neçə möhtərəm şəxslər var ki, həqiqətdə millət xadimi olub, cani-dildən təlim və tərbiyə işlərinə ömürlərini sərf ediblər (5, səh.200).

F.Köçərli deyirdi ki, İsabəyin haqqı bizim üstümüzdə çoxdur. İsabəy bizim Pestalotsimiz məqamındadır. Və lakin belələri çox azdır, beş-on nəfər ancaq tapılar. Yerdə qalanları öz şüğllərinə soyuyubdur, ürəklərində olan atəş sönübdür və hər şeyə həyat verən məhəbbət çeşməsi quruyubdur. Bunlardan hər birisi iyirmi ildən ziyadədir ki, müəllimlik etməkdədir. Bunlar qulluq sarıdan artıq bir tərəqqi etməyiblərsə də və tərəqqi etmək qeydinə dəxi düşməyiblərsə də, camaatın məhəbbətinə şayəstə (layiq-M.Ş.) olublar. Hansı kənddə müəllimlik ediblərsə, orada mərifət çırağını yandırıb, əhalinin gözlərini açıb, mənəvi tərəqqilərinə bais olublar. İsabəyin təhti-tərbiyəsindən yüzlərcə rəiyyət balaları çıxıb, kamali-təhsil edib, çörək sahibi olublar. İsabəy çox fəqir şəxslərin övladına atalıq edib, azacıq məvacibindən onlara xörək və puşak verib oxudubdur. İmtahan mövsümündə onları öz xərci ilə Tiflisə, Gəncəyə, Qoriyə göndərib və çox vaxtı özü aparıb bəzisini sənət məktəbinə, kimisini feldşer şkolasına, kimisini seminariyaya və hətta bir neçəsini gimnaziyaya qoyubdur.

Müəllimlik sənətinin qədrinin böyük bilicisi olan və onu yüksək qiymətləndirən unudulmaz maarifçi, ustad pedaqoq olan F.Köçərlinin böyük fəxrlə adını çəkdiyi Əhməd ağa Mustafayev 1864-cü ildə Qazax qəzasının Salahlı kəndində anadan olub. 1885-ci ildə Qori Müəllimlər Seminariyasını bitirib. 50 ildən artıq kənd məktəblərində müəllimlik etmiş, Təkcə Salahlı kəndindən Qori seminariyasına 30-dan artıq tələbə hazırlamışdır. Onun yetirmələri 1910-cu ildə Dilicanda öz müəllimlərinin 25 illik yubileyini qeyd ediblər.

1920-ci ildə F.Köçərli Qazaxa köçürdüyü Müəllimlər Seminariyasının müdiri vəsifəsindən getdikdən sonra Ə.Mustafayev bu seminariyanın müdiri təyin olunub (7,

səh. 27).

F.Köçərli Azərbaycan xalqının tərəqqisinə böyük inam bəsləyirdi. O, məşhur gürcü şairi Akaki Seretelinin "müsəlman qardaşlarıma" sərlövhəli şeirində müsəlmanların qəflətdən ayılmağını müşahidə edərək dediyi "Çox çəkməz ki, Sizi zəif, bacarıqsız və elmsiz bilənlərdən siz qüvvətli, bacarıqlı və elmli olacaqsınız" fikrinə inanırdı. Həyat A.Sereteli və F.Köçərlinin arzu və fikirlərinin doğruluğunu təsdiq etdi.

F.Köçərli pedaqoji fəaliyyəti ilə bərabər ədəbi və publisistik məqalələri ilə dövrünün bir çox vacib elmi-pedaqoji, ədəbi və metodiki problemlərinə aid bu gün də əhəmiyyətini itirməyən fikirlər söyləmişdir.

Nəticə etibarı ilə qeyd edək ki, bir maarifçi-demokrat kimi F.Köçərlinin məqsədi xalqı maarifləndirməkdən, mədəniləşdirməkdən ibarət idi. Özünün məşhur müasirləri kimi o da ictimai bəlaların kökünü cəhalətdə, nadanlıqda, elmsizlikdə görür, maarifə, elmə, xalqı azadlığa çıxaran bir vasitə kimi baxırdı. O, xalqı qəflət yuxusundan ayıltmağa cəhd edir, S.Ə.Şirvaninin "Nadanlıq dərdinin dərmanı elmdir", "hər kimin elmi var, o insandır" müddəasını təbliğ edirdi.

### İstifadə edilmiş ədəbiyyat


1. Abbas Zamanov. "Firidun bəy Köçərli" monoqrafiyası haqqında. / (tənqid və biblioqrafiya) //Azərbaycan SSR EA xəbərləri. İctimai elmlər seriyası, 1964, № 1.
2. Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. İkinci cild, Bakı: Elm, 1981.
3. Azərbaycan pedaqoji antologiyası. Üç cilddə, II cild. Bakı, 2011. Tərtib edən və çapa hazırlayan Hüseyn Əhmədov.
4. Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. Birinci cild, Bakı: Elm, 1978.
5. Firidun bəy Köçərli. Seçilmiş əsərləri, Azərbaycan SSR EA nəşriyyatı. Bakı, 1963. Tərtib və qeydlər Kamal Talıbzadə və Nadir Məmmədovundur.
6. Hüseyn Əhmədov. XIX əsr Azərbaycan məktəbi (III nəşr), Bakı, 2006.
7. Zaqafqaziya (Qori) müəllimlər Seminariyası Azərbaycan şöbəsi-130. Fotoalbom, tərtibçilər: H.Əhmədov, İ.İsayev, M.İlyasov, A.Rüstəmov. Redaktoru H.Bayramoğlu. Bakı, 2009.


**Г.Ахмедов**

### Известный просветитель большой интеллигент и учитель с "огненной думой"


**Резюме**

В статье говорится об оказанных услугах ученым, выдающимся литератором, критиком, переводчиком Ф.Кочарли. Отмечается что, он один из выдающихся личностей, имеющий важные услуги в развитии педагогической мысли, литературы нашей, азербайджанской культуры конца XIX и начала XX века со своей богатой литературно - критической и начуно-педагогической делтельностью.


**H.Ahmadov**

### Welknown enligtner and great pedagogue


**Summary**

In the article it is spoken about the outstanding literary scientist, well-known enlightener, critic and translator, F. Kocharly's contribution to the history of Azerbaijan Literature. It is noted that with his rich scientific-pedagogical and literary-critical literary activity, F. Kocharly is one of the great personalities who contributed to Azerbaijan culture, Azerbaijan literature and especially contributed to the pedagogical thoughts of Azerbaijan at the end of XIX and beginning of XX century.